## HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR

## HUMANITIES AND SOCIAL SCIENCES

DOI: https://doi.org/10.36719/2663-4619/101/8-14

**Rafail Əhmədli**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
fəlsəfə elmləri doktoru
ehmedli.rafail@mail.ru
**Lalə Əhmədova**
Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyası
filologiya üzrə fəlsəfə doktoru
lala.ahmadova@sport.edu.az

# MİRZƏ KAZIMBƏYİN İSLAM DİNİNƏ DAİR ELMİ TƏDQİQATLARI

**Xülasə**

Elmi məqalədə Şərq fəlsəfi və siyasi ədəbiyyatını dərindən bilən, gənclik dövrlərindən “Quran”ı, dini kitabları öyrənən, islam ehkamlarını daxili bir inamla sevən, Şotland missionerləri ilə mübahisələr edən Mirzə Kazımbəyin Həştərxana getməsi və xristianlığı qəbul etməsi araşdırılır. Eyni zamanda həqiqət axtaran bir alim kimi M.Kazımbəyin “Quran”ı tərcümə etməsinə, çətin anlaşılan yerlərini şərh etməsinə, düzgün tələffüz edilməsinə, qramatik qaydaların izah edilməsinə dair fikirnə diqqət yetirilir

Məqalədə həmçinin M.Kazımbəyin elmi tədqiqat əsərləri olan “Quranın”ın bəzəi ayələrinin şərhi”, “Müxtəsər-ül-vakiyət”, şərqşünas F.F.Tornau ilə birlikdə yazdığı “Zaqafqaziya müsəlmanlarının məhkəmə işlərinin təşkili haqqında” və s. əsərləri təhlil olunur. Alimin “fiqh elmi”nin tarixinə, şəri qanunlar və onlara əlavələr edilməsinə dair fikirləri, hüquq məktəbləri və onların yayılma arealları haqqında məlumatları nəzərdən keçirilir.

***Açar sözlər:*** *İslam dini, «Quran», fiqh elmi, Dərbənd, Həştərxan, Şəriət*

**Rafail Ahmadli**
Azerbaijan State Pedagogical University
Doctor of Philosophy
ehmedli.rafail@mail.ru
**Lala Ahmadova**
Azerbaijan State Physical Culture and Sports Academy
PhD in Philology
lala.ahmadova@sport.edu.az

# Mirza Kazimbey's scientific studies on the Islamic religion

**Abstract**

Mirza Kazimbey, who had a deep knowledge of Eastern philosophical and political literature, read the "Quran" and religious books since his youth, sincerely loved the teachings of Islam, debated with Scottish missionaries, and also how became a Christian by going to Astrakhan, is analyzed in the article.

At the same time, attention is also drawn to M.Kazımbey's views on translating the "Quran", interpreting the difficult to understand parts, and explaining correct pronunciation and grammatical rules, as a scientist seeking the truth.

The article also includes M.Kazımbey's scientific research works "Interpretation of ornamental verses in the Holy Quran", "Muhtasar-ül-Vakiyat", "On the organization of court cases of

Transcaucasian Muslims" written together with the orientalist F.F.Tornau, etc. his works are analyzed. The scientist's knowledge about the history of "fiqh", sharia laws and their extensions, legal sects, and distribution areas were reviewed.

***Keywords:*** *Islam, Quran, fiqh, Astrakhan, Sharia*

## Giriş

Hərtərəfli biliyə malik, Şərq fəlsəfi və siyasi ədəbiyyatını dərindən bilən, İslam dininin, Şərq elminin, ədəbiyyatının dəyərli nümunələrinə mükəmməl yiyələnən, «Quran»ı, dini kitabları, Məhəmməd Peyğəmbərin (s) həyatını, onun hədislərini dərindən öyrənən Mirzə Kazımbəy ilk illərdə İslam ehkamları haqqında məhəbbətlə, vəcdlə, daxili bir inam hissi ilə danışır, Şərqə yaxşı bələd olan Şotland missionerləri Qleb və Makfersonla tez-tez mübahisə edir, sonralar özünün də etiraf etdiyi kimi, özünü «əsil fanatik» kimi aparırdı.

Əsasən dini mahiyyətli kitablar oxuyan yeniyetmə Mirzə Məhəmməd Əli Şotlandiyalı missionerlərlə mübahisələrdən çox şey öyrənsə də onların qeyri-adi inandırmaları ona əsaslı təsir göstərə bilməmişdi. Mühitinə çox bağlılıgı, missionerlərin Avropa ölkələrindəki inkişaf, mədəniyyət və tərəqqi haqqındakı danışıqları Mirzə Kazımbəyi ya inandırmır, ya da cəlb etmir, atası kimi öz gələcək taleyini Dərbənddən kənarda təsəvvür etmirdi. Sanki öz taleyini həll etmişdi. Əsas məqsədi tezliklə təhsilini tamamlamaq və müctəhid adı almaq üçün İranın və Ərəbistanın dini mərkəzlərinə yola düşmək idi. Lakin tale qeyd olunduğu kimi, öz məchul oyununu oynadı. Atasının Həştərxana sürgün edilməsi ilə əlaqədar olaraq Mirzə Kazımbəy valideyninin evində Asiya kursu üzrə təhsilini başa vurduqdan sonra doğma Dərbənddən, qohumlardan, dostlardan ayrılaraq qoca atasının yanına öz övladlıq borcunu yerinə yetirməyə getdi.

Mirzə Kazımbəyin hələ xristianlığı qəbul etməmişdən əvvəl İslam dininin müdafiəçisi kimi Dərbənddə başlayıb Həştərxanda tamamladığı və İslam dininin başqa dinlərdən üstünlüyünü sübuta yeritmək üçün ərəb dilində yazdığı **«İslamın həqiqiliyi və xristianlıqla iudizmin yanlışlığı haqqında»** adlı teoloji traktatında o, Rusiya hökumətinin icazəsi və çarın xüsusi tapşırığı ilə müsəlmanlar yaşayan ərazilərdə onları xristianlaşdırmaq məqsədilə missionerlik edən Şotland Qlev və Makfersona «İslamın ilahiliyi fikrini təlqin etməyə» və onları «yanlış yoldan» çəkindirməyə çalışmış, lakin sözlərinin təsirsiz olduğunu hiss edib «onların dinlərinə gizli nifrət etməyə başlamış və nəyin bahasına olursa-olsun xristianlığın süqutuna çalışacağına söz vermişdi» (1). Adı çəkilən traktatın sonuncu fəslini Həştərxanda tamamlamışdı.

Aramsiz təhdidlərdən, düşdüyü mühitin təzyiqlərindən qurtulmaq və özünü təsdiq etmək niyyəti ilə 1823-cü ildə xristianlığı qəbul etməsi də Mirzə Kazımbəyin dünyagörüşünə mühüm təsir göstərmiş, o, təbiət və cəmiyyət hadisələrinə münasibətdə əsasən idealizm mövqeyindən çıxış etmişdir.

Bəzi tədqiqatçılar hətta Mirzə Kazımbəyi daha çox xristian dininin "təəssübkeşi" kimi tanıtmış, onu «20 ildən çox dini kitabların tatar dilinə tərcüməsi üzrə Sinad yanında fəaliyyət göstərən komissiyanın üzvü olduğunu» qeyd etmişdilər (2).

Mirzə Kazımbəyin xristianlığı qəbul etməsi ilə bağlı tədqiqatçılar arasında fikir ayrılıqları mövcuddur. Bəzi tədqiqatçıların fikrincə, Mirzə Kazımbəyin «xristian dinini qəbul etməsinin bu gün bizim üçün müəyyən elmi əhəmiyyəti yoxdur» (Rzayev, 1981). Biz bu məsələdə Mirzə Kazımbəy haqqında Azərbaycan türkcəsində ilk sanballı elmi əsər yazan Vilayət Quliyevin fikir və mülahizələri ilə razılaşırıq. V.Quliyev yazır: «Bizə elə gəlir ki, Mirzə Kazımbəyin nə kimi şəraitdə, hansı ciddi ruhi sarsıntılardan sonra xristanlığı qəbul etməsi üzərində dayanmağa dəyər. Çünki təkcə adi oxucular deyil, professional ədəbiyyatçılar arasında da belə bir fikir geniş yayılmışdır ki, Mirzə Kazımbəy xristianlığı az qala Yuli Sezarın məşhur «Gəldim, gördüm, qalib gəldim» prinsipi ilə qəbul etmişdir. Belə olmamışdır... Bir məsələni yadda saxlamaq lazımdır ki, çoxlarının zənn etdikləri kimi, Mirzə Kazımbəy xristianlığı qəbul etməklə ilk növbədə hər hansı yüksək rütbə, yaxud cəmiyyətdə qazanacağı mövqe barəsində düşünmürdü. Əgər belə olsaydı, o provaslavlığı üstün tutardı… Onun öz dinindən üz döndərməsini nə isə qabaqcıl, mütərəqqi bir addım kimi qələmə vermək də, söz yox, məntiqsiz və qeyri elmi səciyyə daşıyır… Mirzə Kazımbəy … xristianlığı

dərin ruhi sarsıntılardan sonra, lakin daxili bir inam əsasında qəbul etmişdi» Quliyev, 1987: 32-34).

Əslində bu sualın ən doğru cavabını Mirzə Kazımbəyin özü vermişdi. Şotlandiyalı missionerlər vasitəsilə ingilis, fransız və alman dillərini mükəmməl öyrənən Mirzə Kazımbəy Əhdi-Ətiqi (Tövratı) və Əhdi-Cədidi (İncili) və digər dini kitabları mütaliə edərək həqiqət axtarışına çıxmış, Avropa dini, fəlsəfi və ədəbi-ictimai fikri ilə tanış olmuş, teoloqların, din xadimlərinin, filosofların, yazıçıların və tədqiqatçıların əsərlərini oxumuş, özünü düşündürən suallara cavab tapmağa başlamışdı. Bu münasibətlə özü haqqındakı bir yazısında göstərmişdi: «Gizli marağım məndə tədricən indiyə qədər bələd olmadığım biliklərə yol açırdı. Bir tərəfdən marağım, digər tərəfdən də təəssüf və peşmançılığım gündən-günə çoxalırdı. Nəhayət, daxili hisslərin mübarizəsi məni yorub əldən salırdı. İnamım sarsılmışdı. Şübhələr mənə rahatlıq vermirdi. Maraq isə dayanmaq bilmədən məni elə hey çəkib uzaqlara aparırdı. Əzablı axtarışlarımın nəticəsi bu oldu ki, ... tamamilə əliboş, ümidsiz qaldım… Mən həmin kitabları (dini kitablar nəzərdə tutulur - R.Ə.) artıq nə müsəlman, nə də xristian kimi deyil, həqiqət axtaran bir adam kimi oxuyurdum» (Russkiy arkhiv, 1893: 223).

Həqiqət axtaran bir alim kimi Mirzə Kazımbəy hələ 1827-1828-ci akademik tədris ili ərzində Kazan Universitetində bir sıra məsələlərlə yanaşı **«Quran»ın** tərcüməsi ilə də məşğul olmuş, «Quran»dakı ayı-ayrı söz köklərini aydınlaşdırmış, ən yaxşı Şərq mütəfəkkirlərinin əsərlərinə əsaslanaraq müsəlmanların bu müqəddəs kitabının çətin anlaşılan yerlərini şərh etmişdir. Həmçinin 1835-ci il «Nizamnamə»sinin tətbiq edilməsi ərəfəsində Kazan Universitetinin professor-müəllim heyətinin tədqiqatlarının mövzu və obyektləri müəyyən edilərkən Mirzə Kazımbəyin də tədqiqat obyekti müəyyənləşdirilmiş və ona Sədinin «Gülüstan» əsərinin bəzi yerlərinin araşdırılması, Sədinin və başqa farsdilli müəlliflərin əsərlərindən seçmələrin fars dilindən rus dilinə tərcüməsi, ərəb yazısının müxtəlif xətt növlərinin öyrədilməsi ilə yanaşı, ərəb dilinin tədrisi vaxtı «Quran»ın oxunması və düzgün tələffüz edilməsi, qrammatik qaydaların izah edilməsi, «Quran»dan və İbn-Xəlliqanın «Vəfiyyət ül-Assin» əsərindən tərcümələr edilməsi tapşırılmışdı (Rüstəmov, 1981: 143-144).

M.Kazımbəyin İslam dininə dair ilk elmi tədqiqat əsərləri 1840-cı illərin əvvəllərinə aiddir. O, XIX əsr Avropa və Rusiya şərqşünasları içərisində İslam ehkamlarına, bu dinin mahiyyət və prinsiplərinə bələd olan birinci alim olsa da, uzun müddət bu mövzuya yaxın durmaq istəməmişdir. Çünki İslam dini haqqında xristianlıq mövqeyindən yanaşanda istər-istəməz İslamın təbiətindəki obyektiv məsələləri pərdələmək, qəsdən tənqid etmək lazım gəlirdi ki, bu da İslam dini haqqında tam təsəvvürə malik olan Mirzə Kazımbəyin ürəyincə deyildi. Ona görə də alim İslam dini ilə bağlı ilk elmi tədqiqatlarında bacardıqca ehtiyatlı olmağa çalışmış və bu əsərlərini Rusiyada deyil, Avropada çap etdirməyə üstünlük vermişdi. O, 1843-cü ildə Kazanda qələmə aldığı **«Quran»ın bəzi ayələrinin şərhi»**, 1844-cü ildə yazdığı Ərəbistanda və Ərəbistandan kənarda Məhəmmədin hakimiyyət başına gəlməsini təmin edən bəzi siyasi səbəblər haqqında məqalələri məhz Parisdə çıxan "Aziatik» jurnalında çap olunmuşdu. Alim bu əsərlərinin xaricdə çap olunmasının səbəblərini akademik Dorna göndərdiyi 9 noyabr 1844-cü il tarixli məktubunda belə açıqlamışdı: «Mənim Məhəmməd və Quran barəsindəki məqalələrim Parisdə çap olunmuşdur. Mən bu əsərləri Xalq Maarif Nazirliyinin curnalı üçün hazırlamışdım. Lakin məqalələrin həmin curnalda çap olunması üçün nazirin müsbət rəyini almaq lazım idi. Ancaq mən qorxdum ki, Məhəmmədin bəzi qanunlarının üstünlüyü haqqında söylədiyim mülahizələr xristianlıq ruhu ilə bir araya sığışa bilməz. Odur ki, həmin əsərləri xarici jurnallara göndərmək məcburiyyəti qarşısında qaldım» (5).

Bəllidir ki, çar Rusiyası özünün bütün ərazilərində, o cümlədən işğal etdiyi ölkələrdə də xüsusi idarə orqanları ilə yanaşı yeni inzibati və məhkəmə sistemi yaratmışdı. Artıq 1840-cı illərin əvvəllərində komendant idarəçiliyi özünü doğrultmadığından ümumrusiya inzibati qayda-qanunları ilə əvəz edilmiş, əyalət komendantları qəza rəisləri ilə, mahal naibləri sahə iclasları ilə əvəz edilmiş, bütün cinayət və mülki işlər ümumrusiya qanunları ilə fəaliyyət göstərən sahə, qəza və vilayət məhkəmələrinə verilmişdi. Yalnız ailə və nigah işləri şəriət məhkəmələrində saxlanılmışdı (Rüstəmov, 2000: 174).

XIX əsrin 40-cı illərindən başlayaraq Mirzə Kazımbəy ilk Kazan gimnaziyası və Kazan Universitetində pedaqoji fəaliyyətini davam etdirməklə yanaşı İslam dini, onun yaradıcısı Məhəmməd

Peyğəmbər (s) haqqında və müsəlman qanunçuluğunun əsaslarına aid geniş həcmli əsərlər yazmağa başlamış, 1845-ci ildə özünün fundamental əsəri olan **«Müxtəsər - ül-vikayət»** və şərqşünas F.F.Tornau ilə birlikdə yazdığı **«Zaqafqaziya müsəlmanlarının məhkəmə işlərinin təşkili haqqında»** əsərlərini Kazanda çap etdirmişdir.

Bəlli olduğu kimi XIX əsrdə Rusiya imperatorluğunun müsəlmanlar yaşayan ərazilərində rəsmi ədliyyə orqanları ilə yanaşı şəriət məhkəmələri də fəaliyyət göstərirdi. Hənəfi hüquq məktəbi üzrə müxtəsər müsəlman qanunşünaslığı kursunu hazırlayıb çap etdirən Mirzə Kazımbəy bu çətinliyi «Müxtəsər ül-vikayət» əsəri ilə aradan qaldırmışdı. Əsər tez bir zamanda müsəlman hüquqşünasları arasında böyük şöhrət qazanmış, müasirləri tərəfindən çox yüksək qiymətləndirilmiş, Avropa elmi dairələrində alimə böyük nüfuz qazandırmışdı. Artıq bu əsərdən sonra Mirzə Kazımbəy Avropa elmi dairələrində müsəlman hüququ və Şərq hüquqşünaslığının görkəmli bilicisi kimi tanınmışdı. İ.N.Berezin bu əsərin dəyəri və alimə gətirdiyi şöhrətdən bəhs edərək yazmışdı ki, Kazımbəyin əsərləri içərisində «Müxtəsər ül-vikayət» mətninin mükəmməl işlənməsinə və əlyazmalarında təsadüf edilən çətinliklərin aradan qaldırılmasına görə birinci olmasa da, ilk yerlərdən birini tutur… Belə bir işin öhdəsindən yalnız İslam haqqında dərin məlumatı olan bir şəxs gələ bilərdi. Mirzə Kazımbəyin elmi əsərləri arasında məhz «Müxtəsər ül-vikayət» öncül yer tutur (Kazanskiy Universitet, 1804-1979).

Mirzə Kazımbəy «Müxtəsər ül-vikayət» əsərinin yalnız ərəb dilindəki mətnini hazırlamış, mətnə haşiyələr və geniş müqəddimə yazmışdır. Müqəddimədə alim İslam hüquqşünaslığının və hənəfi hüquq məktəbinin əsas ehkam və prinsiplərini izah etmiş, İslam hüquq terminlərinin təfsirini vermiş, əsərin müəllifi Buxaralı Sədr üs-Şəriət Übeydullah haqqında geniş məlumat vermişdir (Kazem-Bek, 1854: 245).

M.Kazımbəy əsərə yazdığı müqəddimədə həmçinin İslam alimləri tərəfindən aparılmış bütün elmlərin təsnifatı və onların növləri haqqında məlumat vermiş və göstərmişdi ki, İslam alimlərinə görə elmlər üç əsas hissəyə bölünür: 1) ərəbizmlər; 2) şəriət; və 3) hikmət. Dilçilik, ədəbiyyatşünaslıq və üslubiyyatdan bəhs edən birinci hissə filologiya elmlərini özündə ehtiva edən leksikoqrafiya (lüğətçilik), etimologiya, sintaksis, ritorika (bəlağət) və onun «məan, bəyan və bədii» adlı bölmələri, tarix və onun şöbələri və "Quran" qiraətindən (elmi-ül qiraət) bəhs edir (7).

İkinci hissə - şəriət altı ayrı-ayrı elmə bölünür ki, bunlar da aşağıdakılardan ibarətdir: 1) «Quran»ın şərhi olan təfsir elmi; 2) hədis elmi; 3) fiqh (qanunşünaslıq) elmi; 4) kəlam elmi; 5) fəraiz (ölən adamın əmlakının bölünməsi haqqında xüsusi qanunlar toplusu) elmi; 6) fiqhin üsulları (üsul-il-fiqh) elmi, yəni qanunların əsasını təşkil edən qaydalar haqqında elm.

Üçüncü hissə isə: 1) məntiq; 2) riyaziyyat; 3) coğrafiya və astrononimiya; 4) tibb və təbiyyət elmləri; 5) mücərrəd fəlsəfəni əhatə edir (Kazem-Bek, 1985: 245).

Müəllif əsərə yazdığı müqəddimədə özünün də qeyd etdiyi kimi, digər məsələləri kənara qoyaraq əsasən ikinci hissə olan «Şəriət» və onun bölmələrindən bəhs etmişdir. Alim göstərirdi ki, müsəlmanlar Allah tərəfindən xalqın içərisindən seçdiyi və onlara xoşbəxtlik yolunu göstərəni Allahın qanunlarının mənbəyi hesab edirlər. Bu hazırlanmış yolu onlar «Şəriət» adlandırırlar. Şəriət qanunlarının başçısı isə Məhəmməd (Məhəmməd Peyğəmbərdir. (s). Müəllifə görə, «şəriət» sözünün mənası «yol hazırlamaq» deməkdir. Şəriətin bu qanununu müsəlmanlar «Ehkam» adlandırırlar. Ehkamın ilk və əsas mənbəyi isə "Quran" və sünnətdir. Sonradan onlar tədqiqat mövzusuna çevrildi və ilk elm olaraq «Quran»ın şərhi (təfsiri) yarandı. Bütün şəriət ehkamları mükəlləflərin əməllərinə və ya onların imanına aid oldu. Qanuna görə «mükəlləf» sözü «qanuna aid olan» deməkdir. Qanuna aid olmayan isə «qeyri mükəlləf» adlanır ki, bunlara həddi buluğa çatmamışlar, dəlilər, ağıldankəmlər daxildir.

"Quran" və "Sünnət" şəriətin ehkamlarının əsas mənbəyi olduğu kimi, fiqhin üsulları da qanunşünaslığın əsas sisteminin mahiyyəti kimi qəbul edilir (Kazem-Bek, 1985: 247). Şəriətin bütün ehkamları mükəlləflərə aiddir. Bütün mükəlləflər onların həyatında mühüm rol oynayan bu ehkamları bilməyə borcludurlar. Onlar bu ehkamları ya özləri tədqiq edib öyrənməli və ya başqa tədqiqatçıların əsərlərindən öyrənməlidirlər. Şəriət ehkamlarının tədqiqində insanların təşəbbüs sahəsinin genişləndirilməsi üçün xeyli mövzu vardır. İslamın birinci əsərinə aid ehkamları tədqiq

edən ilk qanunşünaslar səhabələr, daha doğrusu, Peyğəmbərin səmimi şagirdləri və həmsöhbətləri olmuşlar.

Mirzə Kazımbəy göstərir ki, «fiqh» sözünün kökü «fkh» olub, ilk mənası «anlayış, idrak» deməkdir. «Quran» və daha sonra sünnətin göstərişlərinə bələd olanlara «bilikli» anlamına gələn «fəqih» deyildi.

Alimin fikrincə, «fiqh elmi»nin tarixi İslam qanunvericiliyindən başlayır ki, bu da Məhəmməd Peyğəmbərin (s) adı ilə bağlıdır. Onun ölümündən sonra ali məhkəmə hüququnu ilk xəlifələr (Əbubəkr, Ömər, Osman və Əli) yerinə yetirməyə başlamış və onlar da şəri qanunlara bir sıra əlavələr etmişdilər. Daha sonra ayrı-ayrı yerlərdəki əmir və valilər «Quran» və sünnətdən müxtəlif şəkildə istifadə etdiklərindən müəyyən mübahisələr yaranmış, xəlifələr özlərindən sonra öz yerlərinə varislərini keçirməklə «Quran» və sünnətin qanunlarını pozmağa başlamışdılar. Bütün bunlar qanunşünaslar tərəfindən qəbul edilməmiş və beləliklə «Quran» və sünnət əsasında hüquqşünaslıq elmi yaranmışdı. Bütün bunları qeyd etdikdən sonra Mirzə Kazımbəy İslam qanunşünaslığının yaradıcıları olan ilk müctəhidlər haqqında da qısa məlumatlar vermiş və göstərmişdi ki, hicrətin birinci yüzilliyində olan müctəhidlər bir-birilərindən fərqli olmuşlar. Bu hüquqşünas alimlərdən səkkizi ən önəmlisi olub müxtəlif yerlərdə «Quran»ın şərhi üzrə sistematik əsərlər yazmışdılar ki, bunlardan da ən məşhuru Kufədə İslam hüquq məktəbinin yaradıcılarından sayılan İmami-Əzəm Əbu Hənifə idi.

İmami-Əzəm Əbu Hənifə haqqında qısa məlumat verən Mirzə Kazımbəy göstərir ki, o, "əməvilərdən olan səkkizinci xəlifə Ömər bin Əbdül Əzizin qısa müddətli xəlifəliyi dövründə yazıb-yaratmış və xəlifə Ömər bin Əzizi ilk dörd xəlifədən - Əbu Bəkr, Ömər, Osman və Əlidən sonra beşinci mömin xəlifə adlandırmışdı» (Kazem-Bek, 1985: 250).

Müəllif «Müxtəsər ül-vikayət» əsərinə yazdığı müqəddimədə ərəb xilafətinin zəbt etdiyi ölkələrdə öz dinləri və dillərini yaydıqları kimi o ölkələrdə öz hüquq sistemlərini də tətbiq etdiklərini qeyd etmiş və göstərmişdi ki, bütün bunlarla əlaqədar olaraq Şərqdə yeni-yeni məzhəb və təriqətlər yaranmışdı. Bu təriqətlərdən ən məşhuru «Xaricilər» və «Mötəzililər» idi ki, bunların da hər birinin bir çox bölmələri var idi. Kazımbəyin fikrincə, Kufə, Bəsrə və digər yerlərdə yaranan sxolastik dini nəzəriyyələr və dilçilik məktəbləri fiqh elmi ilə güclü rəqabətə girmişdilər. Bu işdə yüz il müddətində formalaşan altı hüquq məktəbindən dördünə İslamın yenidən bərpası üçün dinin sütunu, dirəyi kimi baxırdılar. Bu, məktəblərin adları da onların yaradıcılarının adı ilə bağlıdır. Kazımbəy XV-XVI əsrlərdə yaşayıb yaratmış məşhur türk hüquq alimi, **«İzah-ül-islah»** əsərinin müəllifi, dövrün şeyxül islamı İbn Kamal Paşanın əlyazmasından götürdüyü bir faktı qeyd etmiş və onun sözbəsöz tərcüməsini rusca verərək göstərmişdi: «Əgər sən şəriətin sütunlarını bilmək istəyirsənsə, onda Məhəmməd, Niman, Malik, Əhməd, Sufyanı dinlə və dərk et, sonra da Davudu yada sal». Mirzə Kazımbəy bu siyahıya düzəliş edərək onları belə sıralamışdır: 1) İmam Əzəm kimi tanınan «Əbu Hənifə» ləqəbli Sabit oğlu Niman. Bu ləqəblə (Əbu Hənifə ləqəbi ilə - R.Ə.) onun tərəfdarları «hənəfilər və əzəmilər» adlanmışlar. O, hicri 150-ci ildə vəfat etmişdir; 2) İmam Malik (vəfatı hicri 179-cu il); 3) Süfyan əs-Sauri (vəfatı hicri 161-ci il); 4) İmam Məhəmməd əş-Safii (vəfatı hicri 204-cü il); 5) İmam Əhməd bin əl-Hanbal (vəfatı hicri 241-ci il); 6) İmam Davud əz-Lahiri (vəfatı hicri 270-ci il) (Kazem-Bek, 1985: 151-152).

Müəllifə görə, bu 6 imam öz nöqteyi-nəzərləri, öz tədrisləri ilə bir-birindən müəyyən qədər fərqlənsələr də, qanunşünaslığın tam sisteminin əsasını qoymuşlar. Onların şagirdləri və davamçıları bu sistemləri təkmilləşdirmək məqsədilə saysız-hesabsız əsərlər yaratsalar da, müsəlman hüquqşünaslığına əsaslı zərbə vura bilməmişdilər. Ancaq saurilərin və zahirilərin məktəbləri sonradan aradan çıxaraq başqalarına birləşmiş, yalnız Hənəfi, Şafii, Hanbali və Maliki məktəbləri sünni təriqətlərinin əsasını təşkil etmişdilər. Bu məktəblərin yaradıcılarından heç biri digərlərinin əleyhinə nə sözdə və nə də əməldə getməmiş, əksinə, kiçiklər böyüklərə, özlərindən əvvəlkilərə həmişə yüksək hörmətlə yanaşmışdılar. Belə ki, İmam Şafii özündən əvvəlki İmam Əzəm Əbu Hənifə haqqında demişdir ki, dünya alimləri içərisində onun kimi qanunşünas alim yoxdur. O, bu sahədə bütün fiqh alimlərinin atasıdır. Kim onun və şagirdlərinin əsərlərini oxumayıbsa, o, hələ hüquq elmini bilmir. İmam Şafii İmam Hənəfinin şagirdlərinin şagirdlərindən

olduğu üçün qürur duymuşdur. Əhməd bin Hanbal xəstə olarkən sağalmaq məqsədi ilə İmam Şafinin köynəyini geymişdi (Kazem-Bek, 1985: 152-153).

Bu hüquq məktəbləri və onların yayılma arealları haqqında məlumat verən alim İslam fiqhinin mərasim və mülki və ya siyasi hüququndan bəhs edərək yazır ki, «mərasim hüququna dinin zahiri formasına aid olan bütün qayda-qanunlar - ibadət etmə, dəstəmaz, təharət (təmizlənmə), oruc (pəhriz), zəkat, Məkkəyə səyahət (həcc ziyarəti) və s. daxildir. Mülki və ya siyasi hüquqa müsəlmanın siyasi həyat tərzi - kafirlərə, öz dindaşlarından olan qiyamçılara qarşı müharibə və bütün polis, mülki və cinayət işləri daxildir. Bütün fiqh qayda-qanunlarına «Quran» ehkamları və sünnətin əsasında baxılır» (Kazem-Bek, 1985: 254-255).

Mirzə Kazımbəy müsəlman hüququnun yaranmasını Məhəmməd Peyğəmbərin (s) adı ilə bağlayaraq göstərmişdi: «Şərq hüquqşünasları İslamın ilk dövrlərindən qanunun müstəqilliyi və toxunulmazlığını müdafiə edirdilər. Məhəmməd öz tərəfdarlarının dini və siyasi həyatına aid hər şeyi özündə cəmləşdirmişdi. Onlar üçün öz tərəfdarlarına qoyub getdiyi «Quran» və sünnət Peyğəmbərin ölümündən sonra da dəyişilməz rəhbər olaraq qalmışdı» (Kazem-Bek, 1985: 255). Xəlifələr belə irsi olaraq Peyğəmbərin siyasi hakimiyyətini alsalar da qanunvericilikdə heç bir hüquqa malik deyildilər. Onlar ancaq «Quran» və sünnəti tədqiq edərək qanunları onlara uyğunlaşdırmağa və qanunların formulunu təsis etməyə müvəffəq ola bilmişdilər. Yalnız İslamın sərhədlərinin genişlənərək Asiya qitəsindən Afrikaya (və qismən də Avropaya) yayılmasından sonra xəlifəliyin mahiyyəti dəyişmiş, siyasi hakimiyyət bu və ya digər dərəcədə dini hakimiyyətdən ayrılmış və beləliklə də, qanunun nüfuzu artmışdı. Artıq qanun hüquqşünasların əlinə keçmiş, xəlifə yalnız ali hakim vəzifəsini formal olaraq icra etməyə başlamışdı. Bu qanunşünaslar öz müəllimlərindən dərs alıb öz biliklərini artırdıqdan və onlara sərbəst qərar vermək hüququ verildikdən sonra bu işə başlaya bilərdilər (Ələkbərli).

Mirzə Kazımbəy müsəlman hüququnda başlıca yer tutan «ictihad» məsələsinə xüsusi diqqət yetirmiş və belə hesab etmişdi ki, qanunşünaslıqda «müstəqillik və nüfuz dərəcəsini müsəlmanlar «İctihad» adlandırmışlar. Bu söz leksik anlamda «ciddi cəhd, ciddi səy» deməkdir... Bu dərəcəni qazananlara «müstəhid» deyirlər» (Kazem-Bek, 1985: 257-258). Alimə görə, ictihadın üç dərəcəsi vardır: 1) əl-ictihad fi-ş-şər-qanun tərtib etməkdə müstəqillik; 2) əl-ictihad fi-l-məzhəb-qanun tərtib edənin yaratdığı məktəb və sistemin müstəqilliyi; 3) əl-ictihad fi-l-məsail - hökmün icrasında müstəqillik. İslam hüquqşünaslığında əl-ictihad fi-ş-şər mükəmməl, nisbi olmayan nüfuz adlanır və şəriət baxımından Allahın ən yüksək hədiyyəsi hesab edilir. Əl-ictihad fi-l-məsail isə başqa cür qanunun hökmü sahəsində nüfuz və yaxud xüsusi nüfuz sahibi adlanır (Kazem-Bek, 1985: 258).

Hər üç dərəcəni ayrı-ayrılıqda təhlil edən mütəfəkkir sonda belə bir əsaslı fikir irəli sürür ki, «bu dərəcəyə (üçüncü dərəcə əl-istihad fi - l məsail nəzərdə tutulur - R.Ə.) çatmağa can atanlar, əlbəttə, hüquqşünaslığın bütün məktəblərini və bu elmin bütün sahələrini, o cümlədən qanunşünaslıq üçün zəruri hesab edilən ərəbcə və məntiq də daxil olmaqla hüquq elminin bütün sahələri haqqında mükəmməl biliyə sahib olmalıdırlar. Onlar qanundan doğan hər bir məsələni dərhal həll etməyə hazır olmalı, öz qərarını əsaslandırmaq üçün, dəlilləri göstərməli və bu məsələ barəsində birinci və ikinci dərəcədən olan müctəhidlərin müxtəlif rəylərini üzə çıxarmalıdır» (Kazem-Bek, 1985: 270-271).

Daha sonra müəllif hənəfi məktəbində əsas yer tutan müctəhidlərin adlarını və ölüm tarixlərini göstərmiş və xüsusi qeyd etmişdir ki, bu müctəhidlərdən ən məşhuru «əl-Məbsut», başqa sözlə «Mükəmməl» adlı 15 cildlik əsərin müəllifi Məhəmməd əs-Sərəxsidir (Kazem-Bek, 1985: 271).

1840-cı illərin II yarısından başlayaraq bilik və istedadını İslam qanunşünaslığına həsr edən, bu sahədə «misli-bərabəri olmayan» (İ.N.Berezin) Mirzə Kazımbəy Rusiya müsəlmanları üçün nümunəvi şəriət qanunları külliyyatının tərtibi məsələsinə xüsusi diqqət yetirmiş, bu külliyyatın zəruriliyini qeyd etmiş və akademik Dorna yazdığı məktubunda göstərmişdir ki, «müsəlman qanunları külliyyatının tərtibi asan iş deyil. Bu işi xüsusi bir komitə uzun illər ərzində başa çatdıra bilər» (13).

## Nəticə

Çar Rusiyasının müsəlman əhalisi içərisində sünni məzhəbinin Hənəfi və Şafi qolu və şiəlik geniş yayıldığından Mirzə Kazımbəy əsasən bu məzhəblərin hüquqi baxışlarının tədqiqi, təfsiri və onların əsas müddəalarının rus dilinə tərcüməsi ilə məşğul olmuş, hənəfi məktəbi üzrə müsəlman qanunşünaslığının qısa kursunu məhz «Müxtəsər-ül-vikayət» adı altında çap etdirmişdi. Bütün bunların nəticəsi idi, ki, Mirzə Kazımbəyin müsəlman hüququ sahəsində Rusiyada nüfuzlu mütəxəssis olduğunu nəzərə alaraq onu 1852-ci ildə bu işlə məşğul olan Xüsusi Komitənin üzvü təyin etmişdilər.

## Ədəbiyyat

1. Rusiya Dövlət Kitabxanasının əlyazmalar fondu. M.P.Poqodinin arxivi, f. 235.
2. Tatarıstan. MDA, f. 1186, iş 28.
3. Rzayev, A.K. (1981). Mukhammed Ali Mirza Kazem-Bek. Baku: «Elm».
4. Quliyev, V. (1987). Mirzə Kazımbəy. Bakı: «Yazıçı».
5. Russkiy arkhiv. (1893). SPB.
6. Rüstəmov, İ. (1981). Abbasqulu Ağa Bakıxanov. Bakı: Elm.
7. Rusiya MDTA, f.776, iş 126.
8. Rüstəmov, Y. (2000). Siyasi-hüquqi təlimlər tarixi. Bakı.
9. Kazanskiy Universitet. (1804-1979). Ocherki istorii. Kazan.
10. Kazem-Bek, M. (1854). Uchebnoye posobiye dlya vremennogo kursa turetskogo yazyka. SPb., 9 c.
11. Kazem-Bek, M. (1985). Izbrannyye proizvedeniya. Baku: «Elm».
12. Ələkbərli, F. Azərbaycan Türk fəlsəfəsi və ictimai fikir tarixi (XIX-XX əsrlər). I h.
13. Rusiya MDTA. f. 778, iş 130.

Göndərilib: 16.02.2024 Qəbul edilib: 03.04.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/15-21

**Məlahət Ağayeva**
AMEA Memarlıq və İncəsənət İnstitutu
sənətşünaslıq üzrə fəlsəfə doktoru
melahet-agayeva@mail.ru

# SABİT RƏHMANIN YARADICILIĞINDA CƏMİYYƏT VƏ ŞƏXSİYYƏT PROBLEMİ

**Xülasə**

Sabit Rəhman ilk qələm təcrübəsindən başlayaraq öz ideyalarını gülüş, satira və yumor vasitəsilə ifadə etmişdir. İlk qələm təcrübəsi olan felyetonlarını o satirik əsərlər kimi qələmə alır. Üç felyetonu; "Ordan - burdan", "Yetərə açıq məktub" və "Mərdəkandan". Sabit Rəhmanın felyetonları ilə yanaşı hekayələrində və pyeslərində də bəzi şəxsiyyətlərin yalandan özlərini yeniliyin carçısı kimi göstərsədə, əslində keçmişin qalıqlarındandır. "Şirin bülbül" "Nəfəs pulu" "Vəfasız", "Dizi yamaqlı", "Şlyapa", "Qudurğan" hekayələrində cəmiyyətimiz də olan yeniliklə köhnəliyin mübarizəsindən söhbət açılır. Sonda yenilik qalib gəlirdi.

Müəllif eyni zamanda, kiçik həcmli pyeslərdə yazıb. Bunlardan digər müəlliflərlə birlikdə yazdığı pyeslərdə var. Möhsün Sənani ilə birlikdə yazdığı "Adaxlılar" və Adil İsgəndərovla birlikdə yazdığı "Partizan Məmməd" adlı pyesləridir. Azərbaycan Dövlət Gənc Tamaşaçılar Teatrı "Partizan Məmməd" adlı pyesi tamaşaya qoydu. "Partizan Məmməd" pyesi 1937-ci ilin noyabr ayının 20-də Məhərrəm Haşımovun quruluşunda tamaşaçılara göstərildi.

Müəllif xalq içindən çıxan partizan Məmməd obrazını bu şəxsin timsalında ümumiləşdirdi. Tamaşa uşaqlarda vətənpərvərlik, qəhrəmanlıq hisləri oyatmış, onları yaxın keçmişdə olan mübarizə ilə tanış etmişdir.

***Açar sözlər:*** *Sabit Rəhman, felyeton, hekayə, pyes, cəmiyyət, şəxsiyyət, tamaşa*

**Malahat Agayeva**
ANAS Institute of Architecture and Engineering
Doctor of Philosophy in Art Studies
melahet-agayeva@mail.ru

## The problem of society and personality in Sabit Rahman's work

**Abstract**

Sabit Rahman expressed his ideas through laughter, satire, and humor since his first pen experience. He wrote his feuilletons, which were his first pen experiences, as satirical works. His three feuilletons: "From here – here", "Open letter to Yeter" and "From Mardakan". Some personalities show themselves falsely as harbingers of innovation, but they are remnants of the past in reality in his stories and plays, besides in Sabit Rahman's feuilletons. The stories "Sweet Nightingale", "Breath Money", "Unfaithful", "Patched Knees", "Hat", and "Arrogant" talk about the struggle between the new and the old in our society. Innovation won in the end.

At the same time, the author also wrote small plays. In addition to these, there are plays he wrote together with other authors. They are the plays "Betrotheds" written together with Mohsen Sanani and "Partisan Mammad" written together with Adil Iskenderov. Azerbaijan State Theater of Young Spectators staged the play "Partisan Mammad". The play "Partisan Mammad" was shown to the spectators in the production by Maharram Hashimov on November 20, 1937.

The author summarized the character of the partisan Mammad, who emerged among the people, in the example of this person. The play awakened feelings of patriotism and heroism in the children and introduced the struggle of the recent past to them.

***Keywords:*** *Sabit Rahman, feuilleton, story, play, society, personality, performance*

## Giriş

Azərbaycan ədəbiyyatının, mədəniyyətinin və incəsənətinin görkəmli simalarından biri də Sabit Rəhmandır. S.Rəhman ədəbi fəaliyyətə başladığı ilk illərdən; felyeton, hekayə, povest və pyeslərində də xalqımızın öndə gedən problemlərin düşünüb. İnsanların cəmiyyətimiz üçün etdiyi yaxşı və pis cəhətlər araşdırıb.

Biz problemlərdən danışarkən əvvəlcə cəmiyyət və şəxsiyyət problemləri haqqında məlumat verməliyik. Hamımıza yaxşı məlumdur ki, şəxsiyyəti formalaşdıran cəmiyyətdir. Şəxsiyyət dedikdə yalnız gözünün rənginə, bədən quruluşuna, səsinin tembrinə, barmaq izlərinə görə deyil, şəxsiyyət xarakteriskasına görə də bir-birimizdən fərqlənirik. Bu bizim vətənpərvərliyimizi, xoş yaxud bəd xasiyyət olmağımızı, cəmiyyətə bəslədiyimiz insani fikirləri, insanlara göstərdiyimiz münasibətlərin bariz nümunəsidir (Əhmədov, 2010: 296).

S.Rəhmanın ilk qələm təcrübəsindən başlayaraq öz ideyalarını gülüş, satira və yumor vasitəsilə ifadə etmişdir. İlk qələm təcrübəsi olan felyetonlarını o satirik əsərlər kimi qələmə alır. Rus ədəbiyyatşünası L.A.Plotkin yazır: “Satira ədəbiyyatın ayrıca janrı deyildir. O, həm eposda, həm lirikada, həm də dramaturgiyada iştirak edir. Satirik məqsəd üçün zaman, povest, hekayə, pyes kimi hər bir janrdan istifadə etmək olar. Lakin elə janrlarda da vardır ki, təkcə satiraya məxsusdur. Hekayə və şeir satirik, yaxud qeyri-satirik ola bilər, təmsil, epiqram, parodiya, pamflet, felyeton isə ancaq satirik əsərlər kimi qəbul edilə bilər” (Plotkii, 1965: 37).

Müəllifin özünün də nəzəri cəhətdən komediya haqqında yazıları var. Bu yazılarında S.Rəhman komediyada gülüşün, satiranın yerini göstərir. Satira güldürməklə yanaşı, tamaşaçını düşündürməlidir sualına S.Rəhman belə cavab verir: “Hər ikisi lazımdır” (Sabit Rəhman, 1958) - deyir. Buna görədə o, “yalnız güldürən, ancaq heç bir şey öyrətməyən, düşündürməyən, bəzi komediyalar tənqid edir, onları idealsız əsərlər adlandırır” (Sabit Rəhman, 1960: 538).

Sabit Rəhman əsərlərində (felyeton, hekayə və pyes) öz müasirliyi ilə daim seçilmişdir. Onun əsərlərində qoyulan şəxsiyyət və cəmiyyət problemləri öz məzmununa görə köhnəlmir, bu günkü günümüzlə səsləşir. Vəzifəpərəstlər, dövlət malına xor baxanlar, yalan və həqiqət, dünən olduğu kimi, bu gündə insanları düşündürür.

“Molla Nəsrəddin” jurnalında S.Rəhmanın 1927-ci ildə üç felyetonu çap olunur: “Ordan - burdan”, “Yetərə açıq məktub” və “Mərdəkandan”. “Ordan - burdan” felyetonu bədii materialını bir neçə həyat faktı təşkil edirdi. “Ordan - burdan” (“Molla Nəsrəddin”, 1927, № 3) felyetonunda Şəki restoranından, həm də “Yenikənd” kinosundan söhbət açır. Felyetonçu toxunduğu problemləri bir şəxsiyyətin dili ilə verir. Həmin şəxsiyyət restoranda kef edən insanlara “Yeni kənd” kinoteatrına getməyi məsləhət görür. “Yeni kənd” kinoteatrında göstərilən filimlər insanları maarifləndirməyə xidmət edirdi (Kərimov, 1969: 173).

Felyetonu kinayəli dil ilə davam etdirən müəllif üçüncü məsələ kimi Şəki müəllimlərinin qumar oynamasından danışır, başqa qəza məktəbinin müəllimlərinin də qumar oynamasını tövsiyyə edir və müəllimlərin şagirdləri üçün daha layiqli, daha savadlı olmalarını tövsiyyə edir.

“Yetərə açıq məktub” (“Molla Nəsrəddin”, 1927, № 31) felyetonunda isə Bakı ilə Şəki xəbərlərindən ibarət olur. Satirik səpkidə yazılan felyetonda isə satirik hədəflər üçün xarakterik olan “zasidaniya”, “reqistrator” sözləri xarakterin iç üzünü açırdı (Kərimov, 1978: 96).

Sabit Rəhmanın felyetonları ilə yanaşı hekayələrində də bəzi şəxsiyyətlərin yalandan özlərini yeniliyin carçısı kimi göstərsədə, əslində keçmişin qalıqlarındandır. “Şirin bülbül” adlı hekayəsində yemək və qadın düşkünü olan Cəlil Naimi əfəndidən danışılır. Onun şəxsiyyətsiz siması cəmiyyətimizi aldadaraq, min cür dona girir. İngilislərin Azərbaycana dəvət olunmamışdan qabaq Quba meydanında, Kömürçü bazarında o, ingilislərin əleyhinə düz saat yarım çənə döyərək, bazar camaatında ingilislərə qarşı nifrət oyatmışdır. İngilislər gələndən sonra isə onlara qarşı tamam dəyişmiş, onları tərifləməyə başlamışdı (Rəhimli, 2013: 621).

Eyni zamanda Osmanlılar Bakıya hücum edəndə Cəlil Naimi əfəndi “Ay camaat, qoymayın, sünnülər gəldi şiələri öldürməyə”- dediyi halda, Osmanlılar Bakıya girdikdən sonra, onların dilində danışmağa başlamışdı. Hətta Osmanlı çavuşlarının nəzəri altında əriyərək “Ax osmanlılar, osmanlılar” - deyərək ağlayan Cəlil Naimi əfəndidəni tribunaldan güclə dartıb düşürmüşlər.

Buradakı gülüş satirik gülüş olub, əvvəlcə Bakıya hücum çəkənlərə qarşı camaatda nifrət oyadır, sonra isə Bakıya girdikdən sonra onlara (İngilislərə və Türklərə) yaltaqlanırdı (Rəhimli, 2013: 597).

"Nəfəs pulu" hekayəsində isə söhbət bir kəndin kətxudasından gedir. Avam, aciz, qul kəndlilər onun bir sözünü iki etmirlər. Kənd camaatına olmazın əzablarını yaşadan kətxuda hekayədə mənfi obraz kimi verilmişdir. Kəndlilərdən torpaq pulu, su pulu, naxıra gedib-gələn inəklər onun torpağını ayaqladığı üçün inək pulu, sonda isə nəfəs pulu yığmağı tələb edir. Nəfəs pulunun yığılması kənd camaatını ayağa qaldırır. Kətxudanın evinə hücum etsələrdə, kətxudanı evdə tapmırlar, kətxuda kəndlilərin qəzəbindən qorxaraq kənddən qaçmışdır. Müəllif bu hekayəsində yeniliyin köhnəlik üstündəki qələbəsindən danışırdı. "Çiy ət" hekayəsində isə tədarük anbarının müdiri olan Məmməd Qəribovun xalq malını dağıtmasından söhbət açılır. Xalq malını çapıb, talayıb, dağıdan M.Qəribov hər dəfə vəzifəsindən kənarlaşdıranda "Çiy ət" gördüyünü arvadına deyir. Cəmiyyətimizdə olan bu tip insanların sonda tutularaq, cəzalandırılmasından söhbət açılır.

Səhər tezdən yuxudan arvadına get qəzet al gətir deyir. Arvadı, qəzet nəyinə lazımdır – deyir.

Yadındadır Aztorqda işlədiyim.

-Yadımdadır... Qəndim o qədər idi ki, qapımızda koperativ dükanı kimi növbə olurdu" (Sabit Rəhman, 1958: 239).

Aztorqdan, selpodan, neft anbarından, çörək dükanından çıxanda da "çiy ət" görmüşdüm. Arvadı gedib qəzeti gətirdikdən sonra da, qəzetdə belə başlıqlı bir məqalə yazılmışdı; "Qəribovun fırıldaqları". İçinin oxunmasına gərək olmadığını düşünüb, şkafdan pul çıxardıb arvadına verir. – Bu pullarla mənə vəkil tutarsan. Nə qədər ki, bu qəzetlər var mənim kimi adamlara yaşayış yoxdur – deyir.

Sovet hakimiyyətinin insanlara olan qayğısından ağızdolusu danışan müəllif, "Altı qızın atası" hekayəsində altıncı qızın olduğunu görən Pirəli arvadını xəstəxanada atıb gedir.

Pirəlinin getməsindən narahat olan Qıztamam uşaqlarının nigarançılığını çəkirdi ki, xəbər gəldi ki, raykom qadınlar şöbəsinin müdiri onun xəbər alır. Ancaq, Qıztamam deyilənlərə inanmadı.

Sabahısı gün həkim rayon ispalkomunun sədrinin onun halını xəbər almasını soruşduğunu dedikdə, Qıztamam, yenədə inanmır. Həkim onun inanmadığını görüb, Pirəlinin arvadı Qıztamamın kefini xəbər aldığını dedi (Sabit Rəhman, 1945).

Qıztamamın ah çəkdiyini görən həkim, ah çəkməsinin səbəbini soruşur. - Pirəli uşaqları da, evi də atıb getdi- dedi.

Evdəki uşaqlara baxmaq üçün xəstəxanadan Qıztamamgilin evinə bir qadın göndərdilər. Günorta üstü rayon ictimai-təminat şöbəsindən Qıztamama maddi yardım gəldi. Pionerlər evindən gələn pionerlər Qıztamama təzə ev verdiklərini, eyni zamanda, balacaları südlə təmin etmək üçün, inək verildiyi bildirildi. Bu xəbər bütün rayona yayıldı. Bu xəbəri eşidən rayon qəzetinin müxbiri fotqraf gəlib Qıztamamın şəklini çəkib mətbuatda paylaşdı.

İki gündən sonra çıxan qəzetdə, Qıztamamın şəklinin altından "Altı qızın anası" sözləri yazılmışdır.

Belə bir cəmiyyətdə yaşamaq insanlara, uşaqlara, qızlara verilən dəyəri dəyərləndirmək hər bir kəsə nəsib olmasını kim istəməz.

Pirəli isə rayon küçələrində avara-avara gəzir, dərdini unutmaq üçün içki içirdi. İki gün içdikdən sonra, harada yaşayacağını düşünürdü. Qət etmişdi ki, Qıztamamın həndəvərinə də hərlənməyəcək. Ayıldıqca özünə yaşamağa yer tapmadığı üçün, Qıztamama yaxınlaşmağı düşündü. Yaşadıqları otağı yarıya bölünməyi düşündü. Bir yarısında altı qızı ilə anasını, o birisi yarısında isə özünün qalmasını fikirləşdi.

Sabah öz həyətlərinə gələrək, qapılarındakı qıfılı görüb çaşdı, qonşuluqda yaşayan qoca bir qarı – Qıztamamın şəklinin qəzetdə gördüyünü – dedi.

Fikirli – fikirli gələn Pirəliyə upravdom rast gəldi. Upravdom Qıztamama dəyə bilməyəcəyini deyib, təzə orderi ona (Qıztamama-M.A) çatdırıb, qol çəkdirməsini xahiş etdi. Bunun ardınca bir lopabığ kişinin öz ardınca inək gətirdiyini gördü. Bu inəyin də Qıztamamın uşaqları üçün gəldiyini deyir və - "altı qızın atası olmaq bilirsən nə böyük şərəfdir?!" (Sabit Rəhman, 1958: 249).

Cəmiyyətimizdə qız uşaqlarına qarşı olan ögey münasibət, Pirəli kimi insanların timsalında münasibətləri xalqımız üçün yad, mənfi hal kimi qiymətləndirilirdi.

Bu həmin dövür idi ki, Azərbaycanda Sovet hakimiyyəti qurulmuşdu. Daha xalqı, milləti, cəmiyyəti aldatmaq olmazdı. Cəmiyyətdə, ancaq müsbət şəxsiyyətlər yaşamaqda idi.

Eyni zamanda müəllifin "Vəfasız", "Dizi yamaqlı", "Şlyapa", "Qudurğan" hekayələrində cəmiyyətimiz də olan yeniliklə köhnəliyin mübarizəsindən söhbət açılır. Sonda yenilik qalib gəlirdi.

Müəllif eyni zamanda, kiçik həcmli pyeslərdə yazıb. Bunlardan digər müəlliflərlə birlikdə yazdığı pyeslərdə var. Möhsün Sənani ilə birlikdə yazdığı "Adaxlılar" və Adil İsgəndərovla birlikdə yazdığı "Partizan Məmməd" adlı pyesləridir. "Partizan Məmməd" pyesində Oktyabr inqilabı ərəfəsində yazılmış bir partizanın həyatından danışılır. Dövr üçün aktual olan, bir şəxsin partizanları öz arxasınca irəli aparması cəmiyyətimiz üçün maraqlı mövzu idi. Pyesin aktual olduğunu görən Azərbaycan Dövlət Gənc Tamaşaçılar Teatrı "Partizan Məmməd" adlı pyesi tamaşaya qoydu. "Partizan Məmməd" pyesi 1937-ci ilin noyabr ayının 20-də Məhərrəm Haşımovun quruluşunda tamaşaçılara göstərildi. Tamaşanın rəssamı Muşeq Saqi, musiqi tərtibatını bəstəkarı A.Dobruşkaş geyim eskizlərini isə Əzim Əzimzadə, vermişdi. Teatr ictimaiyyəti və tamaşaçılar tərəfindən alqışlarla qarşılanan bu pyes teatrın 10 illik yubileyi münasibətilə göstərilən tamaşaların siyahısına daxil edildi. "Partizan Məmməd" tamaşası may ayının 21-dən 27-dək hər gün tamaşalara göstərildi.

Müəllif xalq içindən çıxan partizan Məmməd obrazını bu şəxsin timsalında ümumiləşdirdi. Tamaşa uşaqlarda vətənpərvərlik, qəhrəmanlıq hisləri oyatmış, onları yaxın keçmişdə olan mübarizə ilə tanış etmişdir (Sabit Rəhman, 1948).

Sabit Rəhman özüdə bir şəxsiyyət kimi cəmiyyətimiz ücün dəyərli işlərdə görmüşdür. O, öz qələmini teatr tənqidi sahəsində də sınamış və bir sıra dəyərli məqalələr yazmışdır. Bu məqalələrində də müəllif şəxsiyyət və cəmiyyət problemlərinə toxunmuşdur. Müxtəlif tamaşalara həsr olunan bu məqalələrdə yazıcı əsərin dramaturji mətnini, rejissor yozumunu, səhnə tərtibatını, bəstəkar musiqisini və aktyor ifalarını yüksək estetik meyarlarla təhlil etmişdir. Onun "Bir evin sirri" və "Canlı meyit" tamaşaları haqqında yazdığı resenziyalar da bu qəbilədən olan yazılardır. M.Əzizbəyov adına Azərbaycan Dövlət Dram Teatrında (indiki Akademik Milli Dram Teatrında) Tur qardaşlarının yazdığı "Bir evin sirri" pyesi (əsil adı "Döngədə ayrı ev") 1949-cu ilin dekabr ayının 4-də tamaşaya qoyulmuşdu. Əsər çox maraqlı süjet xətti ilə seçilirdi. Burada Amerikanın "sülh siyasəti"nin əsil mahiyyəti açılıb göstərilirdi. Müharibənin cəmiyyət üçün yaratdığı naqis hallar əks olunurdu. Tamaşada yeni bir dünya müharibəsi yaratmaq və yalnız bu yolla həqiqi demokratiyanı boğmaq xəyalları ilə yaşayan ABŞ hökumətinin ikiüzlü, riyakar sifətləri göstərilirdi (Səfiyev, 1978: 123).

Tamaşanı geniş təhlil edən Sabit Rəhman Pavel Aleksandroviçi İsmayıl Osmanlının ifasında xeyirxah və dünyagörmüş bir şəxsiyyət kimi təqdim edir. Müəllif rejissor və hər bir aktyor oyunu haqqında öz fikirlərini bölüşərək yazırdı: "Kaştanovlar ailəsi də həm aktyorlar, həm də rejissorluq tərəfindən böyük sevgi və qüvvə ilə yaradılmışdır. Pavel Aleksandroviç İsmayıl Osmanlının ifasında dərin düşünən, sevimli və vətənpərvər bir qocadır. Osmanlı yaratdığı surətləri xırda ştrixlərlə bəzəməyi və detallarla rövnəqləndirməyi bacarır" (Sabit Rəhman, 1949).

Tamaşanın quruluşunu, bədii tərtibatını təhlil edən tənqidçi deyirdi ki, "Tamaşanın quruluşunu Səftər Turabov vermişdir. Rejissorun bu son işi müvəffəqiyyətlidir. Biz səhnədə maraqlı mizanlar və epizodlar görürük. Rejissor xüsusən sovet həyatını göstərən səhnələri məharətlə işləmişdir. Rəssam İsmayıl Axundoun bədii tərtibatı, sadəliyi və reallığı, rənglərinin müxtəlifliyi ilə diqqəti cəlb edir" (Sabit Rəhman, 1949).

Sabit Rəhman tamaşanın təkcə uğurlarından danışmır, eyni zamanda onun nöqsan və qüsurlarını da qeyd edirdi: "Əjdər Sultanovun mayor Kaştanovu, bəzi nöqsanlarına baxmayaraq əsasən müvəffəqiyyətlidir. Ancaq bəzən quru və sönük olur, özünü səhnədə çox gərgin hiss edir... Səfarətxananın katibi rolunu Əli Qurbanov özünəməxsus təravət və yumuşaqlıqla aparır. Ancaq bu aktyorun böyük müvəffəqiyyəti hesab oluna bilməz. Səhnəmizdə çox görkəmli və xatirədə qalacaq rollar yaradan Əli Qurbanov bu rolu daha dərindən işləyə bilərdi" (Sabit Rəhman, 1949).

1950-ci ilin yay aylarında Azərbaycana qastrol səfərinə gəlmiş Lenin komsomolu adına Moskva Dövlət Teatrı Bakı tamaşaçılarına L.N.Tolstoyun "Canlı meyit" tamaşasını göstərdi. Tamaşanın quruluşunu RSFSR xalq artisti S.Q.Birman vermişdi.

Əsərin qəhrəmanı Fyodor Protasov əhatə olunduğu alçaq, murdar həyata dözə bilmir, burjua cəmiyyəti insandakı ən yaxşı, ən nəcib hissləri məhv edir. Protasov öz nifrətini, kinini yalnız özünü öldürməklə ifadə edə bilir. Onun ölümü isə böyük bir üsyanın ifadəsi olur.

Tamaşa haqqında böyük bir məqalə dərc etdirən Sabit Rəhman rejissor işi, bədii tərtibat və aktyor ifalarını yüksək qiymətləndirərək yazır: "Stalin mükafatı laureatı, RSFSR xalq artisti S.Q.Birmanın rejissorluğu ilə işlənmiş bu tamaşa, qabaqcıl fikirlər daşıyan, insan əlaqələrinin təmizliyi uğrunda mübarizə aparan və burjua əxlaqının yalançılığını ifşa edən qüvvətli, realist bir sənət nümunəsidir" (Sabit Rəhman, 1950).

Moskva Dövlət Teatrının "Canlı meyit" tamaşasına baxan S.Rəhman tamaşadakı obrazların həyatla bağlılı olduğunu, Bersenevin Protasovu, Kutasinanın Maşası, Birmanın Karenikası realizmin əsasında yazıldığını bildirir. Tamaşa haqqında dolğun və obyektiv fikirlər söyləyən Sabit Rəhman öz məqaləsini belə bir fikirlə başa vurur: "Bu tamaşada böyük rejissor və aktyor sənətkarlığı vardır. Elə bir şəkil, elə bir epizod, elə bir təfərrüat yoxdur ki, orada həyatilik, yaradıcılıq, böyük ifşa qüvvəsi hiss olunmasın. Bersenevin Protasovu, Kutasinanın Maşası, Birmanın Karenikası teatrın yaratdığı ölməz surətlər silsiləsinə daxildir və Bakı tamaşaçılarının xatirindən uzun zaman silinməyəcəkdir. Hətta epizodik rollarda belə realizmin böyük qüvvəsi hiss olunur" (Sabit Rəhman, 1950).

Sabit Rəhman eyni zamanda dramaturqlar, rejissorlar, bəstəkarlar və aktyorlar haqqında da bir çox məqalələrin müəlifidir. Onun Azərbaycan teatrının inkişafında bir şəxsiyyət kimi xidmətləri olmuş İsmayıl Axundov, Bəşir Səfəroğlu, Hüseyn Ərəblinski, Cahangir Zeynalov, Mirmahmud Kazımovski, Murad Muradov, Mərziyə Davudova, Hüsüeynqulu Sarabski, Mehdi Məmmədov haqqında maraqlı məqalələri vardır.

Sabit Rəhmanın "Teatr hekayələri" adlı kitabında "Qara göz", "Nadir şah", "Ərəboğlu", "Məşədi İbad", "Cənnət xuliqanı" və s. teatr hekayələri və "Mirzə Fətəli", "Hüseyn Ərəblinski", "Sevimli rollar", "Teatr və həyat" adlı teatr haqqında kiçik pyesləri toplanmışdır.

Həqiqi bir teatr sevgisi ilə yazılmış iki şəkilli "Hüseyn Ərəblinski" adlı pyesində aktyorun cəmiyyətdə bir şəxsiyyət kimi formalaşmasında başına gələn faciəli hadisələrdən söhbət açılır. Azərbaycan teatrının ən acınacaqlı vəziyyətindən danışan müəllif tamaşa vermək üçün teatr binasının olmadığı, qadın aktrisalarına ehtiyac olduğu bir dövrü təsvir edir (Səfiyev, Sabit Rəhman, 1987: 198).

Aktyorluq sənətinə yüksək qiymət verən, yoldaşlarına rolu səhnədə yaşayaraq canlandırmağı məsləhət görən Ərəblinski Tehranskiyə deyirdi: "Yox Tehranski artist qramafon trubası deyil, canlı yaradıcıdır. Dramaturqun yaratdığı tipləri artist səhnədə canlandırmalıdır. Bunun üçün sözdən, qrimdən elə istifadə etməlisən ki, elə bil onlar sənin öz malındır. Sən gərək tamaşaçıların ürəyinə girməyi, hisslərinə təsir etməyi bacarasan. Komediya oynayırsansa-güldür! Faciə oynayırsansa-ağlat! ...Başa düşdün!" (Sabit Rəhman, Hüseyn Ərəblinski, 1949: 119).

XIX əsrin sonu XX əsrin əvələrində Azərbaycanın teatr həyatında vəziyyət olduqca ağır idi. Mollalar və din xadimləri cəmiyyətin irəliləyişinə mane olaraq, tamaşa hazırlayanları; rejissorları, aktyorları təhqir edir, onları şərlatan adlandırırdılar. Belə bir dövrdə fəaliyyətə başlayan Hüseyn Ərəblinskinin həyatı, bir şəxsiyyət kimi formalaşmasında çox çətinliklərlə üzləşmişdir. Məşq etmək üçün otaq tapmayan, tamaşa göstərmək üçün binası olmayan bir dövrdə yaşayan Ərəblinski bu çətinliklərə baxmayaraq mollalarla, din xadimləri ilə mübarizə edərək teatrı var qüvvəsi ilə yaşadırdı və onu ən yüksəkdə duran sənət adlandırırdı.

Ərəblinskini evinə barışıq üçün çağıran, onu öldürmək qərarına gələn dayısı Salman ona içki təklif edirdi. Ondan rədd cavabı aldıqda deyirdi: "Necə içmirsən. Heç elə şey olar? Artist olasan içməyəsən? Balam, elə siz artistliyə bu içkinin xatirinə gedirsiniz ki....

Hüseyn: Yanılırsınız. Artist millətin ən qabaqda gedən mədəni nümayəndəsi deməkdir. Teatr böyük mədəniyyət məktəbidir. Mən elə bir teatr məktəbi yaradacam ki, bütün dünyada parlayacaq. Mən daha içmirəm. Artist sərxoş demək deyil" (Sabit Rəhman, Hüseyn Ərəblinski, 1949: 225).

Sabit Rəhmana görə, dramaturq və teatrın birgə işi yaxşı tamaşa yaradılması üçün əsas şərtlərdən biridir. Bu silsilədən olan əsərləri içərisində Sabit Rəhmanın "Teatr və həyat" pyesində tamaşanın yaxşı alınması üçün üç vicdanlı şəxsiyyətin; dramaturq, rejissor, tənqidçi və müəllimin söhbətindən danışılır.

Pyesdə dramatik hərəkət və mübarizə deyil, mühakimə və mübahisə əsas yer tutur. Dramaturqun pyesi tamaşaya qoyulandan bir ay sonra salonda "üç cüt bir tək adam" olmasının səbəbini dramaturq və rejissor hərəsi bir cür izah edir. Tənqidçi həm dramaturqu həm də rejissoru tənqid edir.

Nə dramaturq nə də rejissor tənqidçinin fikirləri ilə razılaşmırlar. Tənqidçi isə deyir: "Siz çox nahaq məndən inciyirsiniz, dostlar! Düzdür, məqaləm kəskindir, hər ikinizi çox kəskin tənqid eləmişəm, ancaq neyləyim, həqiqətdir. Məncə, sizi ancaq kəskin tənqid həyata yaxınlaşdıra bilər" (Sabit Rəhman, Hüseyn Ərəblinski, 1949: 242).

Onların söhbətinə qoşulan xeyirxah müəllim isə onların hər üçünün yanlış yolda olduğunu bildirir və onlara öz məsləhətlərini verirdi: "Biz tamaşaçılar səhnədə canlı insanı görmək istəyirik. Həyatda insanlar gülürlər, sevinirlər, işləyirlər, yeri düşəndə kədərlənirlər, ağlayırlar. Böyük məqsədlər, ideyalar arxasınca qoşurlar…Çünki siz həyatımızın fəal iştirakçısı deyilsiniz, təsvir etdiyiniz adamlarla həyatda tanış deyilsiniz…(üzünü tənqidçiyə tutaraq) Sən dramaturqun, rejissorun nöqsan buraxmağından sevinirsən. Sən onları öyrətmirsən, dost qələmi ilə tənqid etmirsən, sən onları ifşa eləyirsən, biabır eləyirsən. Yolun yanlış olduğu üçün nəticə də yanlışdır" (Sabit Rəhman, Hüseyn Ərəblinski, 1949: 247).

Bu məsləhətdən sonra yanlış yolda olduqlarını başa düşən dramaturq, rejissor, tənqidçi müəllimlərinin sözündən nəticə çıxararaq öz işlərini yenidən qurmağa başlayırlar.

"Teatr və həyat" pyesində yenədə müəllif cəmiyyətdə yaxşı bir şəxsiyyət kimi formalaşmasında, öz fikirlərində də dəqiqlik və düzgünlükfikirini irəli sürür. Sənətin gücü onun həyatla əlaqəsindədir. Pyesin sonunda qoca müəllim öz şagirdlərinə məsləhət verərək deyir: "Teatr və sənətə hər zaman həyatın gözüylə baxın" (Sabit Rəhman, Hüseyn Ərəblinski, 1949: 253).

## Nəticə

Bütün bu yazdıqlarımızı nəzərə alaraq deyə bilərik ki, S.Rəhman ədəbi fəaliyyətə başladığı ilk illərdən; felyeton, şeir, hekayə, povest və pyeslərində də xalqımızın öndə gedən problemlərin düşünür. "Molla Nəsrəddin" jurnalında S.Rəhmanın 1927-ci ildə üç felyetonu çap olunur: "Ordan - burdan", "Yetərə açıq məktub" və "Mərdəkandan". Müəllifin "Şirin bülbül", "Nəfəs pulu" hekayəsində, Adil İsgəndərovla birlikdə yazdığı "Partizan Məmməd" adlı pyeslərində də şəxsiyyət və cəmiyyət problemlərinə toxunur. "Hüseyn Ərəblinski" adlı pyesində aktyorun cəmiyyətdə bir şəxsiyyət kimi formalaşmasında başına gələn faciəli hadisələrdən söhbət açılır. O, öz qələmini teatr tənqidi sahəsində də sınamış "Bir evin sirri" və "Canlı meyit" tamaşaları haqqında yazdığı resenziyalar da bu problemi araşdırır və təhlil edir.

## Ədəbiyyat

1. Əhmədov, B. (2010). Sabit Rəhman: həyatı, mühiti, yaradıcılığı. Bakı: "Elm və təhsil", 296 s.
2. Plotkii, Z.A. (1965). O putyakh razvitiya russkoy satiry. Moskva, c.3.
3. Sabit Rəhman. (1958). Seçilmiş əsərləri. iki cilddə, I cild. Bakı: Azərnəşr, 180 s.
4. Sabit Rəhman. (1960). Seçilmiş əsərləri. iki cilddə, II cild. Bakı: Azərnəşr, 538 s.
5. Kərimov, İ. (1969). Sovet Azərbaycanının gənclər teatrı. Bakı: Azərnəşr, 173 s.
6. Kərimov, İ. (1978). Gənclik və gözəllik teatrı. Bakı: Yazıçı, 92 s.
7. Rəhimli, İ. (2013). Azərbaycan teatr antalogiyası. iki cilddə, I cild. Bakı: Azərnəşr, 597 s.
8. Rəhimli, İ. (2013). Azərbaycan teatr antalogiyası. iki cilddə, II cild. Bakı: Azərnəşr, 621 s.

9. Sabit Rəhman. (1945). Komediyanın başlıca xüsusiyyətlərindən biri. “Ədəbiyyat qəzeti” 30 iyun. № 129 (4328).
10. Sabit Rəhman. (1948). Gənc dramaturqların pyesləri haqqında. “Ədəbiyyat qəzeti” 10 iyul. № 114 (6512).
11. Səfiyev, A. (1978). Sabit Rəhmanın komediyaları. Bakı: “Elm” nəşriyyatı, 123 s.
12. Sabit Rəhman. (1949). “Bir evin sirri”. “Kommunist” qəzeti. 17 dekabr. № 305 (4120).
13. Sabit Rəhman. (1950). “Canlı meyit”. “Kommunist” qəzeti. 24 avqust. № 98 (2326).
14. Səfiyev, A., Sabit Rəhman. (1987). Dramaturqun komediya yaradıcılığı. Bakı: Yazıçı, 198 s.
15. Sabit Rəhman, Hüseyn Ərəblinski. (1949). Bakı: Azərnəşr, 103 s.


Göndərilib: 23.01.2024 Qəbul edilib: 31.03.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/22-26

**Zənfira Quliyeva**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
tarix üzrə fəlsəfə doktoru
zenfira.qulliyeva@mail.ru

# "FİRİDUN BƏY KÖÇƏRLİ YARADICILIĞINDA İCTİMAİ MƏSƏLƏLƏR"

**Xülasə**

Firudin bəy Köçərli 57 il ömür sürmüş və ömrünün 40 ilini millətin maariflənməsi və mədəni tərəqqisinə, savadsızlığın və geriliyin aradan qaldırılmasına, həsr etmişdir.

Firidun bəy Köçərli Azərbaycan maarifçisi, pedaqoq, ədəbiyyatşünas, publilist, Azərbaycan ədəbiyyatı tarixçiliyinin banisi hesab olunur. Ədib milli mətbuatın, milli ədəbiyyatın inkişafında çox böyük işlər görmüşdür. Firidun bəy xalqın qəflətdən ayılmasında, maarif, elm, mədəniyyətinin tərəqqisində mətbuatın rolunu xüsusi qiymələndirirdi. Məqalədə görkəmli ədibin həyatı və yaradıcılığı, dünyagörüşünü əks etdirən məsələlər işıqlandırılır.

***Açar sözlər:*** *ədib, publisist, pedaqoq, maarifçi, milli mətbuat*

**Zanfira Guliyeva**
Azerbaijan State Oil and Industry University
PhD in History
zenfira.qulliyeva@mail.ru

## "Social issues in the works of Firidun bey Kocherili"

**Abstract**

Firudin bey Kocherli lived for 57 years and devoted 40 years of his life to the education and cultural progress of the nation, the elimination of illiteracy and backwardness.

Firidun-bek Kocherli is considered an Azerbaijani educator, teacher, literary critic, publicist, and founder of the historiography of Azerbaijani literature. He did a great job of developing the national press and national literature. Firidun-bek especially appreciated the role of the press in the awakening of the people, and in the progress of education, science, and culture. The article highlights issues that reflect the life, work, and worldview of the outstanding writer.

***Keywords:*** *writer, publicist, teacher, educator, national press*

## Giriş

Fididun bəy Köçərli ömrünü millətin maariflənməsi və mədəni tərəqqisinə, savadsızlığın və geriliyin aradan qaldırılmasına, mövhumat və cəhalətə qarşı mübarizəyə həsr etmişdir.

F.Köçərli yaradıcılığı boyu bir çox istiqamət üzrə tədqiqatlar aparmışdır. Həm tərcüməçi, həm pedaqoq, həm tarixçi, həm də ki, gözəl bir folklorşünas kimi böyük işlər görmüşdür. F.Köçərli gənc yaşlarından insanların maarifləndirilməsi istiqamətində böyük fədakarlıqlar göstərmiş, milli və mənəvi dəyərlərin təbliği, milli mətbuatın, milli ədəbiyyatın inkişafında çox böyük işlər görmüşdür. Firidun bəy "Kaspi", "İrşad", "Tərəqqi", "İqbal" və s. qəzetlərlə əməkdaşlıq edərək dövrün problemlərini gündəliyə gətirmiş, eyni zamanda topladığı xalq yaradıcılığı nümunələrini də çap etdirirdi.

Bir daha qeyd etmək lazımdır ki, dövrünün demokratik ziyalıları kimi Firidun bəyi gənc yaşlarından xalqın maariflənməsi, mədəni yüksəlişi məsələləri düşndürürdü. O, xalqın qəflətdən ayılmasında, maarif, elm, mədəniyyətinin tərəqqisində mətbuatın rolunu xüsusi qiymələndirirdi.

Firidun bəyin əsərləri 1926, 1963, 1978-ci illərdə Bakıda nəşr etdirilmişdir. B.Nəbiyev, K.Talıbzadə, İ.Bektaşi və b. Firudun bəyin yaradıcılığını tədqiq etmişlər. Ədibin əsərləri

Azərbaycan Respublikasının Prezidentinin 12 yanvar 2004-cü il sərəncamı ilə 2 cilddə kütləvi tirajla dərc edilmişdir (Süleymanlı, 2008: 251).

***Həyat və yaradıcılığı***

Firudin bəy Köçərli 26 yanvar 1863-cü ildə Şuşa şəhərində ziyalı ailəsində anadan anadan olmuşdur. O, ibtidai təhsilini Mirzə Kərim Münşizadənin məktəbində aldıqdan sonra 1876-cı ildə atasının məsləhəti ilə Şuşadakı dördsinifli rus şəhər məktəbinə daxil olmuşdur. Daha sonra Zaqafqaziya Müəllimlər Seminariyasının Azərbaycan bölməsinin inspektoru A.O.Çernyayevskinin dəvəti ilə 1879-cu ildə Zaqafqaziya Müəllimlər Seminariyasına oxumağa getmiş və 1885-ci ildə həmin seminariyanı bitirmişdir (2). O, Seminariyanı bitirdikdən sonra İrəvan gimnaziyasına müəllim təyin edilərək Azərbaycan dili və şəriyət fənlərindən dərs demişdir. Firidun bəy Köçərlinin ilk məqalələri İrəvan gimnaziyasında çalışdığı illərdə işıq üzü görmüşdür. Onun müxtəlif mətbuat orqanlarında çap olunmuş məqalələrinin ana xəttini xalqının mənafeyi, onun maariflənməsi kimi problemlər təşkil edirdi (Abdullayeva, 2019: 56). F.Köçərli 1895-ci ildə İrəvanı tərk etmişdir.

Firudin bəy Köçərli 1897-ci ildən etibarən isə artıq məzunu olduğu Zaqafqaziya Müəllimlər Seminariyasının Azərbaycan bölməsində müsəlman dini üzrə şəriət müəllimi kimi pedaqoji fəaliyyətə başlamışdır (4).

1903-cü ildə "Azərbycan şairi Vaqifin həyatına dair", 1904-cü ildə "Ədəbiyyatımıza dair məltub" məqalələrini yazmışdır. 1904-cü ildə "Azərbaycan xalqının ədəbiyytatı" əsərini rus dilində çap etdirmişdir (Süleymanlı, 2008: 248).

*Firidun bəy Köçərili ədəbi şəxsiyyətlər, bədii əsərlər, dərslik və tərcümələr haqqında, qadın azadlığı, habelə məişət mövzularında onlarla maraqlı, aktual məsələlərə həsr edilmiş məqalələr müəllifi kimi dövrünün publisistlərindən biri hesab olunur* (Firidun bəy Köçərili, 2014: 4).

*Ədib "Şərqi-Rus" qəzeti ilə uzun müddət əməkdaşlığ etmişdir. 1904-cü ildə qəzetdə "Cavan müəllimlər", "Cəmiyyəti-xeyriyyə", "Ədəbiyyat", "Anton Çexovun hekayələrindən", "Ədəbiyyatımıza dair məktub", "Gözəl bir kitab", "Sülh və barışıq","Təbriknamələr", "Təəssüf", "Təzə kitab" adlı məqalələri nəşr edilmişdir* (Abdullayeva, 2019: 57).

Eyni zamanda, Firidun bəy "İrşad" qəzetində "Bir darülmüəlliminin kifayətmidir?", "Bir müəllimin bizə cəvabı (məqalə kənd müəllimlərinin öz vəzifələrini layiqincə yerinə yetirməmələri haqqında idi)", "Cavanşirdə kazakların rəftarı", "Ehtiyatlı olmaq kimə lazımdır? (Tiflisdə keçirilən erməni-müsəlman məclisi haqqında)", "Əqil əqildən ötkəm olar", "Qarabağda Cavanşir mahalının əhvalü övzasına dair" (şair Zakir haqqında), "Məişətimizə dair (bir para bəyanat)", "Məişətimizə dair: (Birtay buynuz öküz) (məqalə erməni-müsəlman qırğınından bəhs edir)", "Məişətimizə dair: Müsəlmançılıq", "Məişətimizə dair: (Qaranlıqda qalanlarımız) (Azərbaycan dövlət məmurlarının xalqa əziyyət verməlləri haqqında)", "Məişətimizə dair: (Yarımçıqlarımız): "Anlayanın nökəri, anlamazın quluyam, dad yarımçıq əlindən (Azərbaycan dövlət məmurlarının ozbaşınalığı haqqında", "Məişətimizə dair: El üçün ağlayan gözsüz qalar (Haşım bəy Vəzirovun həbs olunması haqqında)", "Məişətimizə dair: Əcəlsiz ölənlərimiz (Zülfüqar bəy Hacıbəyovun dəfni və kəndlərdə həkim qıtlığı haqqında)", "Məişətimizə dair: Təlim xeyir edənlərimizin cəzası (İrəvanda rus-müsəlman məktəbinin müdiri Haşım bəy Vəzirovla cəmaatının rəncidəliyi haqqında)", "Müəllimlər ictimainə dair: İşin ibtidası (Bakıda çağırılan müəllimlər iclası haqqında)", "Müəllimlər neçün Bakıya qayıdır", "Niyə müəllimlər kəndlərdən qaçırlar?", "Şuşa faciəsinə dair (Qarabağın erməni-müsəlman iğtişaşı nəticəsində viranə qalması haqqında)" "Vətən məhəbbəti", "Yenə müəllimlər kəndlərdən qaçırlar", "Rəhbər" qəzetində "C.Ə.Nəbati", "Ədəbiyyatımıza dair", "Seyid Əbdülqasım Nəbati", "Vaqif və Vidadi və bunların dostluğu" adlı, "Açıq söz" qəzetində "İdarəyə məktub" adlı məqalələr nəşr edilmişdir (Abdullayeva, 2019: 58).

Firudun bəy Köçərilinin arxivində müasirlərindən aldığı məktubların siyahısı saxlanılır. 1884-1919-cu illərdə məktubların ümumi sayı 900-dür (Talıbzadə, 2013: 6).

1884-1919-cu ilə qədər yazdığı məktublar 35 illik bir dövrü əhatə edir. Bu məktubların mövzuları ədəbiyyat, maarif məsələləri və mədəniyyət sahələrini əhatə edir. Firidun bəy, A.Şaiqə göndərdiyi məktubların birində yazırdı ki, «bizim bu əsrişumda ağzını açıb iki kəlmə söz

danışmağa da izn vermirlər. Görək bir vaxt olar bizim də ağzımız açılar, dərdlərimizi açıq söyləyərik» (Mirzəyeva, 2012: 32).

Göründüyü kimi, ədib məktublarında ictimaiyyəti narahat edən ən aktual məsələləri müzakirə edirdi.

Arxidə saxlanılan məktubları aşağıdakı kimi qruplaşdırmaq olar (Talıbzadə, 2013: 6)

*Məktublar*
*Eynalı bəy Sultanov-20;*
*C.Məmmədquluzadə-22;*
*N.Nərimanov -2;*
*M.Ə.Sabir-2;*
*Ə.Haqverdiyev-5;*
*Vəzirov-4;*
*N.Cavid-4;*
*H.Vəzirov-47;*
*Ü.Hacıbəyli-14;*
*Y.V.Çəmənzəminli-6;*
*Sultan Məcid Qənizadə-78*
*Ömər Faiq-23*
*Abdulla Şaiq 24 və.b.*

*Qeyd etmək lazımdır ki, Firudun bəy Köçərli Azərbaycan ədəbiyyatı tarixinə aid əldə etdiyi materialları məktublarla toplamışdı. Firudun bəyə Abdulla Şaiq arasında dostluq 1907-ci ildə başlamışdı.*

Daha sonra qeyd etmək lazımdır ki, Firidun bəy Köçərli müəllimliklə eyni vaxtda tərcüməçiliklə də məşğul olmuşdur. O, İrəvan gimnaziyasında çalışarkən qədim yunan filosofu Sokratın "Təlimati-Sokrat" kitabı nəşr edilir. Bu kitabın 1891-i ildə nəşrinə nail olur (Süleymanlı, 2008: 247).

Firidun bəy rus şairləri A.S.Puşkin və M.Y.Lermontovun şeirlərini azərbaycan dilinə, M.F.Axundzadənin "Aldanmış kəvakib" povestini rus dilinə çevirərək nəşr etdirmişdir.

Beləlikə ədibin publisistik və tənqidçilik fəaliyyəti İrəvan gimnaziyasında müəllimlik etdiyi dövrdən başlanır və sonrakı illərdə də davam etdirilir.

Firidun bəy 1908-ci ildə üçcildlik məşhur "Azərbaycan ədəbiyyatı" kitabını yazmışdır. Bu kitabda Firidun bəy 130-a qədər şair və yazıçının həyat və yaradıcılığından bəhs etmişdir.

F.Köçərli bütün Azərbaycanı gəzərək ədəbiyyata bəlli olmayan el şairlərinin, aşıqların yaradıcılığını toplayıb üçcildlik kamil bir əsər yaratsa da, maddi ehtiyac üzündən əsəri çap etdirə bilmirdi (Rzalı, 2010: 3).

Ancaq Firidun bəyin vəfatından sonra bu kitab üç dəfə böyük tirajla nəşr olunaraq ictimaiyyətə təqdim edilmişdir.

F.Köçərli 1911-ci ildə "Mirzə Fətəli Axundov", 1912-ci ildə "Balalara hədiyyə" kitablarını nəşr etdirmişdir. Qeyd etmək lazımdır ki, "Balalara hədiyyə" 1912-ci ildə Orucov qardaşlarının mətbəəsində çapdan buraxılmışdı (Qüdrətli ədəbiyyatşünas, folklor tədqiqatçısı Firidun bəy Köçərli, 2023: 13).

Firidun bəy Köçərili "Balalara hədiyyə "kitabının giriş hissəsində yazırdı ki, o, millət ki, öz tarixinin, dolanacağını, vətənini, dilini sevir bu qisim əsərləri kəmali sövq ilə və diqətlə cəm edib ziqiymət sərmayə kimi saxlayır və balalarının ilk təlim və tərbiyəsi onları öyrətməkla başlayır. Bunlara hədiyyə olaraq millətimizin yaratdığığı nağil və hekayələrdən, məsəl və tapmacalardan və bir çox mənazumələrdən bu məcmuəni tərtib qıldıq ki, onlar unudulub xatirələrdən çıxmasın. Fikrini davam etdirən Firidun bəy yazırdı ki, Qasım bəy Zakirin təmsilat mənzuməsi millətimizin məişətindən götürülmüş və onun dili ilə söylənmiş əsərlərdir (Firidun bəy Köçərli, 2012: 3). Deyilənlərlə yanaşı qeyd etmək lazımdır ki, məcmuəyə daxil olan ancaq "Tülkü və üzüm" təmsili ruscadan tərcümə olunmuşdur. Abbasağa Nazirin və Mustafa ağa Arifin və Mehdiqulu xan Vəfanın bir neçə əsərləri məcmuədə dərc olunmuşdur.

Firidun bəy kitabda cəmiyyətdə mövcud kəskin sosial təbəqələşmənin törədəcəyi ixtilaflarada bir məsəl ilə xüsusi olaraq işarət etmişdir. O, bir xalq məsələi ilə təbəqləşmənin aman və imanı aradan götrməsini qeyd etmişdir.

*Zülm ilə abad olan, ədl ilə bərbad olar.*

*Acın amanı olmaz, toxun imanı.*

Daha sonra qeyd edilməlidir ki, Firidun bəy 1913-cü ildə yazdığı “Ana dili” məqaləsi Azərbaycan dilinin saflığı uğrunda mübarizəyə həsr edilmişdi. Ensiklopedik biliyə malik görkəmli pedaqoq-alim Firidun bəy Köçərlinin araşdırmalarının başlıca istiqamətlərindən biri də Azərbaycan dilinin saflığı uğrunda mübarizə idi (Qaraoğlu, 2018: 15).

Daha sonra Firidun bəyin məişərimizə dair sisilə məqalələrinə yetirilməsi məsədəuyğun olardı. “Məişətimizə dair” silsilə məalələrinin birində Firidun bə yazırdı ki, “Müəllimlərin və səyi qeyrəti sayəsində çox qövm və tayfalar xoşbəxt olub ağ günə çıxıblar, şan və hörmət qazanıblar, dövlət və qüvvət kəsb ediblər. Keçən on doqquzuncu əsrin 70-ci sənəsində almanların firənglərə qalib gəlməyi onların müəllimlərinə isnad olduğunu təsdiq edib, qəti surətdə deyə bilərik ki, miləli-müxtəlifə arasında hər zaman və məkanda vüquə gələn hər qism dava və müharibələrdə xah siyasi olsun, xah iqtisadi və xah qeyri, qalib gələn tərəf müəllimləri sayəsində nüsrət tapmışlar və qalib gəlmişlər. Firidun Köçərli acınacaqlı vəziyyətə düşməyimizin səbəbini millətimizə qaydasınca təlim-tərbiyə verən müəllimlərimizin olmamasında görürdü.

*Maarif sistemində nöqsanlar, bürokratizm, çarizmin milli dilləri sıxışdırmaq siyasəti, müəllimlərin vəziyyəti məktublartda bu və ya digər şəkildə əks olunmuşdur.*

*Firidun bəy Köçərli Tiflisdə “Azərbaycan teatrının ədəbiyyatı” əsərini rus dilində nəşr etdirir. Ədidin yaradıcılığa başladığı illər Rusiyada ictimai-siyasi ziddiyyətlərin kəskinləşməsi ilə diqqəti cəld edir. Azərbaycanda milli şüur getdikcə qüvvətlənirdi. Bu illərdə Azərbaycanda, xüsusi ilədə Bakıda dramaturgiya, nəsr, nəzm, realizm üslubu ilə inkişaf edir, ədəbiyyat ideyaca zənginləşir, qəzet və jurnallar ana dilimizdə nəşr edilirdi. Firidun bəy Köçərli Azərbaycan ədəbiyyatı tarixinin sistemli şəkildə öyrənilməsinə maraq göstərir və silsilə məqalələrini, “Azərbaycan türklərinin ədəbiyyatı” əsərini, “Azərbaycan ədəbiyyatı tarixi materialları” əsərlərini yazır* (Quliyev, 2023: 72).

Firidun bəy Köçərlinin xidmətlərindən biri çox əsrlik Azərbaycan ədəbi irsinin toplnlması, sistemli və ardıcıllıqla öyrənilərək “Azərbaycan ədəbiyyatı” əsərində xalqın istifadəsinə təqdim edilməsi olmuşdur (Köçərli, 2005: 4).

Firidun bəy Köçərli Azərbaycan ədəbiyyatşünaslığı tarixində ilk dəfə olaraq ədib və şairlərimizin böyük əksəriyyətini əhatə edən ədəbiyyat tarixini yazmışdır. Bu əsərdə Azərbaycan ediblərin yaradıcılığı, onların böyük bir qisminin bioqrafiyası, yaradıcılıqları haqqında müəllif fikri söylənilmişdir (Xəlilzadə, 2013: 2-4). Əəsərdə Gəncə, Samaxı-Şirvan, Şuşa-Qarabağ və digər Azərbycna şəhərləri, həmin şəhərlərin ədəbi mühiti və şairləri, şairlərin fikirləri haqqında məlumatlar verilir.

Firidun bəy yazırdı ki, nə qədər bir qovm və tayfa elmsiz və mərifəsiz olsa bir o qədər onun ədəbiyyatı zəif və biməzmun olcaqdır. Hətta çox tayfalar vardır ki, vəhşiyana yaşayıb ədəbiyyat nə olduğunu bilməzlər. .... tərəqqi və səadət fikrində olan millət ... gərək ən əvvəl öz ana dilinin vüsət və qüvvət tapağına səy və himmət göstərsin (Köçərli, 2005: 45).

*Dəyərləndirmələrini qeyd edilən istiqamətdə davam etdirən Firidun bəy yazırdı ki, Ərbabi-danış və kamala məlumdur ki, hər bir millətin sə` n və əzəmnətinə, tərəqqi və səadətinbə bais solan səbəblərdən birisi də onun ədəbiyyatıdır. Ədəbiyyat millətin aineyi – həqiqətnüməsıdır, onun maddi və mənəvi tərəqqisini və istiqablı üçün nicat və səadət yollarını eynilə göstərir. Ədibi fazil və şairi – qabil millətin maarif xadimləridir* (Köçərili, 2005: 44).

Firidun bəy Köçərli 1918-ci il fevralın 14-dən mayın 27-dək Zaqafqaziya Seyminin müsəlan fraksiyasının, 1918-ci il mayın 27-dən fasilələrlə dekabrın 7-dək olan müddətlərdə Azərbaycan Milli Şürasının üzvü olmuşdur. Zaqafqaziya Seyminin müsəlan fraksiyasının 1918-ci il martın 16-da keçirilmiş ilk müstəqil iclasında “Musavat” partiyası və demokratik bitərəflər qrupundan Firidun bəy Köçərli Seymin kitabxana komissiyasına seçilmişdir (2).

Azərbaycan Xlaq Cümhuriyyəti dövürndə Xalq Maarif Naziri N.Yusifbəylinin 12 oktyabr 1918-ci il tarixli 39 №li əmri ilə Zaqafqaziya Müəllimlər Seminariyasının keçmiş inspektoru Firudun bəy Köçərli 1918-ci il oktyabrın 1-dən Qazax Müəllimlər Seminariyasının direktoru təyin edilir (2).

1919-cu ildə Müsavat partiyasının Qazaxda partiya şöbəsi yaradılır. Firidun bəy şöbənin sədri seçilir (Kaspi maarifçilik meydanı, 2016: 384).

1918-1920-ci illərdə Qazax Müəllimlər Seminariyasının müdiri işləyib (17).

## Nəticə

Firidun bəy Köçərli Gəncə üsyanı yatırıldıqdan sonra XI ordunun xüsusi şöbə rəisi tərəfindən 1920-ci ildə, 58 yaşında güllələnərək dünyasını dəyişir (18). O, 1920-ci ilin mayında Qazax kommunistləri Köçərlini və digər "Müsavat" funksionerlərini "xalqa xəyanətdə", "milli nifaq törətməkdə", "torpaq və mülk zəbt etməkdə", general-qubernator Ə.Xoyskinin etibarlı şəxsləri olmaqda ittiham etdilər. Qazax İnqilab Komitəsinin Gəncə Fövqəladə Komitəsinə təqdimatına əsasən, ədib həbs edildi, 20-ci diviziyanın 7-ci xüsusi bölməsi xüsusi şöbəsində şahidlər dindirilmədən, verilmiş izahatlar nəzərə alınmadan güllələnməsi haqqında qərar çıxarıldi və hökm yerinə yetiridi (19).

## Ədəbiyyat

1. Süleymanlı, Ş. (2008). Azərbaycan ədəbiyyatı ensiklopediysı (ən qədim dövrlərdən 1920-ci ilədək). Bakı: "Nağıl evi", I, s.247-414.
2. https://www.ens.az/az/firidun-bey-kocerli
3. Abdullayeva, S.E. (2019). Firidun bəy Köçərilinin publiistikası. Elmi inkişaf: nəzəri və təcrübi jurnal № 1, s.56-62.
4. http://azhistorymuseum.gov.az/az/news/430
5. Firidun bəy Köçərili. (2014). Biblioqrafiya. Bakı, 176 s.
6. Talıbzadə, K. (2013). Firudun bəy Köçərilinin Abdulla Şaiqə məktubları. Ədəbiyyat qəzeti-27 sentyabr, 6 s. https://www.anl.az/down/meqale/edebiyyat/2013/sentyabr/328376.htm
7. Mirzəyeva, A.R. (2012). F.Köşərlinin Abdulla yazılan məktubları yaradıcılı əlaqələrinin bir növü kimi. Bakı Universitetinin Xəbərləri, Humanitar elmlər seriyası. №4, s.31-38.
8. Rzalı, R. (2010). İşıq sevdalısı Firidun bəy Köçərli Azərbaycan - 13 iyul, 3 s. https://www.anl.az/down/meqale/azerbaycan/2010/iyul/127148.htm
9. Qüdrətli ədəbiyyatşünas, folklor tədqiqatçısı Firidun bəy Köçərli (160 illik yubileyi). (2023). F.Köçərli adına Respublika Uşaq Kitabxanası. Bakı, 105 s.
10. Firidun bəy Köçərli. (2012). Balalara hədiyyə. B., 75 s.
11. Qaraoğlu, F. (2018). Bakı xəbər. 19 sentyabr, 15 s. https://www.anl. az/down/ meqale/baki_xeber/2018/sentyabr/606169.htm
12. Quliyeva, S. (2023). Azərbaycan Xalq Cümhuriyyəti dövründə Azərbaycan ədəbiyyatı. Əlyazmalar yanmır. №1 (16), s.72-79.
13. Firidun bəy Köçərili. (2005). Azərbaycan ədəbiyyatı, iki cilddə, I cild. Bakı: "Avrasiya press", 560 s.
14. Xəlilzadə, F. (2013). Firidun bəy Köçərli-150 ədəbiyyat tarixçiliyi elminin banisi. Kaspi, 2-4 mart, 17 s. https://www.anl.az/down/meqale/kaspi_az/2013/mart/297198.htm
15. Kaspi maarifçilik meydanı. (2016). Bakı Zərdabi LTD MMC, 656 s.
16. https://edu.gov.az/az/news-and-updates/19261
17. https://www.anl.az/down/meqale/ses/2011/yanvar/153344.htm
18. https://www.anl.az/down/meqale/kaspi_az/2013/mart/297198.htm

Göndərilib: 08.02.2024 Qəbul edilib: 05.04.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/27-32

**Ramilə Nəsirova**
Azərbaycan Dövlət Dəniz Akademiyası
filologiya üzrə fəlsəfə doktoru
ramilefarajova@gmail.com

# MÜXTƏLİFSİSTEMLİ DİLLƏRDƏ FONETİK ANOMALİYALAR

**Xülasə**

Tipoloji və genetik münasibətdə bir-birinə ən uzaq müxtəlif dillərə aid faktların müqayisə edilməsi təcrübəsi göstərir ki, bu dillərdə eyni və oxşar hadisələr mövcuddur. Dillərin bu yöndə müqayisəli öyrənilməsi onların əksəriyyəti üçün xarakterik olan hadisələri və hər bir dilin xüsusiyyətlərini daha tam və dərindən öyrənməyə imkan verir. Başqa sözlə, dillərin müqayisəli öyrənilməsi müqayisəyə cəlb edilən dillərin daxili sistemininin təsvirini verməyə yardım edir. Müqayisə edilən dillərin qrammatik quruluşunda mövcud anomaliyalar istisna təşkil edir. Müxtəlifsistemli dillərdə bu tip fonetik anomaliyalar məqalədə tədqiqata cəlb olunmuşdur.

***Açar sözlər:*** *müxtəlifsistemli dillər, fonetik anomaliyalar, apofonasiya, ablaut, fonematik əvəzlənmələr*

**Ramila Nasirova**
Azerbaijan State Maritime Academy
PhD in Philology
ramilefarajova@gmail.com

## Phonetic anomalies in languages with different systems

**Abstract**

The experience of comparing the facts of different languages, which are most distant from each other in typological and genetic relation, shows that the same and similar phenomena exist in these languages. The comparative study of languages in this sense allows a more complete and in-depth study of the phenomena that are characteristic of most of them and of the peculiarities of each language. In other words, the comparative study of languages helps to describe the internal system of the compared languages. Anomalies in the grammatical structure of the compared languages are an exception. Such phonetic anomalies in languages with different systems are studied in the article.

***Keywords:*** *languages with different systems, phonetic anomalies, apophonation, ablaut, phonemic substitutions*

## Giriş

Ana dili Azərbaycan, yaxud rus dili olanlar, rus təhsilli azərbaycanlılar ingilis dili öyrənərkən, hər şeydən əvvəl nəzərə almalıdırlar ki, ingilis və rus dilinin sistemləri arasında böyük fərq vardır, ingilis və Azərbaycan dili isə müxtəlifsistemlidir. Baxmayaraq ki, struktur planda ingilis və rus dili arasında oxşar cəhətləri (Məsələn, eyni nitq hissələrinin olması, bir çox qrammatik kateqoriyaların üst-üstə düşməsi, struktur-semantik paralellərin mövcud olması və s.) də qeyd etmək olar. Lakin bu iki dildə eyni bir fikrin ifadə vasitələri zamanı ingilis nitqinin başa düşülməsində diqqəti cəlb edən çətinliklər üzə çıxır. Qrammatik anomaliyalardan söhbət getdikdə vəziyyət dəfələrlə dərinləşir, baxmayaraq ki, ingilis və rus dili qohum dillərdir – Hind-Avropa dil ailəsinə daxildir. Ural-Altay makro dil ailəsinə daxil olan Altay ailəsinə və Altay dilləri ailəsinə daxil olan türk dillərindən biri – Azərbaycan türkcəsinə gəlincə isə, bu dili ingilis dili ilə müqayisə edərkən cüzi oxşarlıqlar müşahidə etmək olur. Bu oxşarlıqlar dil universaliləri olub linqvistik-tipoloji mahiyyət daşıyır.

Məlumdur ki, bir dildən digərinə tərcümə zamanı, xarici dilin öyrənilməsi prosesində dil öyrənən müəyyən mərhələdə daşıyıcısı olduğu dilin quruluşunun təsiri altında olur, yəni həmişə

öyrənənin ana dilinin sistemi həmişə ona təsir göstərir. Söhbət öyrənənin şüurunda üç dilin quruluş və sisteminin təmasından gedirsə, psixoloji olaraq, bu dillərin müxtəlif səviyyələrində müqayisəsi baş verir. Öyrənən, şüuraltı olaraq, özü üçün qrammatik səviyyədə uyğunluqlar sistemini tutmaq istəyir.

Yuxarıda göstərilən səbəblərə görə, bu zaman ingilis və rus dilinin qrammatik quruluşunda, müxtəlif səviyyələrində qaydalarda istisnaların çoxluğu, müxtəlif anomaliyaların mövcudluğu, xüsusilə rus dilində sistemsizliyin sistemlilikdən çox olması xüsusiyyətlərini əhatə edən materiallar toplanmışdır. Bu deyilənlər Azərbaycan dilinə aid deyil. Bütün türk dillərində olduğu kimi, Azərbaycan dilinin qrammatikası bütün səviyyələrdə öz sistemliliyi və stabitliyi ilə seçilir. Azərbaycan dilinin qrammatikası yüz illər ərzində, belə demək olarsa, cüzi dəyişikliklərə məruz qalmışdır. Bu da, əsasən, leksik və fonetik dəyişikliklərdə baş vermişdir. Azərbaycan dili başqa dillərin təsirinə məruz qalmamışdır. Əksinə, alınma elementlər Azərbaycan dili zəminində, qrammatik qayda və qanunlara əsasən assimilyasiya olaraq, “vətəndaşlıq” statusu almışdır.

Anomaliyalardan, başqa sözlə, qrammatik qaydalarda istisnalardan danışarkən, işin həcmini nəzərə alaraq, dissertasiya işində müqayisə edilən müxtəlifsistemli dillərin (Azərbaycan, ingilis və rus) yalnız morfoloji səviyyələrindəki anomaliyalardan və yeri gəldikcə, morfoloji anomaliyalara yol açan fonetik anomaliyalardan bəhs edirik.

Qohum olmayan dillərin müqayisəli-tipoloji aspektdə araşdırılması nəticəsində əldə edilən nəticələrin öyrənilən xarici dil ilə ana dilinin tutuşdurulmasında xarici dili tədris edənlər, xarici dil tərcüməçilərinin hazırlanması üçün böyük əhəmiyyəti var. Belə ki, kontrastiv tutuşdurma iki dilin, xüsusilə qohum olmayan müxtəlifsistemli dillərin, eləcə də ana dilinin dərindən başa düşülməsinə imkan yaradır (Kubryakova, Kharitonchik, 1976: 8).

Bu fəsil üç dilin: Ural-Altay makroailəsinə daxil olan türk dilləri ailəsinin oğuz qrupu türk dillərindən biri – Azərbaycan dilinin, hind-Avropa dilləri ailəsinin german dilləri qrupuna daxil olan – ingilis dilinin və hind-Avropa ailəsinin şərqi slavyan dilləri qrupuna daxil olan rus dilinin qrammatik qaydalarındakı istisnaların müqayisəsinə və təhlilinə həsr olunmuşdur.

Bu fəsil müasir Azərbaycan, ingilis və rus dillərində morfoloji qrammatik anomaliyaların sistemli müqayisəli-tipoloji təhlilinə həsr olunduğu üçün bu dillərə aid nəzəri ədəbiyyatın icmalını verməyə ehtiyac duyulmur və müqayisəyə cəlb olunmuş əsas faktik material bu dillərin normativ qrammatikalarından götürülmüşdür. Bəzi hallarda nəzəri ədəbiyyatdan da istifadə olunmuşdur.

İki dilin müqayisəsini V.N.Yartseva kontrastiv (qarşılaşdırma – R.N.) müqayisə adlandırır. Bu termini o belə izah edir: “Ümumi tipologiya və kontrastiv qrammatika arasında əsaslı fərq ondadır ki, ümumi tipologiya, vəzifəsinə görə, iki dildə, maksimal sayda, mövcud olan müxtəlif tipoloji səciyyələri araşdırdığı halda, kontrastiv qrammatikanın obyekti həmişə iki dil olur” (Yartseva, 1981: 31). Deyilənləri nəzərə alaraq, bizə belə gəlir ki, üç dilin – Azərbaycan, ingilis və rus dillərinin müqayisəli tipologiyasını tutuşdurma tipologiyası adlandırsaq, daha dəqiq olar. Belə ki, bu işdə biz üç dilin materialları əsasında qrammatik hadisələri tutuşdurma yolu ilə müqayisə edəcəyik.

Müxtəlifsistemli üç dilin – Azərbaycan, ingilis və rus dilinin tutuşdurulması müqayisəli-tipoloji planda maraqlı nəticələr verə bilər. Birincisi, müxtəlifsistemli bu üç dilin yaranmasının və inkişafının araşdırılmasında, ikincisi, bu dillərin tədrisi və öyrənilməsi işində, üçüncüsü, bu qəbildən olan tədqiqatların nəticələrindən, ümumiyyətlə, tərcümə nəzəriyyəsində və praktikasında, xüsusilə maşın tərcüməsində istifadə etmək olar. Təsadüfi deyil ki, V.N.Yartseva bu barədə belə yazır: “Qeyd etmək lazımdır ki, ənənəvi olaraq, flektiv quruluşa qarşı qoyulan analitik quruluş iltisaqi dillərin materialına qarşı qoyulanda başqa mahiyyət özünü göstərir. Analitizm elementi iltisaqi, flektiv, yaxud inkorporativ səciyyəli dillərin morfologiyasında fərqli mahiyyət daşıyır” (Yartseva, 1981: 105).

Üç müxtəlifsistemli dildə qrammatik anomaliyaların, başqa sözlə, qrammatik qaydalardakı istisnaların tutuşdurma metodu ilə təhlilinə başlamazdan əvvəl bu dillərin mənşəyi, yaranması, inkişafı, formalaşması barədə qısa tarixi ekskurs və eləcə də, qrammatik quruluşu barədə məlumat vermək mövzu ilə əlaqədar olaraq məqsədəuyğundur. Sözügedən tarixi ekskurs Azərbaycan, ingilis

və rus dillərinin sistem və strukturu barədə məlumatları yaxından nəzərdən keçirməyə imkan yaradar və bu dillərdə anomal qrammatik cəhətlərin meydana gəlməsinə səbəb olmuş amilləri, o cümlədən, fonetik amilləri müəyyənləşdirməyə imkan yaradar.

Apofonasiyanın digər bir adı ablautdur. Ablaut (alman dilində **ablaut**) — səsləri morfoloji cəhətdən (kökdə sait foneminin dəyişməsi) eyni köklü sözlərdə və ya bir sözün müxtəlif formalarında səs dəyişməsi ilə şərtlənir. Məsələn, alman dilində *binden — band — gebunden* buna misal ola bilər.

"Söz tərkibində hər hansı bir fonetik dəyişkənlik düzxətli aktdır. Fonem sisteminin yenidən qurulması, fonetik təkamül və s. mürəkkəb xarakterli amillər, bütöv reduksiyalar buna misal ola bilər. Bu zaman müxtəlif xarakterli dil əvəzlənmələri, yəni qovuşma, hissələrə ayrılma və s. kimi növlər üzə çıxır. Beləliklə, dinamik keçid prosesi intralinqvistik və ekstralinqvistik səbəblərdən meydana gəlir və dildə tarixi reallıqları, gerçək prosesləri əks etdirir" (Gorbachevich, 1971: 48).

"Ablaut" termini ilk dəfə alman filoloqu Yakob Qrimm tərəfindən Hind-Avropa dillərinin, əsasən, german dilləri qrupunun qrammatik quruluşunu təsvir edərkən işlədilmişdir. Belə ki, bu hadisə german dillərində olduğu kimi, Hind-Avropa dillərində də mövcuddur. Lakin german dillərindən fərqli olaraq, Hind-Avropa dillərində apofoniya sözün bütün hissələrinə toxunur. German dillərində isə bu əsasən vurğulu hecaya aid olur. Qədim və müasir german dillərində bu hadisə özünü çox zaman qaydasız feillərdə biruzə verir. Məsələn: ingilis dilində: *wr**i**te — wr**o**te — wr**i**tten*; alman dilində: *n**e**hmen — n**a**hm — gen**o**nmen* və s.

Bu kimi əvəzlənmələr ümumhind-Avropa əvəzlənməsi olan *[ĕ] — [ē] — [ŏ] — [ō]* səslərinin əvəzlənməsi ilə izah olunur (Mamedova, 2002: 282).

Apofoniya və ya ablaut bir morfemin tərkibində saitlərin yerdəyişməsi və ya əvəzlənməsi, bir sözlə, əksər hallarda daxili fleksiya kimi çıxış edir: *sing — sang — sung* (ingiliscə mahnı oxumaq).

Alman və ingilis dilində olduğu kimi, rus dilində də eyni ilə bu hadisəyə təsadüf olunur.

Söz yaradıcılığında apofoniya hadisəsi Azərbaycan dili üçün o qədər də səciyyəvi deyil. Amma bəzi türk dillərində səs əvəzlənməsi hadisəsi söz yaradıcılığının bir növü kimi təhlil olunur. Bu hadisəni fonetik söz yaradıcılığı kimi də təhlil edənlər vardır. "Türkmən və özbək dilləri üzrə söz yaradıcılığının bu yolu, hətta xüsusi bir tədqiqat obyekti olmuşdur.

Ümumiyyətlə, səs əvəzlənmələri nəticəsində təbii ki, sözün variantları arasında fonetik fərqlər meydana çıxır. Bu baxımdan İ.Kazımov qeyd edir ki, səs əvəzlənməsi hadisəsi tarixi və pozision olmaqla iki qrupa ayrılır və eyni zamanda sözün formasını və ya mənasını dəyişmə xüsusiyyətinə görə fərqli funksiyalara görə də qruplaşa bilir" (Kazımov, 1999: 61).

Mahmud Kaşğari isə göstərirdi ki, səs əvəzlənməsi müxtəlif fonetik variantda olan sözləri məna cəhətdən fərqləndirir. Türkoloqlardan A.Q.Qulamov, A.A.Yuldaşev, S.B.Bizakov yeni sözlərin səs əvəzlənməsi nəticəsində yaranması barədə ayrıca tədqiqatlar aparmışlar (Gulyamov, 1954: 3-10). Məsələn, türk dillərində [a] və [e] saitlərinin əvəzlənməsi: *yalpak \\yelpak* (türk), *saçmak \\ seçmek* (türkm.), *kaynı \\ kəyne* (başq.), *ata \\ əti* (tat) və s.

Tarixən *bıç\\biç, biçik\\bitik* (kitab), *bıçkı\\biçmek* sözlərində də səs əvəzlənməsi hadisəsi baş vermiş və yeni sözlər yaranmışdır.

Qeyd edək ki, əvəzlənmə hadisəsi tarixən türk dillərində samit səslər arasında da özünü göstərmişdir: *tiqir \\ diqir, taymak \\ qaymak, tabşırmak \\ qovşurmak, duşak \\ quşak* (türkm.), *kaşık \\ kalak, çunnur \\ çunnul* (başq).

Lakin Azərbaycan dilində bu hadisə əsasında söz yaradıcılığı çox tək-tək hallarda təsadüf edilir (əgər bunu apofoniya adlandırmaq mümkünsə). Məsələn, "qurut"(maq) felinin sonunda olan [t] səsi [d] səsinə keçməklə qurudulmuş süzməni ifadə edən "qurud" sözünü formalaşdırır. S.Cəfərov öz kitabında bu kimi hallara uc<uç (c-ç) sözünü də aid edərək, qeyd edir ki, "kimi", "qədər" qoşmalarının sinonimi olan "-dək" qoşması vaxtı ilə bir şəkildə "-tək" şəklində işlənmişdir (Cəfərov, 1970: 153).

Azərbaycan dilində bu qəbil fono-morfoloji üsul haqqında söz açmazdan öncə Ə.Dəmirçizadənin bir fikrinə nəzər salaq. O yazır: "Azərbaycan dilində səsdüşümü, səsartımı olduğu kimi, səslərin dəyişilməsi və əvəz olunması hadisəsi də vardır. Qeyd etmək lazımdır ki, bu

hadisələr yalnız sözlərə şəkilçi artırıldığı zaman deyil, bir sözdən yeni mənalı başqa bir sözdüzəltmədə özünü göstərir. Məsələn: *uzun — uzanmaq, gödək — gödəlmək, alçaq — alçalmaq, sarı — saralmaq*" (Axundov, 1984: 206; Dəmirçizadə, 1984: 123).

Azərbaycan dilinin müasir vəziyyəti baxımından fonematik əvəzlənmələr hesab edilən bu faktlar həqiqi fonematik əvəzlənmə sayıla bilməz və düşünürük ki, bunlar daha sonra haqqında ətraflı bəhs edəcəyimiz konversiya nümunələrinə daha çox oxşayır. Beləliklə, apofonasiya hadisəsi haqqında bəhs edərkən, bununla bağlı Azərbaycan dilində vəziyyətin bir qədər fərqli olduğunu xüsusilə vurğulamalıyıq. Belə ki, dilimizdə vurğunun yeri sabit olduğundan eyni şəkildə yazılıb fərqli tələffüz edilən söz köklərinə rast gəlmək olmur. Azərbaycan dilində bu məqamda yalnız söz formalardan bəhs etmək mümkündür. Məsələn, –ma$^2$ inkarlıq şəkilçisinin vurğu qəbul etməməsi məqamı ilə bağlı dildə omoqrafları aydın müşahidə edə bilərik: "alma" (meyvə) və ya "alma" (almaq feilinin inkar forması) və s.

A.Axundovun qeyd etdiyi kimi, "İltisaqi dillərdən biri kimi Azərbaycan dilində, flektiv dillərdən fərqli olaraq fonematik əvəzlənmə yoxdur. ... qrammatik və leksik mənaların ifadə olunmasında başqa türk dillərində olduğu kimi bizim dilimizdə də monosemantik affikslər, yəni həm sözdəyişdirici, həm də sözdüzəldici şəkilçilər əsas rol oynayır. Fonetik asılılığa məruz qalmayan söz kökləri isə müxtəlif vəziyyətlərdə sabit və dəyişməz qalır. Bir sözlə, Azərbaycan dilində fonematik əvəzlənməni axtarmaq nəzəri cəhətdən doğru deyil.

Lakin bir çox amillər bizim dilimizdə fonematik əvəzlənmələrin tədricən özünü göstərməsi üçün müəyyən əlverişli şərait yaratmaqdadır" (Axundov, 1984: 88).

Ümumiyyətlə, türk dilləri üçün apofoniya daha çox dilin tarixi inkişaf yolunda izlənə bilər. Məsələn, "bən" sözünün "mən" şəklinə düşməsi, "dağ", "yaxmaq" sözlərini qumuq dilində "tav", "yavmaq" formasında, "palçıq" sözünün qazax dilində "balşıq", "pişik" sözünün tatar dilində "bışıq" şəklində işlənməsi buna misal ola bilər. Amma müasir dönəmdə bu hadisə bizdə sözyaratma vasitəsi kimi çıxış edə bilmir.

Alman dilində daxili fleksiya (ablaut və ya apofoniya) sözyaratma vasitəsi kimi söz kökünün saitlərinə təsir göstərir və söz kökündə müəyyən fonetik dəyişikliyə səbəb olur. Məsələn, *sitzen — sentzen, binden — band — debunden, die bind — den Band — der Bund* və s.

Alman dilindən fərqli olaraq ingilis dilində apofoniya aşağıdakı hallarda istifadə edilir:

1. İndiki və keçmiş zamanın diferensiasiyası zamanı: *give-gave ([i]//[ei]), take- took ([ei]//[u]), come-came ( [ʌ] // [ei] )* və s.
2. İndiki zaman forması ilə feli sifət II formasının fərqləndirilməsi zamanı: *sing — sung, write — written* və s.
3. Feili sifətlə feilin keçmiş zamanının fərqləndirilməsi zamanı: *came-come* (gələn) (Yartseva, 1981: 131). Bir məqamı da qeyd edək ki, ingilis dilində daxili fleksiya sözə hər hansı bir affiksin birləşməsindən qəti surətdə asılı deyil.

A.V.Şirokova müxtəlifsistemli dillərin tipoloji tədqiqatına həsr etdiyi araşdırmasında qeyd edir ki, ingilis dili analitik dil olmasına baxmayaraq, rus dili ilə müqayisədə qrammatik mənanın formalaşdırırlmasında (kəmiyyət, feil formaları) daxili fleksiyadan istifadə edirsə, rus dili bu zaman affikslərə müraciət edir (Shirokova, 2000: 139).

Yuxarıda göstərilən nümunələrdən görünür ki, apofoniya hadisəsində aparıcı rol seqmentlərin üzərinə düşür. "Seqment dedikdə, heca, söz, söz birləşmələri, sintaqm, ifadə və s. nəzərdə tutulur" (Mikhalev, 2005: 27). Supraseqmentlərə isə nitq seqmentlərinin üzvlənməsi (parçalanması) və birləşməsi aid edilir. Buraya tonun alçaldılması və ya yüksəldilməsi, vurğunun müəyyənləşməsi, pauza, temporal dəyişiklik və s. daxildir (Mikhalev, 2005: 28). Daha konkret şəkildə ifadə etsək, supraseqment vahidlərə vurğu və intonasiya daxildir. Supraseqmentlərin apofoniyasından bəhs edərkən qeyd etmək istərdik ki, söz yaradıcılığında bu hadisə daha çox söz vurğusu sabit olmayan dillərdə təsadüf edilir. Məsələn, ingilis dilində "present" sözü vurğunun və eyni zamanda "e" hərfinin [e] və ya [i] kimi tələffüz olunmasından asılı olaraq müxtəlif mənalı sözlər ifadə edir. Belə ki, [pri´zent] kimi tələffüz olunduqda "hədiyyə", [´preznt] kimi tələffüz edildikdə isə "iştirak etmək" və ya "hal-hazırda" anlamını ifadə edir. Eyni ilə bu kimi hadisəyə rus dilində də təsadüf

edilir. Məsələn, «замок» sözü vurğunun yerindən asılı olaraq mənasını dəyişir. Belə ki, [за΄мок] "qala", "qəsr", [замо΄к] isə "açar", "qıfıl" mənalarındadır.

A.Mahmudovun qeyd etdiyi kimi, E.D.Polivanovun təbirincə desək, sözün əlamətini müəyyənləşdirmək vurğunun payına düşür. Vurğu türk dillərində sözün fərlqəndirici xüsusiyyəti kimi də çıxış edir (Kurilovich, 1962: 58-63). Bu keyfiyyət vurğunun funksiyasına daxildir və o, supraseqment apofonasiyanı şərtləndirir.

Ümumiyyətlə, apofonasiyanın söz yaradıcılığında mövqeyi eyni köklü sözlərdə məna müxtəlifliyi və bunun əsasında da sözün fonetik qabığındakı fərqlilikləri ortaya qoymaqla müəyyən edilir.

Deməli, apofoniya E.Kuriloviçin qeyd etdiyi kimi, "morfoloji hadisə olsa da, fonoloji amillərdən asılıdır. Məsələn, liktós, klutós, pektós, settos - feldən düzələn zərflərdir və köklərində leiqˇ, kleuˇ, peqˇ və sed sözləri dayanır. Burada leksik şəkilçi kimi –tu şəkilçisindən istifadə edilir" (Kurilovich, 1962: 38). Beləliklə, müəyyən quruluşa malik söz köklərinə bu şəkilçinin əlavə edilməsi kökün səs qabığını da dəyişir (loiqˇ-o→lik-tó). Onu da qeyd edək ki, kök vokalizminin bu dəyişikliyi müstəqil morfoloji funksiyaya malik deyil. Müəllifin göstərdiyi kimi, o, bütün Hind-Avropa dillərində suffiksasiya və ya fleksiya ilə əlaqəlidir. E.Kuriloviç daha sonrakı müşahidələri əsasında belə bir qənaətə gəlir ki, ei<i apofoniyası bu qəbildən olan sözlərin hamısında müşahidə edilir (Kurilovich, 1962: 39-40).

Qeyd edək ki, bir çox səs əvəzlənmələri polifunksionaldır. Onlar həm sözdəyişmə elementi, həm də söz yaradıcılığı elementi kimi çıxış edə bilər. Morfonoloji vasitələr hesabına daha çox söz kökləri dəyişir. Şəkilçilərdə bu cür dəyişikliklər çox az təsadüf edilir.

Müqayisə olunan dillərin fonoloji sisteminin quruluşunda, ayrı-ayrı fonem qruplarının qarşılıqlı əlaqəsində, isimlərin qrammatik siniflərinin olması, yaxud olmamasında (məsələn, cins kateqoriyası), söz birləşmələri və cümlələrin quruluşunda ümumi cizgilərin olmasında, sözlərin morfoloji quruluşunun növlərində və s. aşkarlanmış tipoloji cəhətləri göstərmək olar.

Yuxarıda deyilənlərdən görünür ki, ümumi tipoloji araşdırmalar dilçilik araşdırmalarının sərhədlərini genişləndirməklə genetik baxımdan qohum dillərin çərçivəsindən çıxaraq müxtəlifsistemli və quruluşlu dilləri tədqiqata cəlb etməklə vacib ümumi dilçilik problemlərini həll etməyə geniş imkanlar yaradır.

Azərbaycan dilinin məlum tarixi boyu onun qrammatik quruluşunda cüzi dəyişikliklər baş vermişdir. Bu dəyişikliklər, əsasən, fonetik, leksik səviyyələrə aiddir və minillik tarix üçün normaldır.

## Nəticə

Bütün bunlar belə bir nəticə çıxarmağa əsas verir ki, apofoniya fono-morfoloji hadisə olmaq etibarı ilə tarixi xarakter daşıyır. Bu morfoloji üsul analitik və flektiv dillərdə dilin qrammatik strukturunda əsaslı mövqeyi ilə seçilən felin zaman və növ kateqoriyalarının yaranmasında müstəsna rola malikdir. İltisaqi dillərdə isə bu hadisəyə nadir hallarda təsadüf edilməsinə baxmayaraq, bu dillərdə apofonasiyanın mövcud olmamasını qəti şəkildə iddia etmək doğru olmazdı.

## Ədəbiyyat

1. Kubryakova, Ye.S., Kharitonchik, Z.A. (1976). O slovoobrazovatel'nom znachenii i opisanii smyslovoy struktury proizvodnykh suffiksal'nogo tipa. – Printsipy i metody semantichesktkh issledovaniy. M., «Nauka», s.202-232.
2. Yartseva, V.N. (1981). Kontrastivnaya grammatika. M.: «Nauka», 112 s.
3. Gorbachevich, K.S. (1971). Izmeneniye norm russkogo literaturnogo yazyka. Leningrad, «Prosveshcheniye», 270 s.
4. Mamedova, E. (2002). Slozhnyye slova v russkom i azerbaydzhanskom yazykakh. Baku: «Adilogly», 282 s.
5. Kazımov, İ.B. (1999). Axısqa türklərinin dili. Bakı: "Elm", 278 s.

6. Gulyamov, A. (1954). K voprosu ob adverbializatsii v uzbekskom yazyke. Uch. zap. Tashkentskogo gos. Ped. Inst. -ta im. Nizami. Fil. sb., s.3-10.
7. Cəfərov, S. (1970). Müasir Azərbaycan dili (Leksika). Bakı, 182 s.
8. Axundov, A.A. (1984). Azərbaycan dilinin fonetikası. Bakı: “Maarif”, 391 s.
9. Dəmirçizadə, Ə. (1984). Müasir Azərbaycan dili. Bakı: “Maarif”, 312 s.
10. Shirokova, A.V. (2000). Sravnitel'naya tipologiya raznostrukturnykh yazykov (fonetika, morfologiya). Moskva: «Dobrosvet», 200 s.
11. Mikhalev, A.V. (2005). Obshcheye yazykoznaniye: istoriya yazykoznaniya. Moskva: «Flinta: Nauka», 240 s.
12. Kurilovich, E. (1962). Ocherki po lingvistike. Moskva: «Inostrannaya literatura», 456 s.

Göndərilib: 21.01.2024 Qəbul edilib: 29.03.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/33-39

**Tuqay Əsədli**
Ərciyes Universiteti
magistrant
tuqay430@gmail.com
**Erhan Yoska**
Ərciyes Univeristeti
tarix elmləri üzrə fəlsəfə doktoru
eyoska@erciyes.edu.tr

# SOVETLƏŞDİRMƏ SİYASƏTİ DAXİLİNDƏ TÜRKÜSTAN COĞRAFİYASINDA BAŞ VERƏN DƏYİŞİKLİKLƏR

**Xülasə**

XIX əsrin ortalarında Rusiya Çarlığı tərəfindən tamamilə ələ keçirilən Türküstan coğrafiyası mühüm stratejik əhəmiyyətə malik, zəngin təbii qaynaqları olan və dünya hegemoniyası uğrunda mübarizə aparan hər bir dövlətin əlində tutmaq istədiyi bölgələrdən biridir. XX əsrin əvvəllərində "yaşlı" imperatorluqlarda, o cümlədən, Rusiyada milliyətçilik və sosializm axımları sürətlə yayılmış, keçən əsrin sonlarından etibarən aclıq və səfalət içində yaşayan xalqın səbir kasası Yaponiya ilə olan müharbədə gələn məğlubiyyət xəbərləri ilə daşmışdı. "Oktyabr manisfesti"-nin qəbul olunması ilə Dumalarda təmsil olunmaq haqqı əldə edən "milli azlıqlar" cəmi 2 ildən sonra bu azadlığı da itirmişdilər. Dünya müharibəsi dövründə Türküstanda inqlabın ilk addımları atılmış, "Fevral burjua inqlabı"-dan sonra yaranmış vəziyyətə etiraz da elə "İyun üsyanı"-dan sonra-sentyabr ayında Daşkənd şəhərində baş vermiş üsyanla ilk dəfə Mərkəzi Asiyada özünü birüzə vermişdir. Bolşeviklərin hakimiyyəti ələ alması ilə xalq arasında özünə dayaq yaratmaq üçün keçirdiyi islahatlar müəyyən inkişafa yol açsa da,bolşeviklərin 70 illik propoqandasına çevrilmiş, günümüzə kimi davam edən siyasi hadisələr zincirinə birbaşa təsir etmişdir.

Məqaləni qələmə almaqda məqsədimiz Mərkəzi Asiyada bolşeviklərin, xüsusilə də "Millətlər komissarı" və daha sonra Bolşevik Kommunist Partiyası Mərkəzi Komitəsi Birinci katibi olan, SSRİ-ni avtoritariya ilə idarə edən Stalinin əmri ilə həyata keçirilən bu dəyişikliklərin araştırılması ilə günümüzdə bölgədə olan sərhəd, etnik, habelə sosial-mədəni problemlərin səbəbini tapmaqdır.Dövrün yazılmış əsərlər diqqətə alınaraq yazılan məqalədə "Ümumi baxış ilə qarşılaşdırmalı tarix metodu"-dan istifadə edilərək "Sovetləşdirmə siyasəti daxilində Türküstan coğrafiyasında dəyişimin mədəni və sosyal həyata təsirləri" mövzusunu aydınlatmaq hədəflənmişdir.

***Açar sözlər:*** *Sovet İttifaqı, Stalinizm, Türküstan, Cədidçilər, Bolşeviklər, reformasiya*

**Tugay Asadli**
Erciyes University
master student
tugay430@gmail.com
**Erhan Yoska**
Erciyes University
PhD in History
eyoska@erciyes.edu.tr

## Geography of Turkestan within Sovietation policy changes that have occurred

**Abstract**

Turkestan, which was occupied by Tsarist Russia in the middle of the 19th century, is one of the regions with important strategic importance, rich in energy resources and desired by every country

fighting for world hegemony. In the early years of the 20th century, in the "old" empires, especially in Russia, the currents of nationalism and socialism were rising rapidly, and the patience of the people living in hunger and misery since the end of the last century was broken with the news of defeat in the war with Japan. The "ethnic minorities" who had gained the right to be represented in the Duma with the "October Manifesto" lost this right only 2 years later. In the period of the World War - 1916, the first steps of the revolution were taken in Turkestan, and one of the first protests against the situation after the "February revolution" took place after the "July uprising", that is, in September in Tashkent, Turkestan. Although the reforms carried out by the Bolsheviks to create social support for themselves after the Bolsheviks came to power led to development among the people, it later evolved into a 70-year propaganda tool of the Bolsheviks and directly influenced the chain of events that continues to this day.

The main purpose of this article is to investigate this policy of the Bolsheviks in Central Asia, especially under the orders of Stalin, who first became the "Commissar of Nations", then the First Secretary of the Central Committee of the Bolshevik Communist Party and ruled the USSR in an authoritarian way, and to find out the reasons for the border, ethnic and socio-cultural problems in the region today. In the article, which was written using sources written in the period, it was aimed to illuminate the subject of "The effects of change on civil and social life in Turkestan geography within the Sovietisation policy" by using the "comparative history method with an overview".

***Keywords:*** *Soviet Union, Stalinism, Turkestan, Jadidism, Bolsheviks, Reform*

## Giriş

XX əsrdə Rusiya Çarlığında avtoritar hökümətin içində olduğu krizis pik səviyyəyə çatmışdı. 1917-ci ilin fevral ayında Çarın devrilməsiylə nəticələnən inqlabdan sonra hakimiyyət Müvəqqəti hökümətin əlinə keçmişdi. Bu hökümətin tərkibində inqlabın təkanverici qüvvəsi olan sol partiyalar az yer almış, xüsusilə də Bolşevik və Anarxistlər Petroqradın Sovetində hökümətə müxaliflik edirdilər. Hökümətin qısa müddətdə vəd etdiyi islahatları həyata keçirə bilmədiyi üçün müxalifət ilk öncə uğursuz "İyul üsyanı" ilə etirazlarını bildirmiş, yatırılmasına baxmayaraq General Kornilovla Kerenski hökümət arasında olan daxili çəkişmələr ölkəni "Oktyabr inqlabına" aparmışdı. Bu dövrdə yalnız mərkəzdə deyil, Orta Asiyada da vəziyyət qarışıq idi. Həm Müvəqqəti hökümət, həm də sovetlər köhnə Çarlığın torpaqlarında möhkəmlənmək üçün özlərinə dəstəkçi axtarır, ideologiyların müxtəlifliyi ilə seçilən bu bölgədə vəziyyət mürəkkəbləşirdi. İslahat tələb edən Cədidçilər, şəriətlə idarə olunmaq istəyən "İslamçılar", bolşeviklərə qarşı olan və silahlı dirəniş göstərən "Basmaçılar" bölgənin siyasi aktyorlarını yetişdiridi. "Oktyabr inqlabı"-dan sonra ucqar yerlərdə də hakimiyyəti ələ almağa çalışan sovet hökümətinin planlarını tamamlamasına 1917-1920- ci illərdə qırmızılar ilə ağ qvardiyaçılar arasındakı vətəndaş müharibəsi əngə oldu. Çünki bu dövdə Ağ qvardiyaçılar tərəfindən ələ keçirilən Sibir coğrafi olaraq bolşevik Petroqrad ilə Türküstanın əlaqəsini kəsmişdi. Daxili müharibə dövründə Lenin və Troçki ilə birlikdə Stalin də atdığı addımlar ilə ön plana çıxmış, bu yol onu SSRİ rəhbərliyinə aparmışdı. Sovet hökümət köhnə hökümətlərə nisbətən vədlərini yerinə gətirir, ona görə də xalqın bir qismi onları dəstəkləməyə başlayırdı. Müharibədən sonra "Yeni İqtisadi Siyasət"-i həyata keçirən bolşeviklər türküstanlıları bu mövzuda məmnun edə bilməmişdi. Buna baxmayaraq 1922-ci ildə Türküstan RSFSR tərkibində SSRİ-yə daxil olmuşdu. Stalin bu dövrdə "Sovet İttifaqı" fikrinə müxalif olmuş, lakin Leninin israrı nəticəsində liderlər bu fikrə ortaq olmuşdular (Keller, 2022).

Stalinin 1924-1953-cü illərdəki siyasətinə nəzər saldıqda SSRİ qurulmadan əvvəl və qurulduqdan qısa bir müddət sonra "Millətlər Nazirliyi" komissralığı vəzifəsinin ona böyük təsiri olduğunu görə bilərik. Bu dövrdə aparılan islahatlar böyük əhəmiyyət daşıyır, belə ki, üzərindən 100 il keçmiş olsa belə, nəticələrini görmək mümkündür. Sistemin qurucularının özləri də etiraf edirlər ki, avam camaata sosializm ideologiyasını aşılamaq olduqca çətin idi. Üstəlik bu dövrdə milliyətçilik anlayışı özünün ən üst mərhələsini yaşayırdı. Xüsusilə də iki dünya müharibəsi arasındakı periyodda bu ideologiyanın əleyhinə olan sosyalistlərin də daxilindən milliyətçi qruplar peydah olmuşdu (Misal üçün, Nasistlər). Bu qədər qarışıq br dövrdə fərqli etnik mənsubiyyətə

malik insanlara totalitar idarəçilik üslubu ilə rəhbərlik edən Stalin "milliyətçilik" analyışı ilə savaşmaq bir yana, bu anlayışdan istifadə edərək özünə "İdeal Sovet vətəndaşı" modelini yaratmışdır və bunun üçün iqtisadiyyatı, elmi, mədəniyyəti istifadə etmişdir (Oliver, 2009).

Nəticə etibarı ilə məqalədə 19. əsrdə Rusiya Çarlığının işğal etdiyi bölgənin tarixin inkişafı nəticəsində 20. əsrin əvvəllərində reformasiya hərəkatlarına yuva olması və bunun nəticəsi olaraq bu coğrafiyada müxtəlif ideologiyaların hakimlik etməsi, lakin Oktyabrda baş verən inqlabdan sonra demokratik sistemin pozulması ilə Türküstanda da Bolşevik ideologiyasının təbliğinin aparılması, bölgədə bu ideologiyanı anlayacaq yetərli elmi-mədəni zəminin formalaşmaması nəticəsində xüsusilə, 1922-ci ildən sonra aparılan reformasiyalar nəticəsində Stalinin ölkələrin etnik kimliklərini öz xeyirlərinə istifadə etmək üçün onların milli-dini dəyərlərini yansıdacaq hər şeyin qadağan edildiyini (Azərbaycanda bunun təsirini Dədə Qorqud kimi xalq dastanının qadağan olunması ilə görə bilərik), sistemə qarşı olanların, fərqli düşüncəyə sahib insanların cəzalandırıldığı, "Böyük Terror" deyə tarixə keçən dönəmdə xalq aydınalarının bir çoxunun güllələndiyi nəticəsi əldə edilmişdir.

**Mərkəzi Asiyanın bolşeviklər tərəfindən ələ keçirilməsi.**

1917-ci il fevral ayında baş vermiş inqlab nəticəsində Çar taxtan endirildi və Milli Məclis üçün seçkilər keçiriləné kimi onun yerinə Müvəqqəti Hökümət ölkənin idarəsini ələ aldı. Ölkənin mərkəzində baş verən bu dəyişikliklər nəticəsində Çarın Mərkəzi Asiyaya təyin etdiyi nümayəndəsi Kuropatkin vəzifəsindən azad edildi, onun yerinə isə "Türküstan İdarə Komitəsi" quruldu. Bu qurum ilə yanaşı eyni Petroqradda olduğu kimi alt təbəqənin mənafeyini müdafiə edən "İşçi, kəndli və əsgər soveti" yaradıldı və onlar da idarəçiliyin müəyyən hissəsini ələ almaq üçün çalışmağa başladı. İlk illərdə yerli xalqın nümayəndələrindən heç kimi idarəçilikdə söz sahibi deyildi (Sadıkov, 2020: 16-27). Müvəqqəti Hökümətin inqlabdan sonra verdiyi vədləri yerinə yetirməkdə ləngiməsi səbəbilə paytaxtda bolşeviklərin rəhbərliyi ilə baş vermiş "İyul üsyanı"-nın bənzəri 1917-ci ilin sentyabr ayında Daşkənd sovetinin rəhbərliyi ilə baş verdi, lakin üsyan yatırıldı. Oktyabr ayında baş verən inqlabdan sonra isə ilk vaxtlarda bütün köhnə Çarlıq torpaqlarında olduğu kimi hökümət bolşeviklərin əlinə keçdi. Mərkəzi Asiyada Daşkənddə toplanan III Regional Sovet Konqressində "Türksovnarkom", yəni Türküstan Xalq Komissarları Soveti yaradıldı, yerli xalqın nümayəndələrinin də iştirak etdiyi bu qurumun lideri F.Kolesov təyin edildi (Bregel, 2003: 94).

1917-ci ilin noyabrında Xokand şəhərində yaradılan Türküstan Muxtar Respublikası yerli müsəlman əhalinin iştirakı ilə eyni ilin may ayında yaradılmış Milli Mərkəz Şurası tərəfindən qurulmuş və bir növü "Türksovnarkom"-a rəqib olmuşdu. İlk aylarda bolşeviklər Rusyada gedən daxili müharibə nəticəsində hadisəyə müdaxilə edə bilməsə də, (Çünki ağ qvardiyaçılar Mərkəzi Asiya ilə Petroqradın coğrafi olaraq əlaqəsini kəsmişdlər) 1918-ci ilin yanvar ayında şəhər Qızıl Ordu tərəfindən ələ keçirildi, şəhərlər dağıdılıb, xalqın mal-mülkü yağmalandı, soyqırımlar həyata keçirildi. Təsadüfi deyildir ki, bu soyqırımlada erməni dəstələrinin xüsusi iştirakı qeyd edilir və bu hadisə 31 Mart 1918-ci ildə Azərbaycan xalqına qarşı edilən soyqrımla bənzərlik təşkil edir. Türküstanda bu zaman on min nəfərdən çox insann öldürüldüyü müəyyən edilmişdir. Bu hadisə yerli əhalidə işğalçı qüvvələrə qarşı mübarizə hissini oyatdı və 1930-cu illərə kimi davam edəcək məşhur "Basmaçılar" hərəkatının təməli elə bu zaman qoyuldu (Baumer, 2012: 174).

Bolşeviklər siyasi olaraq parçalanmış halda olan Mərkəzi Asiyanın müxtəlif bölgələrini hissə-hissə ələ keçirirdi. F.Kolesov Aşqabada gələrək "Transkaspian" bölgəsində Oraz Sərdarın liderliyində qurulan "Milli İdarə Şurası"-nı ləğv etdi və 1918-ci ildə bölgənin idarəsi Türksovnarkom tərfindən komissar Frolova tapşırıldı. Onun terror və təzyiq ilə həyata keçirdiyi idarəçilik xalqn səbir kasasını daşırdı, nəticədə komissar Qızıl Avrat deyilən yerdə öldürüldü. Hököməti yenidən əlinə alan yerli idarəçilik orqanıvə Oraz Sərdar bolşeviklərin Türküstandakı mərkəzi olan Daşkənddən gələ biləcək potensial hücum təhlükəsnə qarşı cənubda yerləşən Britaniya qüvvələrindən yardım tələb etdilər. General Mallensonun göndərdiyi cüzi yardım qarşılığında yerli xalqın dəstəyini itirən hökümət 1919-cu ilin mart ayında ingilislərin İrana doğru geri çəkilməsindən iki ay sonra- 1919-cu ilin may ayında müqavimət göstərə vilməyərək sovetləşdi (Everet-Heath, 2003).

Müvəqqəti Hökümətin devrilməsindən sonra 1917-ci ilin dekabr ayında Orenburq şəhərində toplaşaraq Alaş Orda hökümətini qurdular. Bölgənin digər hissəsini idarə edən bolşevik hököməti hakimiyyəti tamamilə ələ almağa çalışırdı. Lakin Rusiyanın daxilində baş verən vətəndaş müharibəsi nəticəsində ağ qvardiyacılar Kolçakın göstərişi və Ataman Dutov ilə Ataman Annenkovun rəhbərliyi nəticəsində hər iki hissəni ələ keçirib bölgənin mərkəz ilə əlaqəsini kəsdilər. Buna baxmayaraq, 1919-cu ilin iyul ayında yekun döyüşləri qazanan bolşeviklər idarəçiliyi tamamilə öz əlinə almağı bacardı (Bregel, 2003: 94).

1920-ci ilin əvvəllərinə nəzər salqdıqda Bolşeviklərin Mərkəzi Asiyada böyük direniş ilə üzrləşdikləri iki yer qalmışdı, Xivə və Buxara xanlıqları. "Gənc Buxaralılar" və "Gənc Xivəlilər" adı ilə tanınan Cədidçi qruplar bolşeviklərin geniş islahat tədbirləri keçirəcəklərini nəzərə alaraq onlara dəstək verir və xana qarşı çıxırdılar. Xivə xanı Cüneyd xan bu yolda olan hər kəsə qarşı sərt tədbirlər görmüş, onların bir çoxunu öz torpalarından sürgün etdirmişdi. Buxara xanı Alim xan isə bu dövrdə işğalçılıq məqsədilə hücum edən bolşevikləri geri püskürtməyi bacarmışdı (Baumer, 2012: 174). Lakin 1919-cu il boyunca xanlıqlarda baş verən çəkişmələr və Mərkəzi Asiya türklərinin bir-biri ilə mübarizə aparması və Cədidçilərin (Xivədə "Gənc Xivəlilər", Buxarada "Buxara İnqlab Komitəsi") General Frunzeni kömək üçün çağırmasından sonra 1920-ci ilin aprelində Xivə, 1920-ci ilin sentyabr ayında isə Buxara xanlığı ələ keçirildi. Xanlıqların yerinə Buxara və Xarəzm Muxtar Xalq Respublikaları yaradıldı. Devrilən Buxara xanı Əfqanıstana qaçaraq Basmaçı hərəkatına dəstək verməyə başladı.

Nəticədə sadəcə 3 il içərisində içində olduqları çətin siyasi şəraitə baxmayaraq bolşeviklər bölgəni işğal etdilər. Bolşeviklərin böyük çətinliklə üzrləşmədən Türküstanı ələ keçirməsinin bir neçə səbəbi var ("History of Civilizisations of Central Asia", 2005):

1. Mərkəzi Asiyanı öz hakimiyyəti altında birləşdirən güclü bir dövlətin olmaması, xüsusilə də xanlıqların düşmənə əhəmiyyət verməyərək öz aralarında mübarizə aparması.
2. İdeologiya baxımından Türküstanın parçalanmış olması, şəriət tələb edənlər, milliyətçilər, islahat tələb edən cədidçilərin ortaq nöqtə tapa bilmədən işğal üçün münbit şərait yaratmaları.
3. Türklərin silah və ordu baxımından ruslardan zəif olması, uzun müddətdir güclü orduya qarşı vuruşamamış olması.

Bütün bunlara baxmayaraq 1918-ci ildən etibarən torpaqları əllərindən alınan sahibkarlar ilə birlikdə bolşeviklərə qarşı mübarizə aparan Basmaçılar hərəkatı özünün ən pik həddini Ənvər Paşa dövründə yaşamış, 1930-cu illərə qədər davam edən direniş Türküstanın sovet hökümətinə qaşı mübarizəsini təmsil etmişdir.

**Sovetləşdirmə və islahatlar.**

XIX əsrin ortalarından etibarən Rusiya Çarlığına tabe bir şəkildə idare edilən Türküstanda əsrin başlarındakı siyasi vəziyyətin mürəkkəb olduğunu müşahidə edirik. Mövuzya giriş etmədən öncə bu barədə qısa məlumat verməyin doğru olacağını düşünürük. Rusya Çarlığının məmurları tərəfindən idarə edilən blgələrin xaricində feodal sistemin hakim olduğu Buxara və Xivə xanlıqları da mövcud idi (Allworth, 1990).

XX əsrin əvvəllərin Rusiya Çarlığının problemlərlə üzləşdiyi sahələrin başında "milli azlıqlar" məsələsi gəlirdi. 1905-ci ilin yanvarından başlanan və Rus-Yapon müharibəsində Çar rejiminin biyabırçılıqla məğlub olmasından sonra daha da alovlanan etirazların nəticəsində qəbul edilən "Oktyabr manifesti" vəziyyəti çox qısa bir müddət üçün sabit saxlamışdı. Çağırılan Dumalardan gözlənilən nəticələri ala bilməyən "etnik azlıqlar" müəyyən addımlar atmaq üçün təşkilatlanmağa başlamışdı. 1906-1909-cu illərdə Osmanlıda alovlanan "Gənc türklər" hərəkatından təsirlənərək Türküstan türkləri köhnə rejim üzrəində islahatlar aparılmasının vacibliyini vurğulayan "Cədidçilər" bunlar arasında ən məşhurlarından biri idi. Buxara xanı Əbd-ül Əhəd ilk vaxtlar islahat tələb edənləri dəstəkləsə də, daha sonra onların monarxiya quruluşuna qarşı olduğunu dərk edib, dini liderləri öz yanına çəkdi və cədidçilərin məktəblərini bağlatdırdı. Buraxanın yeni xanı Məhəmməd Alim xan I Dünya müharibəsində Osmanlını yox, Rusiyanı dəstəkləməsi onun ideologiyaya bağlı bir siyasətçi olmadığını göstərir. Xivə xanlığında isə vəziyyət Buxaraya görə

daha yaxşıydı, İsfəndiyar xan xanlıq üçün lazımi addımları atmaqdan çəkinmir, Buxara xanından fərqli olaraq simiclik etmir, dini liderlər ilə mübahisələrdən çəkinirdi (Baumer, 2012: 175-177).

İnqlabdan qısa bir müddət öncə ruslara qarşı Türküstanda etirazlar başlamış, I Dünya müharibəsinin başlarında türklər səfərbərliyə alınmamış (Rusiya müharibədə Osmanlı ilə savaşırdı və Osmanlı türklərin din və qan qardaşlarıydı), onun yerinə Mərkəzi Asiyanı arxa cəbhəyə çevirmiş, əhalini xüsusilə pambıq istehsalı qarşılığında ərzaq ehtiyacını qarşılayacağına söz vermiş, müharibənin sonrakı illərində ərzaq təminatının gecikməsi və hətta bir müddət sonra dayanması, bunlardan əlavə Türküstanda kişilərin səfərbərliyə alınmağa başlanması etirazların başlanğıcı oldu. 1916-cı ilin sonuna kimi böyüyən üsyan dekabr ayında Kuropatkin tərəfindən yatırıldı, lakin sadəcə 3 ay sonra Çar rejimi devrildi (Brower, 2003: 1-20).

1917-ci ilin fevral və oktyabr aylarında baş verən inqlablarından ardınca Türküstanda ümumi vəziyyət rusların əleyhinə idi. İlk olaraq bölgənin yerli xalqı iki fərqli ideologiya arasında qalmışdı. Bunlardan biri şəriət ilə dövlət idarəsini əsas alan və "mollalar" tərəfindən idarə edilən, xalq arasında nüfuzu xeyli güclü olan qrup idi. Xalqın inkişafı üçün mümkün olduğu qədər tez bir şəkildə islahatların həyata keçirilməsinin vacibliyinə inanan "Cədidçilər" qrubu isə çox vaxt yerli hakimiyyət tərəfindən sıxıştırılırdı. "Oktyabr inqlabı"-dan sonra Mərkəzi Asiyanı ələ keçirən bolşeviklər sürətlə islahatlar həyata keçirmək üçün işə başladılar. Lakin bu idarəçilərin zənn etdiyi kimi asan bir iş olmayacaqdı, çünki Sovet hakimiyyəti bir ideologiya ilə hərəkət edirdi, yerli xalqın nümayəndələrinin isə bu ideologiyanın əsas nümayəndələri olan Marks və Engelsdən xəbərləri belə yox idi. "İşçi-kəndli" hökuməti deyə adlandırılan, "bir-biri üçün çalışmalı olan insanların birliyi"-nə əsaslanan hakimiyyət stilini mənimsəyən insanların nə üçün savaşacaqlarını bilməyə ehtiyacları var idi. Burada isə bir digər problem peyda olurdu (Dadabayev, Komatsu, 2017). Yerli xalqın bir çoxu oxumağı və yazmağı bacarmırdı, üstəlik ərəb əlifbasına əsaslanan bir əlifbanı istifadə etdikləri üçün dünyanın digər qismindən geridə qalmışdılar. XIX əsrin ortalarından etibarən türk aydınlarının "Latın əlifbasına keçid" mövzusu ilə keçirdikləri konfranslarda istifadə edilən əlifbanın türk dil qrubuna uyğun olmaması dəfələrlə müzakirə edilmiş, lakin yekun addım atıla bilməmişdi. Üstəlik indi bolşeviklərə mərkəzdən gələcək göstəriş və qanunları tərcümə edəcək və yerli xalqı təmsil etməyə qadir savadlı kadrlar lazım idi. Sosyalizm əsaslı qurulan və "xalqların qardaşlığı", "bərabərlik" kimi ideologiyalarla çıxış edən bu hökumətin şəriət qanunlarının sərt tətbiq edildiyi bu bölgədə dünyanın bir çox ölkəsində gündəmə gələn "qadın haqları" məsələsini tənzimləməsi vacib idi. Bütün bunlarla yanaşı hakimiyyəti ələ aldıqları zaman mövcud olan torpaq problemini həll edəcəklərini vəd etmişdilər və bu məsələ Mərkəzi Asiyada olduqca qarışıq idi. Qısacası bolşeviklərin həll etməli olduğu beş məsələ var idi: torpaq, qadın azadlıqları, təhsil, milliyət və din (Khalid, 2021: 185-195).

İlk addım olaraq 1920 -ci ilin iyun ayında slavyan əsilli torpaq sahiblərinin əllərindən torpaqları alındı, qazax və qırğız kəndlilərə verildi. Üstəlik onlara pul və gübrə yardımları təşkil olunara məhsuldarlığın əldə edilməsi hədəfləndi. Atılan ilkin addımlar xalqın kasıb təbəqəsini bolşevik ideologiyasına bağlamaq üçün bəs etdi. Lakin bu müsbət tendensiya sadəcə bir il davam etdi. 1921-ci ilin mart ayında YİS (Yeni İqtisadi Siyasət)-in tətbiqində başlanılması ilə RSFSR-in mərkəzində ticarət və iqtisadi sahələrdə böyük sıçrayışlar müşahidə edilmiş olsa da, Türküstanda verilən yardımlar azaldığı üçün kəndlilərin vəziyyəti çətinləşdi. Üstəlik torpaqların slavyan sahiblərindən alınması islahatı da tam həyata keçirilə bilmədi, bir müddət sonra sadəcə kağız üzərində qaldı. 1922-ci ildən etibarən Moskva Mərkəzi Asiyada nəzarəti sərtləşdirdi və idarəçilik birbaşa Stalindən əmir alan "Mərkəzi Asiya Komitəsi"-nə verildi. Bolşevik partiyası ilə eyni düşüncədən olmayan bütün yerli siyasi partiyaların varlığına son qoyuldu, "şovinistlik" ilə təqsirlənən bir çox yerli xalq nümayəndəsi partiyadan ixrac edildi, lakin daha sonra savadlı kadların azlığından onların bir çoxu əhv edildi. Bu dövrdə bolşeviklərə sadiq olan Fəzlullah Xocayev və Tural Riskulov kimi yerli xalqın nümayəndələri də mövcud idi ki, onların bir çoxu əsrin əvvəllərində reformasiya tələb edən cədidçilərrin arasından çıxmışdı. Bolşeviklər qadınların gündəlik geyimlərində dəyişikliklər həyata keçirərək vəziyyəti düzəltməyə, onları gündəlik həyata qazandırmağa çalışırdı, çünki sosyalist ideologiyasını yaymaq üçün yalnız savadlı kişilər bəs etmirdi, onlara oxuma-yazmağı bilən və

gələcək nəsilləri bolşevik ideologiyası ilə yetişdirməyi bacaran xanımlar lazım idi. Həyata keçirilən islahatlar ilk öncə cədidçilərin ailələri arasında tətbiq edildi, bu zaman cəmiyyətin və dini liderlərin sərt tənqidinə baxmayaraq islahatlar davam etdi. Təhsil dünyəviləşdirildi və yeni məktəblər açıldı, əhali arasında oxur-yazarlıq faizini artırmaq üçün gecə məktəbləri təşkil edilərək cəmiyyətin hər təbəqəsindən insan buraya cəlb edildi (Keller, 157-170). Əlifba islahatı üçün addımlar atılmağa başlandı, 1920-ci illərin sonunda latın əlifbası bütün sahələrdə tətbiq üçün hazır vəziyyətə gətirildi. Buxara və Xivədə istifadə olunan fars dili və “pantürkizm” qorxusu ilə Türküstanlıların istifadə etdiyi “Çağatay türkcəsi” yerli dil olaraq qəbul edilmədi, bunun üçün özbək dili əsas alındı.

**Sərhədlərin müəyyənləşdirilməsi.**

Bolşeviklər bölgəni ələ keçirdikdən sonra qarşılarına duran ən mühüm vəzifələrdən biri də “Milliyətlərin müəyyənləşdirilməsi” məsələsi idi. O dövrdə “Millətlər komissarı” olan Stalin və Xalq Komissarları Sovetinin sədri Lenin bu məsələyə xüsusi diqqət yetirirdi. Lakin Türküstan bu dövrdə çox mürəkkəb etnik quruluşa malik idi. Belə ki, bölgənin böyük bir qismi İslam dininin “sünni” məzhəbinə mənsub idi, bu vəziyyətdən istifadə edərək bəzən aranı qarışdırmaq istəyənlə azlıqda olan şiələrlə onlar arasında münaqişələr yaradırdılar. Yuxarıda qeyd etdiyimiz dil, mədəniyyət kimi kriteriyalara nəzər salaraq burada olan xalqların kökləri və sərhədləri müəyyənləşdirilməyə çalışılırdı. Çünki daha Çarizm dövründə xalqlara “verilən” öz müqəddəratlarını təyin etmə hüququ bolşeviklər tərəfindən bu xalqlara “muxtariyyət” verilərək həyata keçirilmək istənirdi. 1918-ci ildə Türküstan MSSR (Muxtar Sovet Sosyalist Respublikası) statusu ilə RSFSR-in tərkibinə qatılmış və 1922-ci ilin 30 dekabrında elə RSFSR tərkibində SSRİ-nin tərkibinə qatılmışdır. Elə bu ildən etibarən bolşeviklər araştırmaları genişləndirmiş və əsas yeri özbəklərə vermişdi. Bu zaman ortaya çıxan Sartların dəqiq kökəni müəyyən edilə bilməmiş və onların da hər birini özbək adlandırılmışdır. Nəticədə özbəklər Türküstanın “milliyəti müəyyənləşdirilən” ilk xalqı oldu (Bregel, 2003: 96).

1920-ci ildə Qırğız MSSR quruldu və Qırğız vilayəti də buaraya birləşdirildi. SSRİ qurulduqdan sonra o dövrə kimi Xalq Cümhuriyətləri statusu ilə mövcudluğunu davam etdirən Buxara və Xivə “təhlükəli ünsürlər”-dən təmizləndikdən sonra 1923-cü ilin oktyabrında Xarəzm SSR və 1924-cü ilin sentyabrında Buxara SSR quruldu. Həyata keçirilən etnoqrafik və sosyoloji araşdırmalar nəticəsində sərhədlərin müəyyənləşdirilməsi üçün daha sürətli addımlar atılmağa başlandı. 1924-cü ilin oktyabr ayında Mərkəzi İdarə Komitəsi Türküstanda iki yeni respublikanın qurulması üçün tapşırıq verdi. Qərara əsasən Türkmənistan SSR və Tacikistan MSSR-in də tərkibində olduğu Özbəkistan SSR yaradıldı. Eyni ildə Qara-Qırğız Muxtar Vilayəti (Çar dövründə qırğızlar belə adlanırdı) yaradıldı və RSFSR-ə birləşdirildi. 1925-ci ildin mayında Qırğız MSSR-in adı dəyişdirilərək Qazax MSSR olaraq təyin edildi və Qaraqalpaqıstan Muxtar Vilayəti buraya birləşdirildi. Eyni tarixdə Qara-Qırğız Muxtar Vilayətinin adı Qırğız Muxtar Vilayəti olaraq dəyişdirildi (Bu bölgə 1926-cı ildən sonra Qırğızıstan MSSR oldu). 1929-cu ilin dekabrında Tacikistan MSSR-in tərkibinə Özbəkistan SSR-dən alınan Xocənt şəhəri də verilərək Tacikistan SSR yaradıldı. 1936-cı ildə SSRİ-nin konstitutsiyasında Mərkəzi Asiyanın siyasi xəritəsində edilən son dəyişikliklər qeyd edimişdi. Burada Qazaxıstan SSR və Qırğızıstan SSR yaradıldı, Qaraqalpaqıstan MSSR isə Qazaxıstan SSR-dən alınıb Özbəkistan SSR-ə birləşdirildi (Bregel, 2003: 96).

Ümumilikdə Türküstanda qurulan bu “müstəqil” dövlətlər sadəcə formal xarakter daşıyırdı. Ölkələrin liderləri yerli xalqın nümayəndələrindən olsa da, ölkənin mühüm siyasi vəzifələrində ruslar xidmət edirdi. Onlar bir növü həm ölkənin siyasi xəttinin, həm də ölkənin liderinin ideologiyaya sədaqətini ölçmək üçün buraya göndərilmişdilər.

## Nəticə

Sovet hökümətinin Türküstanda qurulduğu ilk illərdə həyata keçirilən islahatlar və siyasi dəyişikliklər günümüzdə müstəqil ölkələr olan Qazaxıstan, Özbəkistan, Türkmənistan, Qırğızıstan və Tacikistan Respublikalarının təməlləri atıldı. İslahatlardan qadın haqlarının müəyyənləşdirilməsi və onlara seçmə-seçilmə hüququnun verilməsi, təhsilin dünyəviləşməsi, müasir məktəblərin

açılması və bütün sosyal siniflərdən insanların təshil alma fürsəti əldə etməsi, torpaqların slavyanlardan alınaraq yerli xalqa verilməsi və onların subsidiyalar ilə təmin edilməsi, dövlət və din işlərinin bir-birindən ayrılması, o cümlədən hüququn sekulyarlaşması yerli xalqlar üçün yararlı addımlar hesab oluna bilər. Lakin edilən bütün islahatlar bolşevik propoqandası altında aparılır, Moskvanın özünə sadiq və savadlı kadrlar yetişdirmək üçün atdığı bu addımların türklərin xeyrinəmi, yoxsa zərərinəmi olduğu müəyyən etmək çətinləşirdi. Xüsusilə "Millətlərin müəyyənləşdirilməsi" pərdəsi ilə Stalinin birbaşa nəzarətində edilən dəyişiliklər ideolojik olarq bölünmələr yaşan Türküstanda vəziyyəti daha da qəlizləşdirmişdi. Bu dövrdə həyata keçirilən islahatlara əsaslanaraq səsləndirilən bəzi fikirlərə əsasən Bolşeviklər bu dəyişikliklərlə dağınıq olan sistemi yenidən təşkil etmək istəyirdi. Bu fikirdə nəzərə alınmayan nüanslar ümumilikdə fikrin yanlış olduğunu göstərməyə bəs edir. Belə ki, ilk illərdə RSFSR daxilində muxtar vilayət olaraq idarə edilən Türküstan, xüsusilə 1924-cü ildə və daha sonra atılan addımlar ilə bölünmüşdür. Bu islahatların uğurlu olduğunu demək çox çətindir, çünki taciklərin ən çox yaşadığı şəhərlərin Özbəkistan şəhərləri olduğunu, Qırğızıstanın qərb vilayətlərində özbəklərin çoxluqda olduğunu, sərhədlərin uğrulu bir şəkildə müəyyən edilmədiyinin ən böyük sübutlarındandır. Reformasiyaların intensiv bir şəkildə aparıldığı 12 ildə fərqli etnik mənsubiyyətlərə ev sahibliyi edən şəhərlərin və hətta bəzən muxtar vilayətlər və respublikların idarəçiliyinin həyata keçirilməsi tez-tez müxtəlif ölkələr arasında dəyişdirilmişdir. Tacikistanın əvvəlcə Özbəkistana verilən bir muxtar vilayət, daha sonra isə ölkə olması və özbəklərin əlində olan bəzi şəhərlərin onlara verilərək bu dövlətin torpaq bütövlüyünün təmin edilməsi gələcəkdə baş verə biləcək bütün problemlər üçün Stalinin əmri ilə atılan təməldir. Türküstanda günümüzdə mövcud olan anklav və eksklav bölgələrin mövcudluğu keçmişdə atılan bu addımların nəticəsidir.

## Ədəbiyyat

1. Keller, Sh. (2022). "Məkkəyə deyil Moskvaya" (Türkçəyə tərcümə: Ammar Kılıç). İstanbul: Selenge nəşrləri.
2. Oliver, R. (2009). "Yeni Orta Asya" (Türkçəyə tərcümə edən Mehmet Moralı). İstanbul: Metis Yayinları.
3. Sadıkov, R. (2021). "Qanlı Dörd il (1917-1921)". İstanbul: Kobel nəşrləri.
4. Bregel, Y. (2003). "An Historical Atlas of Central Asia". Denver: Brill Academic Publishing.
5. Baumer, C. (2012). "The History of Central Asia" (Vol 4). London: Bloomsbury Publishing.
6. Everet-Heath, T. (2003). "Central Asia". London: RoutledgeCurzon Publishing.
7. Bregel, D. (2003). "Turkestan and The Fate of Russian Empire". London: Routledge Curzon.
8. "History of Civilizisations of Central Asia". (2005). Turin: UNESCO Publishing.
9. Allworth, A.E. (1990). "The Modern Uzbeks". Stanford: Hoower Institution Press.
10. Dadabayev, T., Komatsu, H. (2017). "Kazakhstan, Kyrgyzstan and Uzbekistan". New York.
11. Khalid, A. (2021). "Central Asia". Princeton: Princeton University Press.
12. Keller, Sh. (2020). "Russia and Central Asia". Toronto: University of Toronto Press.

Göndərilib: 10.02.2024 Qəbul edilib: 02.04.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/40-45

**Telli İbrahimova**
Bakı Slavyan Universiteti
filologiya üzrə fəlsəfə doktoru
69_cicek_69@ rambler.ru
**İradə Zamanova**
Bakı Dövlət Universiteti
zirada04@gmail.com

# ÜMUMTƏHSİL MƏKTƏBLƏRİNDƏ DİSTANT TƏHSİLİN İDARƏOLUNMASINDA YENİ PERSPEKTİVLƏR

**Xülasə**

Məqalədə distant təhsilinin səmərəli idarəolunmasında virtual öyrətmə sistemləri üzrə yeni tövsiyələr təklif olunur və hər birinin əsas xüsusiyyətləri göstərilmiş, təlim prosesində tətbiqi modelləri haqqında yeni fikirlər verilmişdir. Bundan əlavə, ümumi təhsil məkətblərində distant təhsilini səmərəli idarəolunmasında son vaxtlar tətbiqi olunan rəqəmsal modellərin üstünlükləri qeyd olunur. Məqalənin əsas məqsədi rəqəmsal alıtlərin distant təhsildə rolu şagirdlərin bilik səviyyəsi ilə ölçülməsi müəyyənləşdirilir və son təklif olunan Moodle sisteminin üstünlüyü vurğulanır və tədris prosesində Moodle sistemindən istifadəyə diqqət yetirilir, onun tətbiqi yolları təsvir edilir. Son vaxtlar tətəbiq olunan Zoom və TEAMS onlayn üsulundan əlavə Moodle sistemi daha geniş aspektdə başa düşülür və tətbiqi olunur. Qeyd olunur ki, fənlərin öyrənilməsi üçün bu sistemin tətbiqi ənənəvi təhsil formalarından imtina ilə bağlı deyil, artıq mövcud olan təhsil formalarına əlavədir. Məlum olur ki, distant təhsil təkcə təlimin keçirilməsi və materialın ötürülməsi deyil, eyni zamanda distant təhsil öyrənənlərə proqram təminatı, geniş kommunikasiya, özünütəlimin əsaslarını qoyur. Məqalədə virtual öyrətmə sistemlərinin inkişaf perspektivlərinin əsas istiqamətləri göstərilmişdir.

***Açar sözlər:*** *distant təhsil, səmərəli idarəetmə, Moodle sistemi, yeni perspektivlər, praktik təcrübə, çətinliklər*

**Telli Ibrahimova**
Baku Slavic University
PhD in Philology
69_cicek_69@ rambler.ru
**Irada Zamanova**
Baku State University
zirada04@gmail.com

## New perspectives in administration of distance education in comprehensive schools

**Abstract**

The article offers new recommendations on virtual learning systems for the effective management of distance education, and the main features of each are shown, and new ideas are given about the models of application in the learning process. In addition, the advantages of recently applied digital models in effective management of distance education in general education schools are mentioned. The main purpose of the article is to determine the role of digital tools in distance education by measuring the level of students' knowledge, and to highlight the advantage of the recently proposed Moodle system, and to pay attention to the use of the Moodle system in the educational process, and to describe ways of its application. In addition to Zoom and TEAMS online methods, which have recently been implemented, the Moodle system is understood and applied in a wider aspect. It is noted that the application of this system for studying subjects is not

related to the rejection of traditional forms of education, but is an addition to the already existing forms of education. It turns out that distance education is not only about conducting training and transferring material, but at the same time, distance education provides students with software, extensive communication, and self-learning. The article shows the main directions of development prospects of virtual teaching systems.

***Keywords:*** *distance education, effective management, Moodle system, new perspectives, practical experience, challenges*

## Giriş

Distant təlimin səmərəli idarəolunması.

Distant təhsil müstəqil təhsil forması kimi, məsafəli təhsil forması məktəblərdə informasiya texnologiyalarının aparıcı vasitəsidir.

Ümumi təhsil müəssisələrində informasiya və kommunikasiya texnologiyalarından istifadə Azərbaycanda ümumi orta təhsilinin keyfiyyətinin və açıqlığının təmin edilməsində mühüm amildir. İnformasiya məkanının yaradılması və istifadəsi təhsildə informasiya-kommunikasiya texnologiyalarının (İKT) geniş tətbiqini nəzərdə tutur (Babo, Suhonen, 2018: 220-248; Badia, Martin, Gomez, 2019: 483-499; Iksanova, Khayrullina, Vyatkina, 2018: 417-421). Distant təhsil ümumtəhsil və ali məktəblərin modernləşdirilməsi proqramının prioritet istiqamətlərindən biri kimi tanınır. Müasir şəraitdə distant təhsilə ehtiyac var ki, bu da öyrənənlərin gələcək iş yerində təhsil almaq, əlilliyi olan şəxslərin təhsil alması zərurəti ilə bağlıdır. Bu imkanı informasiya və təhsil texnologiyaları və kommunikasiya sistemləri sayəsində həyata keçirilən distant təhsil təmin edir. Bundan əlavə, distant təhsilin digər növləri də mövcuddur: *söhbət dərsləri, veb dərsləri, telekonfranslar* distant təhsildə daha geniş tətbiq edilir, inkişaf edir və təkmilləşir ki, bu da biliklərin əldə edilməsi üçün yeni imkanlar açır. Məktəblərdə distant təhsilin həyta keçirilməsinin bir sıra danılmaz üstünlükləri vardır. Distant təlim istifadə edilən şəbəkələr vasitəsilə proqram təminatını təşviq edir, veb xidmətlərdən istifadə standartlarını təqdim edir (Vedemeyer, 1981).

Azərbaycan məktəblərində kompüter texnologiyası bir neçə ildir ki, ilk növbədə aşağıdakı məqsədlər üçün uğurla istifadə olunur: həm ayrı-ayrı təhsil müəssisələrinin, həm də ümumilikdə çoxpilləli təhsil sistemlərinin idarəetmə səmərəliliyinin artırılması; kompüter elminin əsaslarını öyrənmək; yeni informasiya texnologiyalarından (İKT) istifadə etməklə pedaqoji prosesin səmərəliliyinin artırılması və s. Bu təsadüfi deyil, çünki İKT tədris prosesinin fərdiləşdirilməsi imkanlarını müəyyən edən geniş çeşidli tədris materialını təqdim edir. Təcrübə göstərir ki, müasir informasiya sistemlərindən istifadə bacarıqlarının mənimsənilməsi şagirdlərə aşağıdakı bacarıqları inkişaf etdirməyə kömək edir: öz fəaliyyətlərini planlaşdırmaq, lazımi məlumatları tapmaq, proseslərin və obyektlərin məlumat modellərini qurmaq və mesajlarını strukturlaşdırmaq. Bu bacarıqlar informasiya cəmiyyətində uğurlu fərdi özünüdərketmənin tərkib hissəsidir.

Dünyanın rabitə şəbəkələrindəki müxtəlif yeniliklər sürətli şəkildə qəbul edilməkdədir. Məktəblərdə, kolleclərdə və ya ali təhsil institutlarında biliklərin verilməsinin ənənəvi vasitələri də əhəmiyyətli dərəcədə təsirlənmişdir.

### 1.1. Distant təhsilin idarəolunmasında Moodle sistemi.

Hal-hazırda onlayn təhsil sənayesinin təxminən 38 milyard avro dəyərində olduğu təxmin edilir. ABŞ-da 3,5 milyon öyrənən distant təhsil sahəsində virtual onlayn dərslərinə yazılır və müəyyən dərəcə qazanır (Vyatkina, Kurzyakova, 2016: 109-112; Iksanova, Khayrullina, Vyatkina, 2018: 417-420).

Onlayn dərəcələr təklif edən məktəblər şagirdlərə öyrənmə materiallarını izləməyə və öyrənmə tərəqqisini izləməyə kömək etmək üçün tez-tez öyrənmə idarəetmə sistemlərindən istifadə edirlər. Moodle ən populyar öyrənmə idarəetmə sistemlərindən biridir. O vaxtdan bəri o, tədrisin səmərəli təşkili və keyfiyyətli təhsil üçün olduqca faydalı alətə çevrilmişdir. Qısa cavab budur ki, Moodle sistemi e-tədris məzmunu yaratmağa və yükləməyə, onu şagirdlərə çatdırmağa, həmin məzmun üzrə onları qiymətləndirməyə, onların irəliləyişlərini izləməyə və nailiyyətlərini tanımağa imkan verir (Badia, Martin, Gomez, 2019: 483-499; Vyatkina, Kurzyakova, 2016: 109-112; Garrison, 2000).

Aydındır ki, reallıqda bunun üçün daha çox şey var, lakin sadəlik və istifadəçilərə e-təlim məzmununu çatdırmaq üçün Moodle ən yaxşı sistemdir. Distant təhsilin Moodle sistemi ilə həyata keçirilməsində şagirdlərin fərdi yanaşmada fəaliyyətinin aşağıdakı kimi həyata keçirir:

- *tədris prosesini fərdiləşdirməyi asanlaşdırır*
- *Mövzu üzrə məlumatları konkretləşdirir*
- *Çətin əlçatan yerlərdə təlimi təmin edir*
- *Öyrənmək üçün motivasiyanı yaradır*
- *Təlimin keyfiyyətinin yüksəldir*
- *Əlçatan bilik bazası yaradır*
- *Müəllimin yükünün azaldılmasına nail olur*

Hazırda məktəblərdə şagirdlərin maraqlarına uyğun olaraq əlverişli vaxtda, tanış mühitdə və nisbətən avtonom tempdə təhsil ala bilməsi vacib şərtlərdən biridir. Distant təhsil şagirdlərin yeni bilik və bacarıq əldə etməsini asanlaşdırır, onları yüklü məlumatlardan uzaqlaşdırır və təlimin məqsədlərinin dəqiq oriyentasiyasını yarad bilir. Bununla belə, distant təhsil sisteminin çatışmazlıqları da var (Vheeler, 2002: 419-430).

Birincisi, təlimin uğurlu korreksiyası və adekvat qiymətləndirmə üçün birbaşa təmasda olmaq vacibdir. Bundan əlavə, işləyən, tapşırıqları yerinə yetirən şəxs kimi şagirdlərin nəticələrinin dəqiq yoxlamaq mümkün deyil. Bəzən hesab edirik ki, biliyin keyfiyyətinə yekun nəzarət hələ də üzbəüz tədrisdə həyata keçirilə bilər.

Bundan əlavə, bütün şagirdlərin internetə çıxışı mümükün olmadığından təlminin son nəticələrinin müəyyən etmək çətinləşir. Ən əsası isə distant təhsillə müəllimlə şagird arasında birbaşa əlaqə çox zəif olur və uzunmüddətli distant təhsillə şagird düşüncələrini düzgün formalaşdırmağa, çıxış etməyə və müzakirələr aparmağa mane olur. Eyni zamanda, bu təlim forması təhsil almaq üçün şüurlu və motivasiyalı yanaşma tələb edir. Münasib vaxtda təhsil almaq imkanı sistemli öyrənməyə deyil, bu növ fəaliyyətin daimi süründürülməsinə çevrilə bilər. Məhz buna görə də uzaq forma xüsusi özünü təşkil etmək və vaxtınızı hesablamaq bacarığı tələb edir (Babo, Suhonen, 2018: 220-248; Vyatkina, Vyugina, 2018: 247-277; Vyatkina, Vyugina, 2019: 92-94).

Qeyd olunan məqsədlərə uyğun distant təhsildən istifadə təcrübəsi daha bir çatışmazlıq, yəni uzun müddət kompüterdə olmaq zərurəti ilə əlaqədar görmə qabiliyyətinin ağır yükünü aşkar etdi. Buna görə də distant təhsildən istifadə edərkən onun növlərini şaxələndirmək lazımdır. Uzaqdan texnologiyanın ən çox yayılmış növləri bunlardır:

- bütün iştirakçıların söhbətə eyni vaxtda girişi olduqda söhbət dərsləri sinxron keçirilir;
- telekommunikasiya və digər internet imkanlarından istifadə etməklə internet dərsləri və ya distant mühazirələr, konfranslar, seminarlar, işgüzar oyunlar, laboratoriya işləri, seminarlar və digər təlim sessiyaları;
- elektron poçtdan istifadə etməklə telekonfranslar keçirmək təhsil telekonfransları təhsil məqsədlərinə nail olunması ilə xarakterizə olunur.

Məlumdur ki, distant təhsilin tətbiq edilən formaları eyni zamanda tədris materiallarını elektron poçt vasitəsilə digər ərazilərə, ünvanlara çatdırır. Bununla belə, bütün bilikləri uzaqdan əldə etmək mümkün deyil. Məsələn, şagird ilə müəllim arasında birbaşa əlaqə olmadıqda, yaradıcı fəaliyyətin bəzi növlərini təkbaşına öyrənmək demək olar ki, mümkün deyil. Təhsilin innovativ formalarının tətbiqinin əsas problemlərindən biri də mövcud təhsil sisteminin ən yaxşı ənənələri, müasir pedaqoji innovasiyalar və informasiya-kommunikasiya texnologiyaları vasitələri arasında optimal tarazlığın seçilməsidir. Təcrübə və bəzi tədqiqatların göstərdiyi kimi, öyrənmə tendensiyası rahat informasiya təhsil mühiti, bütün zəruri təhsil məlumatlarını təmin edən kommunikasiya sistemləri yaradan proses kimi qarışıq öyrənmə istiqamətində aydın şəkildə inkişaf edir (Vyatkina, Vyugina, 2018: 247-277; Vyatkina, Kurzyakova, 2016: 109-112; Holmberg, 1985)

Distant təhsil üç müxtəlif formada qurula bilər: *sinxron, asinxron və qarışıq.* Onların hər birinin öz üstünlükləri və mənfi cəhətləri var, buna görə də kursu təqdim edəcəyiniz forma haqqında əvvəlcədən düşünmək lazımdır.

Qeyd edək ki, distant təhsil kontekstində müəllimin fəal rolu azalmır, çünki o, şagirdlərin bilik səviyyəsini müəyyənləşdirməli və əhatə olunan materialın ən yaxşı mənimsənilməsinə nail olmaq üçün təlim proqramını tənzimləmək qərarına gəlməlidir. Lazım gələrsə, şagird internetdən birbaşa ünsiyyət vasitəsi kimi istifadə edərək, müəllimlə onlayn əlaqə saxlayaraq ondan məsləhət ala bilər.

**Distant təlimin səmərəli idarəolunmasında tövsiyə olunan Moodle sisteminin rolu.**

Distant təhsilin müxtəlif üsullarının tətbiqi son vaxtlar ən çox tövsiyə olunan model nümunələrdir (Babo, Suhonen, 2018: 220-248; Badia, Martin, Gomez, 2019: 483-499). Bu modelllərə aşağıdakı vasitəlrə daxildir:




**Şəkil 1. Distant təhsil vasitələri (2012**).

Beləliklə, sadə dillə desək, Moodle onlayn təlim və öyrənməni idarə etmək, çatdırmaq və ölçmək üçün istifadə edilən Öyrənmə İdarəetmə Sistemidir (ÖİS).

Moodle öz növünün ən məşhur rəqəmsal platformasıdır və şübhəsiz ki, geniş istifadə olunur. 2002-ci ildə istifadəyə verilmiş bu, təlimi idarə edənlər üçün onu müxtəlif auditoriyalara çevik və səmərəli şəkildə çatdırmaq üçün bir yol təqdim edir.

Məlumdur ki, onlayn təlim provayderinin virtual ekvivalenti kimi başa düşülə bilər – ilkin olaraq təhsil müəssisələri tərəfindən istifadə olunan müstəqil öyrənmə mühiti təmin edir.

Distant təhsili və ya *elektron sinfi* uğurla həyata keçirmək üçün *Moodle* sistemindən uğurla istifadə olunur. Son beş-yeddi ildə təhsil sahəsində dünyanın ən yaxşı və ən populyar elektron mühiti *Moodle* mühiti hesab olunur və adını hərfi mənada “Modul obyekt yönümlü dinamik öyrənmə mühiti” kimi tərcümə etmək olar (Iksanova, Khayrullina, Vyatkina, 2018: 417-421; Holmberg, 1995).

Moodle mühitinin fəlsəfəsi gələcəyin təhsilini *“qarışıq öyrənmə”* və ya *“tam dövrəli elektron təhsil”* adlandırılan təhsillə əlaqələndirir (şək. 1). Beləliklə, Moodle konsepsiyası hesab edir ki, ətraf mühitin əsas ideyası ənənəvi öyrənmə formalarından imtina ilə əlaqəli deyil. Əksinə, mövcud təlim formalarına əlavə olaraq elektron mühitin imkanlarından istifadə edilir, iki təlim formatı *qarışıq və ya distant təhsil* yaradılır (Garrison, 2000; Holmberg, 1995: 47-53):

O, təhsil səviyyəsindən asılı olmayaraq, distant təhsil şagirdlər üçün dinamik veb-saytlar yaratmaq vasitəsi kimi bütün dünyada pedaqoqlar arasında çox məşhur olmuşdur. Onun işləməsini təmin etmək üçün o, veb serverdə və ya müəllimin öz kompüterində quraşdırılmalıdır. Qeyd etmək lazımdır ki, *Moodle* layihəsinin əsas məqsədi müəllimləri təlim prosesinin idarə edilməsi və onun təşviqi üçün ən yaxşı vasitələrdən biri ilə təmin etməkdir. *Moodle i*stifadə etməyin bir neçə yolu var (Vygotsky, 1930-1978):

- Təhsildə şagird masştabını genişləndirmək və hətta ibtidai siniflərdə müstəqil təhsil üçün istifadə imkanları təmin edilə bilər;

- çoxlu sayda yerli təhsil təşkilatları *Moodle*-dan tam onlayn kurslar yaratmaq üçün bir rəqəmsal platforma kimi istifadə edilə bilər:

- hibrid, yəni qarışıq öyrənmə kimi tanınır və tətbiq oluna bilər;
- öyrənilən mövzular üzrə məlumat mübadiləsi üçün əlverişli mühit yaratmaq qabiliyyətinə görə bir çox istifadəçi kurs elementi modullarını (forumlar, verilənlər bazası və lüğətlər) bəyənir;
- məktəb müəllimləri şagirdlərə məlumat vermək, tapşırıq və ya testlərdən istifadə etməklə öyrənməni qiymətləndirmək üçün *Moodle*-dan istifadə etməyə üstünlük verirlər;
- təbiətinə görə, *Moodle* virtual mühiti interaktivdir, bunun sayəsində öyrənmə dərəcəsini əhəmiyyətli dərəcədə artıra bilər (Holmberg, 1985; Holmberg, 1995: 47-53; Keegan, 1995).
- şagirdlər üçün tədris prosesini daha maraqlı və dinamik edir (Badia, Martin, Gomez, 2019: 483-499).

Bu, ilk növbədə, müəllimin bir qrup fənlər üzrə bütün ən son tədris-metodiki inkişafları və təhsil yeniliklərini iki mühüm vəzifəni həll etməyə imkan verən xüsusi *"elektron təhsil"* formatına köçürdüyü bir yanaşmanı nəzərdə tutur:

- *təhsili yüksək səviyyəyə çatdırmaq.*
- *keyfiyyətli, rəqabətədavamlı, maksimum effektiv və tam;*
- *digər ölkələrdən olan istehlakçılar da daxil olmaqla ən geniş auditoriya üçün təhsili mümkün qədər əlçatan etmək* (Badia, Martin, Gomez, 2019: 483-499; Vyatkina, Vyugina, 2019: 92-94; Garrison, 2000).

Bununla belə, elektron texnologiyaların yüksək didaktik potensialı yalnız aydın psixoloji və pedaqoji əsaslandırmaya malik olan resurslardan istifadə etməklə həyata keçirilə bilər.

Hesab edirik ki, Moodle sistemi şagirdlərin səriştələrinin inkişafına, ilk növbədə analitik, dizayn və ünsiyyət bacarıqlarının inkişafına, tədris prosesində yenilikləri axtarmağa, yaratmağa və tətbiq etməyə hazır olmaq, interaktiv əlaqə qurmaq, fərdiləşdirilmiş, fəaliyyətə əsaslanan və şəxsiyyət yönümlü texnologiyalar və tədris metodlarını tətbiq etmək bacarığı və s.

- *Qiymətləndirmələri idarə edir*

Şagirdləriniz üçün məzmun təmin etmək, onları qiymətləndirmək ən vacib bir tələbdir. Moodle ÖİS şagirdləriniz üçün qiymətləndirmələr yaratmağa və idarə etməyə imkan verir, onların öyrənmə məzmunu ilə məşğul olmasını və arzu olunan nəticələrə nail olmasını təmin edir (Vyatkina, Kurzyakova, 2016: 109-112; Iksanova, Khayrullina, Vyatkina, 2018: 417-421).

- *Öyrənənlərin irəliləyişlərini izləyir*

Öyrənənlərin irəliləyişini izləmək imkanı Moodle ÖİS-dən istifadə etməyin çətin və tez-tez xaotik oflayn və ya uzaqdan öyrənməni idarə etmə üsullarının və ya sadəcə Məzmun İdarəetmə Sisteminin (MİS) istifadəsinin digər böyük üstünlüyüdür.

Moodle daxilində şagirdin irəliləyişini izləməyin əsas yollarından bəzilərinə fəaliyyət və kursun tamamlanması, dərs hesabatları, analitik rəylər və qiymət kitabçaları daxildir. Qiymətləndirmə tapşırıqları birbaşa Moodle-da, Moodle Qiymətləndirmə Kitabçası vasitəsilə edilə bilər. Moodle-da siz multimedia elementlərini video, audio və slayd şouları kimi kurslara daxil edə bilərsiniz. Oyunlaşdırma kimi, bu müxtəlif elementlər müxtəlif tədris üsullarını təmin etməklə tələbələrin zehnini stimullaşdırır və məşğul edir (Holmberg, 1985; Holmberg, 1995: 47-53).

- *Nailiyyətləri tanıyır və mükafatlandırır*

Şagirdlərinizi məzmun üzrə qiymətləndirdikdən və onların tərəqqisini izlədikdən sonra, onların irəliləyişlərini tanımaq üçün nailiyyətlərə əsasən mükafatlandıra bilərsiniz. Moodle istifadəçiləri paylaşılan mükafatlar təklif edir, onları məşğul saxlayır və kimin hansı kursları bitirdiyini tez müəyyən etməyə kömək edir (Holmberg, 1995: 47-53; Keegan, 1995: 89-93).

## Nəticə

Beləliklə, ümumi təhsil sistemində distant təhsilin inkişafı bu gün distant təhsil inkişaf edir, təkmilləşir və əhalinin müxtəlif qruplarını əhatə edir, çünki müasir iqtisadiyyat üçün - "bilik iqtisadiyyatı" üçün xas paradiqma ömürboyu təhsildir. İnformasiya və kommunikasiya texnologiyalarından istifadə Azərbaycanda ümumi orta təhsilinin keyfiyyətinin və açıqlığının təmin edilməsində mühüm amildir.

Distant təhsil vasitəsilə virtual onlayn dərslərin təşklil üzrə ən yeni tövsiyə kimi təqdim olunan Moodle sistemi məktəblərdə şagirdlərə təlim materiallarını izləməyə və irəliləyişləri izləməyə kömək edir. Moodle sistemi e-tədrisin yeni məzmunu kimi şagirdləri yeni materiallarla təmin etməyə, səmərəli kommunikasiya və qiymətləndirməyə, onların irəıliləyişləri izləməyə və əldə olunan ailiyyətlərini tanımağa imkan verir.

## Ədəbiyyat

1. Babo, R., Suhonen, J. (2018). E-assessment with multiple choice questions: A qualitative study of teachers' opinions and experience regarding the new assessment strategy. International Journal of Learning Technology, 13(3), pp.220-248. https://doi.org/10.1504/IJLT.2018.095964
2. Badia, A., Martin, D., Gomez, M. (2019). Teachers' perceptions of the use of Moodle activities and their learning impact in secondary education. Technology, Knowledge and Learning, 24(3), pp.483-499. https://doi.org/10.1007/s10758-018-9354-3
3. Iksanova, A.S., Khayrullina, E.R.,Vyatkina, I.V. (2018). Prepodavaniye gumanitarnykh distsiplin s ispol'zovaniyem informatsionno-kommunikativnykh tekhnologiy. V sbornike: Problemy inzhenernogo i sotsial'no-ekonomicheskogo obrazovaniya v tekhnicheskom vuze v usloviyakh modernizatsii vysshego obrazovaniya-2018.Ma-terialy IX Mezhdunarodnoy nauchno-metodicheskoy konferentsii. Otv.red.S.D.Pogorelova, s.417-421.
4. Vedemeyer, S. (1981). Learning at ze bask door: Refl estions on non-traditional learning in ze lifespan. Madison: University of Vissonsin Press.
5. Vyatkina, I.V., Kurzyakova, A.A. (2016). Primeneniye tekhnicheskikh sredstv obucheniya pri izuchenii distsipliny "Russkiy yazyk i kul'tura rechi" dlya studentov nefilologicheskogo napravleniya kak sredstvo intensifikatsii obucheniya. V sbornike: Rol' innovatsiy v transformatsii sovremennoy nauki. Sbornik statey Mezhdunarodnoy nauchno-prakticheskoy konferentsii. Otvetstvennyy redaktor: Sukiasyan Asatur Al'bertovich. Ufa, s.109-112.
6. Garrison, R. (2000). Theoretical challenges for distance education in the 21 century: A shift from structural to transactional issues. The International Review of Research in Open and Distance Learning. Retrieved from.
7. Vheeler, S. (2002). Student Perseptions of Learning Support in Distanse Edusation. Quarterly Reviev of Distanse Edusation, 3(4), pp.419-430.
8. Vyatkina, I.V., Vyugina, S.V. (2018). Vozmozhnosti ispol'zovaniya innovatsionnykh tekhnologiy v uchebnom protsesse universiteta. Trudy mezhdunarodnogo simpoziuma Nadezhnost' i kache-stvo.T.1, s.247-277.
9. Vyatkina, I.V., Vyugina, S.V. (2019). Informatsionno-kommunikatsionnyye tekhnologii v sisteme obucheniya inostrannykh studentov russkomu yazyku kak inostrannomu. Trudy mezhdunarodnogo simpoziuma Nadezhnost' i kachestvo. T.2, s.92-94.
10. Holmberg, B. (1985). The feasibility of a theory of teaching for distance education and a proposed theory. ZIFF Papiere 60. ERIC, ED 290013.
11. Holmberg. (1995). The evolution of the character and practice of distance education. Open Learning 10 (2), pp.47-53.
12. Vygotsky, L.S. (1930-1978). Mind in Sosiety: Ze development of hiğer psyçologisal prosesses. Sambridge, M.A. Harvard University Press.
13. Keegan, D. (1995). Distance education technology for the new millennium: Compressed video teaching. ZIFF Papiere IO 1. ERIC, ED 3, pp.89-93.

Göndərilib: 11.02.2024 Qəbul edilib: 29.03.2024

Qeyd olunmalıdır ki, şagirdlərin analitik və evristik fəaliyyəti zamanı mərhələlərin əhatə olunması bir çox faktorlardan asılıdır. Biz aşağıdakıları xüsusi olaraq fərqləndiririk:

1) Problemliliyin səviyyəsindən;
2) Şagirdlərin müstəqillik dərəcəsindən;
3) Müəllimin nəzəri və praktik hazırlığından.

Təlimdə problemliliyin dərəcəsinin və ya səviyyəsinin iki əsas əlamətlə müəyyənləşdiyini təcrübədən görmək çətin deyildir. Bunlardan biri şagirdə təqdim olunan, yerinə yetirilməsi ondan tələb edilən tapşırığın, çalışma, məsələ və sualların mürəkkəblik dərəcəsi, digəri isə prosesdə əhatə olunan mərhələlərin tamlıq dərəcəsidir (İbrahimov, Hüseynzadə, 2013: 556).

Xüsusiyyətləri barədə ümumiləşmələr verdiyimiz bu altsistemin mərhələlə rinin tamlıq dərəcəsi iki amillə şərtlənir: a) təlim materialının məzmunu; b) idrak prosesinin bu və ya digər mərhələlərinin (problemli vəziyyət, problemin qoyuluşu, hipoteza irəli sürülməsi, isbat, həllin yoxlanılması) mövcudluğu və ya mövcud olmaması. Şagirdlərin müstəqilliyinin dərəcəsi problemlilik səviyyəsi ilə bağlıdır. Lakin müstəqillik dərəcəsinin özü digər amillərlə, xüsusən də problem həlli ilə bağlı əvvəlcədən əldə olunmuş üsulları yeni tədris və həyat situasiyasına tətbiq etmək, təlim probleminin həllinin yeni üsullarını tapmaq və şagirdin verilənləri təhlil etməklə ümumiləşdirmə bacarığı əsasında müəyyən olunur (Məmmədli, 2022: 109).

Problemlilik səviyyəsi, idrak müstəqilliyinin dərəcəsi və mənimsəmə səviy yəsi qarşılıqlı asılı olan kateqoriyalardır. Problemlilik səviyyəsi idrak müstəqilliyi üçün şərt və stimul kimi çıxış edir, həm də o, öz növbəsində bilik və fəaliyyət üsul larının mənimsənilmə səviyyəsini müəyyən edir. Biz şagird fəaliyyətinin xarakteri və mərhələlərin tamlıq dərəcəsi əsasında problemliliyin aşağıda öz əksini tapan beş səviyyəyə ayrılmasına tərəfdarıq:

1. Müəllimin metodik işindən asılı olmadan problemli vəziyyətin yaradılması ilə;
2. Yaranmış vəziyyətdən istifadə olunması, yaxud da müəllimin problemli vəziyyəti özü yaratması və şagirdlərin diqqətini problemə yönəltməsi ilə;
3. Müəllimin problemli vəziyyət yaratması, onun həll yollarının və həllinin şagirdlər tərəfindən axtarışı prosesini idarə etməsi ilə;
4. Yaranmış problemli vəziyyətdə problemin müəllim tərəfindən formulə olunması və şagirdlərin tam müstəqilliklə onu həll etməsi ilə;
5. Şagirdin müstəqil olaraq problem irəli sürməsi və onu həll etməsi ilə.

Burada vurğulayaq ki, problemliyin qeyd etdiyimiz ilk iki səviyyəsi həm də biliyin, fəaliyyət üsullarının əsasən hazır ötürülməsini ön plana çəkən altsistem üçün xarakterikdir.

Şagirdlərdə təəccüb, maraq, istək və s. yaradan metodik priyomlar da aktivləş dirmənin zəruri vasitələrindəndir. Şagirdin hissi-emosional psixi fəaliyyət sferası onlarda aktiv fəaliyyət üçün şərait yaradır, bu fəaliyyəti motivləşdirir. Lakin motiv ləşdirmənin əhəmiyyətini azaltmadan qeyd etmək lazımdır ki, problem əqli fəaliyyətin ali dərəcəsini determinə edir. Biz "şagirdin icraetmə, reproduktiv mənimsəmə fəaliyyəti müəllim tərəfindən istiqamətləndirilir və ona nəzarət olunur, şagirdin yaradıcı öyrənmə fəaliyyətinin gedişində isə bir çox məsələlər idarə olunmazdır", - fikrinin əleyhinəyik. Şagirdin yaradıcı öyrənmə fəaliyyəti idarəolunan prosesdir və onu təlim texnologiyalarının tətbiqi, imkan daşıyıcılarının funksiyalarının səmərəliliyini artırmaqla effektli şəkildə həyata keçirmək mümkündür (Mehrabov, 2012).

Evristik fəaliyyətin əsas mərhələlərindən biri problem situasiyasının yaradıl masıdır. Problem situasiyası şagirdlərin əqli fəaliyyətinin aktivləşdirilməsi və yeni biliklərin mənimsənilməsi prosesinin idarəolunması vasitələrindəndir. O əqli fəaliyyət üçün xarakterik olan bütün məntiqlərin, o cümlədən alqoritmik və evristik mən tiqlərin yerini müəyyənləşdirməkdə əsas rol oynayır. Elə bu səbəblərə görə də, təlim prosesində problem situasiyasının necə yaranması məsələsinin tədqiqi nəzəri və praktik cəhətdən çox faydalıdır.

Əsas mahiyyətinə görə təfəkkürün yalnız yeni məqsədlər olan, fəaliyyətin köhnə, əvvəlki üsul və vasitələrinin azlıq etdiyi yerdə lazım gəldiyi məlumdur. Belə şəraitin mövcudluğu problemli vəziyyət deməkdir. Bu vəziyyətin əsasında dialektik ziddiyyət durur (Həmzəyev, 1991: 29-30).

Qənaətimizə görə, dərk olunmuş ziddiyyətlər isə əksər hallarda analitik və ya evristik fəaliyyət nəticəsində aradan götürülə bilər

Apardığımız tədqiqatlardan əldə etdiyimiz materialların ümumiləşməsi göstərir ki, müəllimlərimiz problem situasiyası vasitəsilə ilə idrak tələbatı yaradarkən əsasən üç məqsəd güdürlər: a) yeni biliklər əldə etməyi və qazanılmış bilikləri, fəaliyyət növünü yeni, tanış olmayan situasiyada tətbiq etməyi öyrətmək; b) bilikləri yaradıcı tətbiq şəraitində keyfiyyətlə mənimsətmək; c) şagirdləri yaş və bilik səviyyələrinə müvafiq elmi tədqiqat metodlarının müstəqil tətbiqinə hazırlamaq.

Problem situasiyası ilə bağlı iki anlayışa elmi ədəbiyyatda tez-tez rast gəlmək mümkündür: problemli vəziyyətin yaranması və problemli vəziyyətin yaradılması. M.Kruqlyak belə hesab edir ki, "müəllim problemli vəziyyəti yaradır", – demək düzgün deyildir, çünki situasiyanın özü obyektiv xarakterlidir. Bu barədə onu demək olar ki, əvvəla, problemli vəziyyət və problem əslində psixoloji hadisədir və yuxarıda vurğuladığımız kimi, onların əsasında obyektiv, dialektik ziddiyyət durur.

İkincisi, əgər problemli öyrənmə nöqteyi-nəzərdən subyektin mövqeyi ilə bağlı problem situasiya yaranırsa, problemli öyrətmə baxımından xüsusi metodik priyom ların tətbiqi nəticəsində müəllim özü xüsusi olaraq onu yaradır. Odur ki, problemli vəziyyətin yaradılması anlayışına problemli öyrənməni özündə ehtiva edən altsiste min təşkili vasitəsi olan pedaqoji anlayış kimi baxmağı məqsədəuyğun hal hesab etmək olar. Unuda bilmərik ki, şagirdin fəaliyyəti müəllimin pedaqoji təsirinin transformasiya olunması ilə bağlıdır. Şagirdlər üçün öyrəniləcək anlayışın mənimsənilməsinin özündə həmişə problem mövcuddur (istənilən anlayışa xas olan dialektik ziddiyyətlərin təzahürü kimi). Şagird tərəfindən təlim materialı tamamilə mənimsənilənədək bu, mövcud olan təbii haldır. Müəllimdən asılı olmadan problemli vəziyyətin yaranması da təlim-tərbiyə prosesində qanunauyğun və təbii hadisədir.

Bu hal, şübhəsiz, əqli fəaliyyəti fəallaşdırır, lakin ona şagirdlərə elmi cəhət dən əsaslandırılmış pedaqoji təsir priyomlarından istifadənin nəticəsi kimi baxmaq olmaz. Şübhə yoxdur ki, problemli vəziyyətin yaradılması üsullarının metodik cəhətdən düzgün müəyyənləşdirilməsi o zaman mümkün olur ki, onun yaranmasının qanunauyğunluqları müəllimə məlum olsun. Müvafiq ədədbiyyatda problemli vəziyyətin tiplərini aşkar etmək üçün bu qanunauyğunluqları formulə etmək təşəb büsləri vardır.

Təlim psixologiyası sahəsində aparılmış tədqiqatlar zamanı müəyyən edilmişdir ki, problem situasiyasının əsas tipləri barədə müəllimin biliyi bu cür situasiyaların yaradılması yollarını düzgün müəyyənləşdirməyə, bununla da şagirdlərin idrak fəaliyyətini idarə etməsinə şərait yaradır (Abbasov, Məmmədzadə, Məmmədli, 2021: 333-334).

Təlim prosesində özünü göstərən problemli vəziyyətin müəllim tərəfindən yaradılmasına və ya müəllimdən asılı olmadan yaranmasına görə fərqləndirə bilərik. Yaradılan problem situasiyalarda bir sıra məqsədlər güdülür. Bunlardan ikisi belədir:

1. Şagirdləri qarşıya qoyulmuş məqsədə yönəltmək, öyrənməni təşviq etmək üçün problemli vəziyyətin yaradılması;

2. Problemin formula edilməsi və onun həlli ilə yeni biliyin, fəaliyyət üsulu nun əldə olunması üçün problemli vəziyyətin yaradılması.

Problemli vəziyyətin yaradılması şagirdi təlim fəaliyyətinin müstəqil əldə olunmasının subyektinə çevirmək baxımından bir çox didaktik vəzifələrin həyata keçməsinə imkan yaradır:

1) Şagirdlərin suala, məsələyə, tədris mövzusuna diqqətini yönəldir, onlarda idrak marağı oyadır;

2) Şagird qarşısında qoyulan idrak çətinliyi onların əqli fəaliyyətinin aktivliyinin davamlılığına səbəb olur;

3) İdrak tələbatı ilə onun yerinə yetirilməsi imkanları arasındakı ziddiyyəti şagird qarşısında açır;

4) İdrak məsələsi, sual, çalışmada əsas problemi və çətinlikdən çıxmağın rasional yolunu axtarmağa istiqamətlənməkdə şagirdə kömək edir;

5) Aktuallaşdırılmalı əvvəlki biliklərin (əldə olunmuşların) sərhəddini müəyyən etməkdə şagirdə yardımçı olur.

Məlum olduğu kimi, problem bir və ya bir neçə məsələnin həlli ilə aradan qaldırılır. Odur ki, tədqiqat prosesindən əldə etdiyimiz materiallardan göründüyü kimi, təcrübəli müəllimlər problemli vəziyyəti yaradarkən formulə edəcəyi (və ya şagird tərəfindən formulə olunacaq) problemi və onun həllindən ibarət olan məsələni (məsələləri) əsas kimi qəbul edirlər. Onlar haqlı olaraq nəzərdə tuturlar ki, həmin məsələnin (məsələlərin) həlli yeni biliyin, fəaliyyət üsulunun əldə olunması deməkdir. Belə problem situasiyalarını dörd qrupda birləşdirmək olar:

1. Təhlili ilə şərti məlum olan, lakin həll yolu, həllin əsaslandığı nəzəri və praktik bazis, onun nəticəsi məchul olan idrak məsələsi formulə edilən problem situasiyası;
2. Təhlili ilə şərti, həllinin əsaslandığı bazis və nəticəsi məchul, lakin həll yolu məlum olan idrak məsələsi formulə edilən problem situasiyası;
3. Təhlili ilə şərti, həlli yolu ilə nəticəsi məchul, lakin həllin bazisi məlum olan, idrak məsələsi formulə edilən problem situasiyası;
4. Təhlili ilə şərti, həllin əsaslandığı bazis, həlli yolu məchul, amma nəticəsi məlum olan, idrak məsələsi formulə edilən problem situasiyası.

Qeyd etdiyimiz kimi, problem situasiyasının yaranması əqli fəaliyyətin istər analitik, istərsə də evristik xarakterdə cərəyan etməsindən asılı olmayaraq, yalnız başlanğıcdır. Yeni biliyin və fəaliyyət üsulunun müstəqil mənimsənilməsi proble min müstəqil həllindən kənarda həyata keçə bilməz. Həmin prosesin təşkili və idarə olunması iki əsas qanunauyğunluqla bağlıdır. Birinci qanunauyğunluq psixolojidir (mənimsəmənin problemlilik səviyyəsi), ikinci qanunauyğunluq psixolinq vistikdir (həlledici fikrin istiqaməti ilə problemin sözlə ifadəsinin bağlılığı). Çətin vəziyyətdən şagirdin çıxması cəhdi onun elə əqli fəaliyyəti ilə bağlıdır ki, bu fəaliyyət çətinliyə səbəb olan vəziyyətin elementlərinin müəyyənləşdirilməsinə doğru istiqamətlənir. Qeyd olunan fəaliyyət sualların qoyuluşu ilə bağlıdır. Təbii ki, şagirdin məlum biliklərlə ilə problemli vəziyyəti yaradan yeni-yeni fakt və hadisə lər arasındakı münasibəti dərk etməsi problemin düzgün formula olunmasının başlıca şərtidir. Problemli vəziyyət bir çox hallarda müəllimin problemi formulə etməsinin nəticəsi kimi yaranır. Bu halda şagird problemi həll etməyə başlayır və həll yolunu axtarır.

Belə bir cəhət unudulmamalıdır ki, problem situasiyasının təhlili nəticəsində meydana çıxan problem özlüyündə psixoloji-didaktik kateqoriyadır. Həm də psixoloji - didaktik kateqoriya kimi çıxış edən problem özündə yeni biliklər, həmin bilikləri mənimsəməyin yeni üsullarını daşıyır (həm proses, həm də nəticə) və dərk etmə prosesinin (fikri fəaliyyətin) strukturunu təyin edir. Bunu nəzərə alan filosof və psixoloqlar haqlı olaraq göstərirlər ki, problemin qoyuluşu prosesini keçmiş nəzəri biliklərlə onların əsasında izah oluna bilməyən yeni faktların arasında ziddiyyətin nəticəsi kimi müəyyənləşdirmək olar.

Əlbəttə, burada təlim probleminin qoyuluşu prosesinin özünəməxsus elə xüsu siyyətləri vardır ki, bunlar təlim prosesinin mahiyyəti ilə müəyyən olunur. Məsələn, təlim prosesində problemi şagirdin öz qarşısında qoyması və müəllim tərəfin dən şagirdin qarşısında qoyulması faktını xatırlamaq yerinə düşər. Burada şagird üçün yeni olan istənilən təlim materialının ziddiyyətlərə malik olması və materialın müəyyən şəraitdə şagird üçün problem kimi qoyula biləcəyi də unudulmamalıdır. Təlim materialın şagird qarşısında qoyulma formasından da çox şey asılıdır.

Aydındır ki, problemin optimal qoyuluşu və burada sualın irəli sürülməsi dərhal və birbaşa həyata keçən proses deyildir. Problemin qoyulması prosesində iki faza vardır: 1) problemi "görmək", aşkara çıxarmaq; 2) problem sualın özünün qoyuluşu.

Həm analitik, həm də evristik xarakterli fəaliyyət prosesində aşağıdakı formada suallar yaranır:

1) Başlanğıc ziddiyyətin yalnız bir tərəfini əks etdirən ümumi, qeyri-müəyyən sual forması;
2) Başlanğıc ziddiyyətin hər iki tərəfini əks etdirən konkret sual forması;
3) Başlanğıc ziddiyyətin hər iki tərəfinin keyfiyyətcə işlənilməsini və cavabın axtarış oblastının lokallaşmasını ehtiva edən sualın konkret keyfiyyət forması.

Təbii ki, istənilən bir problem mərkəzi sualdan və onun ətrafında qruplaşan suallardan ibarətdir.

Mərkəzi sualın formulə olunmasından əvvəl və ondan sonra qoyulan suallar qaçılmazdır. Birincisi problemin axtarışı prosesini, ikincisi isə problemin açılması prosesini xarakterizə edir. Problemin açılması prosesində suallar analitik və evristik fəaliyyət strukturuna istinad oluna bilər. Burada seçimin həm obyektiv, həm də subyektiv əsasları vardır.

Təlim probleminin qoyuluşunda bir sıra məntiqi qaydalar gözlənilməlidir. Bunlara aşağıdakıları aid etmək olar:

1. Müəllim unutmamalıdır ki, şagirdin öyrədiləcək materiallarla bilavasitə bağlı olan və problemin həllinin mənimsənilməsi üçün istifadə olunan keçmiş bilikləri aktuallaşdırılmalıdır. Bilik və fəaliyyət üsullarının aktuallaşdırılması ilə bağlı olan məlumlar və məlum olmayanlar ayırd edilməlidir, məlum olmayan lokallaşdırılmalıdır. Bunun üçün şagird məchulun lokallaşdırılması priyomlarını öyrənmə lidir.
2. Müəllim öz şagirdlərinin hazırlıq səviyyəsini bilməlidir. Müəllim şagirdin qarşısında istənilən problemi qoya bilməz, o yalnız elə problem qoymalıdır ki, onu şagird özünün problemi kimi qəbul edə bilsin.
3. Müstəqil həll üçün mümkün şərait aşkarlanmalıdır.

Əlbəttə, bunun üçün problemin tipinin və həll üsulunun müəyyənləşdirilməsi lazımdır. Onu həm müəllim, həm də şagird bacarmalıdır. Problemin tipinin müəllim tərəfindən müəyyən edilməsi ona görə lazım gəlir ki, o, a) onu düzgün qoysun; b) onun həllinin rasional variantını seçsin; c) problemin müstəqil həlli üzrə şagirdlərin fəaliyyətinin idarəolunma yollarını müəyyənləşdirsin. Şagird isə problemin tipini ona görə müəyyənləşdirməlidir ki, daha tez və daha rasional, səmərəli həllin üsul və priyomlarını tapsın.

Problemin həlli prosesinə şagird o andan başlayır ki, yaranmış problem situasiyasından ya özü problemi formulə edir, ya da müəllimin formuləsini qəbul edir və yaranmış problemin həlli yollarını müstəqil axtarır.

Müəllim və şagirdin problemi formulə etməsinin dəqiqliyindən asılı olaraq onun həlli müvəffəqiyyətli olur. Problemin şagirdin başında situasiyanın təhlilinin nəticəsi kimi yaranması, məlum və məchulların ayrılmasından asılı olur. Problemin qoyuluşu onun həllinin başlanğıcıdır. Həllin özü isə tədris-idrak fəaliyyətinin mərhələsidir: bu mərhələ problemli öyrənmənin mürəkkəb elementlərindən biri hesab olunur və bir neçə altmərhələ və halqalardan ibarətdir.

Didaktik arsenalda məsələ həllinin zəngin praktik təcrübəsi toplanmışdır. Məsələnin yaradıcı həllinin konkret qanunauyğunluğu axıra qədər formalaşdırıl masa da, psixoloqların tədqiqatlarından bəzi nəticələr əldə olunmuşdur. Müəllim məsələnin həllinin axtarılmasının həm analitik, həm də evristik yolunu öyrətməlidir. Problem həlli üçün alqoritmik və evristik məntiqlərin hər hansı biri təklikdə kifayət deyildir.

Verilmiş problem məsələlər sinfinə münasibətdə müəyyən həlledici təcrü bənin mövcudluğundan asılı olaraq V.N.Puşkin həllin üç növünün olması haqqında nəticəyə gəlmişdir. Məsələnin həlli üzrə keçmiş təcrübədə həlledici heç nəyin olma dığı hal birinci növə aid edilir. Bu halda subyekt sınaq və səhvi müəyyənetmə yolu ilə gedir (Pushkin, 1967: 189-190).

Hər bir insanda praktik olaraq problem həlli üçün müəyyən vərdişlər həyat və fəaliyyət prosesində yaranr. Ona görə də, hətta verilmiş tip məsələnin həlli ilə bağlı onun heç bir təcrübəsinin olmadığı halda belə, o, müəyyən mənada problemin həlli üzrə öz fəaliyyətini rüşeym halında olsa da, planlaşdıra bilir.

İkinci növ həllə elə vəziyyət şamil olunur ki, ona aid insanda formul, sxem və başqa növ təcrübə var. Həll prosesi burada tanıma formasında həyata keçir.

Üçüncü növ ondan ibarətdir ki, insanda müəyyən təcrübə var, amma bu təcrübə verilmiş problemin həlli üçün kifayət qədər deyildir. Burada həll prosesi ondan ibarətdir ki, məsələnin şərtinin təhlili əsasında əvvəlki fəaliyyət sxemində mövcud olmayan yeni bir şey yaradılır.

Təlim probleminin həlli prosesi onun planının tərtibinin zəruriliyini göstərir. Problemin həlli planın tərtibinə həll variantlarının seçilməsi də daxildir. İnsanın intellektual fəaliyyətində planların əhəmiyyətini təsdiq edən müəlliflər planın iki növünü fərqləndirirlər: sistematik və evristik. Sistematik planlar alqoritmlərlə eyniləşdirilir. Sistematik planlaşma məsələ həllinin müvəfəqiyyəti

üçün təminat vermə sinə baxmayaraq ondan insanlar həllin axtarışında həmişə istifadə etmir. Bu plan yeknəsəq fəaliyyət, başqa sözlə, eyni cür hərəkətlər çoxluğu tələb edir, bəzən də çox vaxt alır. Həllin bu növünün alternativi, bir çox hallarda səmərəliliyi məhz evristik axtarış yoludur (Zagvyazinskiy, 1978).

Problemin həm analitik, həm evristik həll yolu müəyyən dərəcədə keçmiş təcrübənin aktuallaşmasını nəzərdə tutur. Ona görə ki, problemli vəziyyət özündə üç əsas elementi cəmləşdirir: mənimsənilmiş biliklər, mənimsəmə prosesi, mənim sənilməli biliklər. Doğrudan da, problemin həlli yolu məhz bunlarla şərtlənir, fikrən və yazılı planlaşdırma situasiyanın bu gözlənilən elementlərini özünə daxil edir.

Həll planının tərtibi şagirdin qabağı görmək, sonrakı gedişi müəyyənləşdirmək bacarığından asılıdır. O, fikrən qabağa qaçır, ümumiyyətlə, problem həlli təcrübəsi əsasında öz fəaliyyət ardıcıllığını müəyyənləşdirir, nəticələri götür-qoy edir, qismən və ya tamamilə mövcud biliklərinə və ya intuisiyasına əsasən həll yolunu əldə etməyə çalışır. Belə irəli qaçma cəhdləri nəticəsində həll ideyası yaranır, fikrən əsaslandırılmış fərziyyə ortaya çıxır.

Hər bir şagird geriyə baxmağı, problemlərin daha aydın formulə olunmasını, həllin rasional variantını müəyyənləşdirməyi bacarmalıdır. Xüsusilə səhvləri təhlil etmək, fikrin bütün gedişi (inkişafı) prosesini tədqiq etmək faydalıdır. Unutmaq olmaz ki, sonuncu biliyin həqiqətə yönələn formalaşmış yolunun təyini deməkdir. Bunun sonrakı fəaliyyət mərhələsi, daha ümumi bilik və fəaliyyət üsullarının mənimsənilməsi üçün əhəmiyyəti danılmazdır.

***Tədqiqat işinin elmi-nəzəri yeniliyi və əhəmiyyəti***. 1) Təlimə sistem(məxsusi idrak prosesi və psixoloji təbiətli birgə fəaliyyət olmaqla) kimi yanaşılmaqla (L.Bertalinfin ideyasına və dialektikanın qolu qismində formalaşmış “sistem-struktur” təhlilə istinad olunmaqla) onun iki altsistemi fərqləndirilmiş, bunların təbiətlərinə aydınlıq gətirilmişdir; 2) Təlim sistemilə onun ehtiva etmiş olduğu altsistemlərin və təbiətlərinə aydınlıq gətirilən altsistemlərin öz aralarındakı dialek tikanın aşkarlanması bu proseslə bağlı pedaqoji fikrin və prosesin özünün təkmilləş dirilməsi nöqteyi-nəzərdən daha etibarlı və səmərəli yol kimi müəyyənləşdirilmiş dir; 3) Müəyyən olunmuşdur ki, təlim sistemində ehtiva olunan həmin altsistem lərinin dialektikası təhsilalanların əqli fəaliyyətlərinin analitik və evristik məntiqlə rinin vahidin tərəflərinə çevrilməsini şərtləndirir, hafizə və təfəkkür prosesləri səbəb-nəticə funksionallığını real hala gətirir, təhsilalanın dərrakəli və zəkalı fəaliyyəti gözlənilən nəticəyə yön almış olur.

## Nəticə

Təhsilalanların idraki hərəkət məntiqinə görə təlimin altsistemlərinin ayrılması təhsilin həyata keçirilməsi yolunun təkmilləşdirilməsinin variantlarından biri olmaqla yanaşı, bu alt sistemlərin ayrılması, təbiətlərinə aydınlıq gətirilməsi, bunların aralarında mövcud olanın məntiqi gözlənilmənin aşkarlanması təlim prosesinə aid pedaqoji fikrin və həmin prosesin özünün təkmilləşdirilməsinin daha etibarlı və səmərəli yoludur.

## Ədəbiyyat

1. Feyziyev, C.Ə., İbrahimov, F.N., Bədiyev, S.R. (2011). Didaktika (Dərs vəsaiti). Bakı: Mütərcim.
2. Makhmutov, M.I. (1972). Teoriya i praktika problemnogo obucheniya. Kazan.
3. İbrahimov, F.N. (2010). Ümumi pedaqogikadan mühazirələr. Bakı: Mütərcim.
4. Əhmədov, B.A., Rzayev, A.Q. (1993). Pedaqogikadan mühazirə konspektləri. Bakı: Maarif.
5. İbrahimov, F.N., Hüseynzadə, R.L. (2013). Pedaqogika (Dərslik). 2 cilddə, I cild. Bakı: Mütərcim.
6. Okon, V. (1968). Osnovy problemnogo obucheniya. M.: Prosveshcheniye.
7. Didaktika sredney shkoly. (1982). Pod redaktsiyey M.A.Danilova i M.N.Skatkina. M.: Pedagogika.
8. Həmzəyev, M.Ə. (1991). Pedaqoji psixologiya. Bakı: Maarif.
9. Paşayev, Ə.X., Rüstəmov, F.A. (2007). Pedaqogika. Bakı: Nurlan.

10. Məmmədli, L.A. (2022). Pedaqogika nəzəriyyəsi: Müntəxəbat (Dərs vəsaiti). Bakı: Mütərcim.
11. Mehrabov, A.O. (2012). Müasir təhsilin metodoloji problemləri. Bakı: Mütərcim.
12. Abbasov, A.N., Məmmədzadə, R.R., Məmmədli, L.A. (2021). Pedaqogika: Müntəxabat (Ali təhsil müəssisələri üçün dərs vəsaiti). Bakı: Mütərcim.
13. Pushkin, V.N. (1967). Evristika-nauka o tvorcheskom myshlenii M.: Uchpedgiz.
14. Zagvyazinskiy, V.I. (1978). O sovremennoy traktovke didakticheskikh printsipov. Sovetskaya pedagogika. №10.

Göndərilib: 09.01.2024 Qəbul edilib: 12.03.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/76-82

**Anar Hacızadə**
Azərbaycan Dövlət İqtisad Universiteti
magistrant
anar.hacizade56@gmail.com

# ÖLKƏMİZİN BANK SƏNAYESİNİN FƏALİYYƏTİNİN TƏNZİMLƏNMƏSİNDƏ MƏRKƏZİ BANKIN MONETAR SİYASƏTİ

**Xülasə**

Mərkəzi bankın həyata keçirdiyi pul siyasəti istənilən ölkədə bank sektorunun fəaliyyətinin tənzimlənməsində həlledici rol oynayır. O, inflyasiya, işsizlik və iqtisadi artım kimi iqtisadi dəyişənləri idarə etmək üçün güclü bir vasitə kimi xidmət edir.

Mərkəzi bankın pul siyasətinin əsas məqsədlərindən biri adətən konkret inflyasiya dərəcəsini hədəf alaraq qiymət sabitliyini qorumaqdır. Federal fondların dərəcəsi və ya uçot dərəcəsi kimi əsas faiz dərəcələrini tənzimləməklə mərkəzi bank banklar üçün borclanma xərclərinə təsir göstərə və nəticədə iqtisadiyyatda pul təklifinə nəzarət edə bilər. Faiz dərəcələrinin aşağı salınması borclanma və xərcləri təşviq edir, bu da iqtisadi fəallığı stimullaşdırır, lakin nəzarət edilmədikdə inflyasiyaya da səbəb ola bilər.

Bundan əlavə, mərkəzi bank bank sistemində likvidliyi idarə etmək üçün açıq bazar əməliyyatları (dövlət qiymətli kağızlarının alınması və ya satışı) və ehtiyat tələbləri kimi müxtəlif alətlərdən istifadə edir. Bu hərəkətlər kredit vermək üçün mövcud olan vəsaitin miqdarına təsir edir, kreditin yaradılmasına və ümumi iqtisadi fəaliyyətə təsir göstərir.

Bundan əlavə, mərkəzi bankın tənzimləyici rolu bank sənayesinin sabitliyinin və möhkəmliyinin təmin edilməsində mühüm əhəmiyyət kəsb edir. O, həddindən artıq leveraj, likvidlik çatışmazlığı və aktivlərin keyfiyyətinin pisləşməsi kimi riskləri azaltmaq üçün prudensial qaydalar müəyyən edir və banklara nəzarət edir. Bu qaydalar nəinki əmanətçiləri müdafiə edir, həm də ümumi maliyyə sabitliyinin qorunmasına töhfə verir.

Yekun olaraq qeyd edək ki, mərkəzi bankın pul siyasəti faiz dərəcələrini formalaşdırmaq, likvidliyi idarə etmək və normativlərə uyğunluğu təmin etməklə bank sektoruna əhəmiyyətli dərəcədə təsir göstərir. Onun effektivliyi inflyasiya təzyiqləri və maliyyə risklərini aradan qaldırarkən iqtisadi artım və sabitliyin təşviqi arasında ehtiyatlı tarazlıqdan asılıdır.

***Açar sözlər:*** *Azərbaycan, bank sənayesi, fəaliyyətinin tənzimlənməsi, Mərkəzi Bank, monetar siyasəti*

**Anar Hajizadeh**
Azerbaijan State University of Economics
master student
anar.hacizade56@gmail.com

## The monetary policy of the Central bank in regulating the activity of the banking industry of our country

**Abstract**

The monetary policy implemented by the central bank plays a decisive role in the regulation of the banking sector in any country. It serves as a powerful tool to manage economic variables such as inflation, unemployment and economic growth.

One of the main objectives of the central bank's monetary policy is to maintain price stability, usually by targeting a specific inflation rate. By adjusting key interest rates, such as the federal funds rate or the discount rate, a central bank can affect the cost of borrowing for banks and

ultimately control the money supply in the economy. Lowering interest rates encourages borrowing and spending, which stimulates economic activity, but can also lead to inflation if left unchecked.

In addition, the central bank uses various instruments to manage liquidity in the banking system, such as open market operations (buying or selling government securities) and reserve requirements. These actions affect the amount of funds available for lending, credit creation, and overall economic activity.

In addition, the central bank's regulatory role is critical in ensuring the stability and soundness of the banking industry. It sets prudential rules and supervises banks to reduce risks such as excessive leverage, lack of liquidity and deteriorating asset quality. These rules not only protect depositors, but also contribute to maintaining overall financial stability.

In conclusion, the central bank's monetary policy significantly affects the banking sector by shaping interest rates, managing liquidity, and ensuring regulatory compliance. Its effectiveness depends on a careful balance between promoting economic growth and stability while addressing inflationary pressures and financial risks.

***Keywords:*** *Azerbaijan, banking industry, activity regulation, Central Bank, monetary policy*

## Giriş

Pul siyasəti istənilən ölkənin iqtisadi mənzərəsinin formalaşmasında həlledici rol oynayır, onun təsirləri müxtəlif sektorlarda əks olunur, heç biri bank sektorundan daha vacib deyil. Mərkəzi Bank pul siyasətinin mühafizəçisi kimi bankların iqtisadiyyatda fəaliyyətinin tənzimlənməsində və idarə olunmasında mühüm təsirə malikdir. Bu esse Mərkəzi Bankın pul siyasətinin ölkəmizin bank sektoruna təsir və tənzimləməsinin çoxşaxəli yollarını araşdırır (Mou, 2011: 10).

Özündə pul siyasəti iqtisadiyyatda pul təklifinə, faiz dərəcələrinə və inflyasiya səviyyələrinə nəzarət etmək üçün Mərkəzi Bankın tətbiq etdiyi bir sıra alət və strategiyaları əhatə edir. Bu alətlər arasında açıq bazar əməliyyatları, ehtiyat tələbləri və standart faiz dərəcələrinin müəyyən edilməsi və digərləri daxildir. Bu mexanizmlər vasitəsilə Mərkəzi Bank qiymət sabitliyi, tam məşğulluq və davamlı iqtisadi artım kimi makroiqtisadi məqsədlərə nail olmağı hədəfləyir (Selim, 2020: 109).

Pul siyasətinin bank sektoruna təsirinin əsas yollarından biri faiz dərəcələrinin manipulyasiyasıdır. Mərkəzi bankın kredit dərəcəsi və ya uçot dərəcəsi kimi standart faiz dərəcələrini tənzimləməklə Mərkəzi Bank bankları borc pul götürməkdən həvəsləndirə və ya çəkindirə bilər. Faiz dərəcələrinin aşağı salınması kapitalın dəyərini azaltmaqla borclanmağı təşviq edir, bununla da investisiya və istehlakı stimullaşdırır. Əksinə, faiz dərəcələrinin artırılması borclanma və xərcləri azalda, inflyasiya təzyiqlərini cilovlaya bilər, lakin iqtisadi aktivliyi potensial olaraq yavaşlata bilər (Lomachynska, 2020: 8).

Bundan əlavə, Mərkəzi Bank bank sistemində likvidliyi idarə etmək üçün açıq bazar əməliyyatlarından istifadə edir. Mərkəzi Bank dövlət qiymətli kağızlarının alqı-satqısı yolu ilə bank sektorundan vəsait daxil edə və ya çıxara bilər. Bu da öz növbəsində bankların saxladığı ehtiyatlara və onların kredit vermək imkanlarına təsir edir. Bazarda likvidliyə nəzarət etməklə, Mərkəzi Bank ümumi kredit şərtlərinə təsir göstərə, borclanma xərclərinə və biznes və fiziki şəxslər üçün kreditin mövcudluğuna təsir göstərə bilər.

Bundan əlavə, Mərkəzi Bank tərəfindən müəyyən edilmiş ehtiyat tələbləri bankların öz depozitləri qarşısında saxlamalı olduğu minimum ehtiyat məbləğini diktə edir. Mərkəzi Bank bu tələbləri tənzimləməklə bankların kredit imkanlarına təsir göstərə bilər. Aşağı ehtiyat tələbləri kredit vermək üçün daha çox vəsait azad edir, potensial olaraq iqtisadi fəaliyyətə təkan verir, yüksək tələblər isə həddindən artıq kreditləşməni məhdudlaşdıra və sistem risklərini azalda bilər (Yu-hang, 2011: 54).

Bundan əlavə, Mərkəzi Bankın pul siyasəti mövqeyi investorların və əmanətçilərin bank sektoruna inamına böyük təsir göstərir. Etibarlı və effektiv pul siyasəti çərçivəsi maliyyə sisteminin sabitliyinə inamı artırır, əmanətləri və investisiyaları təşviq edir. Əksinə, pul siyasətindəki uyğunsuzluqlar və ya qeyri-müəyyənliklər bazarın dəyişkənliyinə və bank sektorunda pozuntulara səbəb ola bilər.

Yekun olaraq qeyd edək ki, Mərkəzi Bankın pul siyasəti bank sənayesinin fəaliyyətinin tənzimlənməsində əsas rol oynayır, kredit faizlərinə, likvidlik şərtlərinə, kreditlərin mövcudluğuna və ümumi maliyyə sabitliyinə təsir göstərir. Müxtəlif alətlər və strategiyalardan istifadə etməklə Mərkəzi Bank dayanıqlı iqtisadi artım üçün əlverişli mühiti gücləndirməklə yanaşı, makroiqtisadi məqsədlərinə nail olmağa çalışır. Ölkəmizin iqtisadiyyatının və maliyyə sisteminin dinamikasını dərk etmək üçün pul siyasəti ilə bank sektoru arasındakı mürəkkəb qarşılıqlı əlaqəni başa düşmək vacibdir.

**Ölkəmizin bank sənayesinin fəaliyyətinin tənzimlənməsində Mərkəzi bankın monetar siyasəti.**

Mərkəzi bankın pul siyasəti ölkənin bank sektorunun fəaliyyətinə dərindən təsir edən kritik amildir. Bu siyasət iqtisadi sabitliyin təmin edilməsi, inflyasiyanın nəzarətdə saxlanılması, işsizliyin azaldılması və maliyyə sistemində nizam-intizamın təmin edilməsi kimi mühüm məqsədlərə yönəlib.

Pul siyasətinin təsirlərinə aşağıdakılar daxildir:

Faiz dərəcələri və kredit şərtləri: Mərkəzi bankın faiz dərəcələrini təyin etmək səlahiyyəti bankların kredit və depozit faizlərinin müəyyən edilməsində həlledici rol oynayır. Aşağı faiz dərəcələri ümumiyyətlə kredit tələbini artırsa da, yüksək faiz dərəcələri kredit xərclərini artıra və tələbi məhdudlaşdıra bilər.

Likvidliyin idarə edilməsi: Pul siyasəti alətləri bankların likvidlik vəziyyətinə təsir göstərir. Mərkəzi bankın məcburi ehtiyat normaları və açıq bazar əməliyyatları bankların pul vəsaitlərinin hərəkətini və kreditləşmə qabiliyyətini müəyyən edə bilər.

Kredit bazarları və risklər: Mərkəzi bankın pul siyasəti qərarları kredit bazarlarında fəaliyyət göstərən bankların risk qavrayışına təsir edir. Aşağı faiz dərəcəsi mühiti ümumiyyətlə kreditə daha çox tələbatla nəticələnsə də, həddindən artıq kredit genişlənməsi riskləri artıra və maliyyə sabitliyini təhdid edə bilər. Mərkəzi bankın pul siyasəti bank sektorunun gəlirliliyi, kredit şərtləri, likvidliyin idarə edilməsi və risklərin idarə edilməsi kimi sahələrdə mühüm rol oynayır. Bu siyasətin balanslaşdırılmış şəkildə həyata keçirilməsi iqtisadi artımı dəstəkləyərkən maliyyə sabitliyinə töhfə verə bilər. Mərkəzi Bankın bu istiqamətdə fəaliyyəti "Azərbaycan Respublikasının Mərkəzi Bankı haqqında" Qanunla tənzimlənir. Pul siyasəti Mərkəzi Bankın əsas məqsədi olan qiymət sabitliyini təmin etmək üçün həyata keçirilən tədbirlər sistemidir (Lin, 2012: 7).

Pul siyasətinin məqsədinə nail olmaq üçün Mərkəzi Bank pul siyasəti alətlərindən istifadə edir. Mərkəzi Bank sərəncamında olan pul siyasəti alətləri vasitəsilə pul kütləsinə, məzənnəyə və faiz dərəcələrinə təsir göstərməklə son məqsədinə nail olmağa çalışır. Pul siyasəti ilə bağlı adekvat qərarlar qəbul etmək üçün Mərkəzi Bank ölkədə makroiqtisadi vəziyyəti daim təhlil edir və proqnozlaşdırır. Mərkəzi Bankın kollegial idarəetmə orqanı olan Pul Siyasəti və Maliyyə Sabitliyi Komitəsində və İdarə Heyətində makroiqtisadi vəziyyət mütəmadi olaraq müzakirə edilir və bu müzakirələr əsasında pul siyasəti ilə bağlı qərarlar qəbul edilir. Qərarlar Mərkəzi Bankın kommunikasiya vasitələri, o cümlədən press-relizlər vasitəsilə ictimaiyyətə elan edilir.

Mərkəzi Bank gələn il (həmçinin ortamüddətli dövr) üçün pul siyasətinin əsas istiqamətləri haqqında bəyanat hazırlayır və dərc edir. Sənəddə cari ildə makroiqtisadi siyasət çərçivəsi, həyata keçirilən pul-kredit siyasətinin nəticələri, növbəti il üçün müəyyən edilmiş pul-kredit siyasətinin məqsəd və vəzifələri, onların həyata keçirilməsi yolları, eləcə də ortamüddətli siyasət istiqamətləri göstərilir.Mərkəzi Bank makroiqtisadi vəziyyət və həyata keçirilən pul siyasəti haqqında məlumatların geniş oxucu kütləsinə çatdırılması məqsədilə rüblük olaraq Pul Siyasəti İcmalı hazırlayır və ictimaiyyətə açıqlayır (ARMB, 2024: 1).

Dünya miqysaında baxdığımızda isə qeyd etməliyik ki, mərkəzi banklar pul siyasətindən iqtisadi dalğalanmaları idarə etmək və qiymət sabitliyinə nail olmaq üçün istifadə edirlər ki, bu da inflyasiyanın aşağı və sabit olması deməkdir. Bir çox inkişaf etmiş iqtisadiyyatların mərkəzi bankları açıq inflyasiya hədəfləri təyin edir. Bir çox inkişaf etməkdə olan ölkələr də inflyasiya hədəflənməsinə keçir. Mərkəzi banklar pul siyasətini adətən açıq bazarda qiymətli kağızların alınması və ya satılması yolu ilə pul təklifini tənzimləməklə həyata keçirirlər. Açıq bazar

əməliyyatları qısamüddətli faiz dərəcələrinə təsir edir ki, bu da öz növbəsində uzunmüddətli dərəcələrə və iqtisadi fəaliyyətə təsir göstərir. Mərkəzi banklar faiz dərəcələrini aşağı saldıqda, pul siyasəti yumşaldır. Onlar faiz dərəcələrini qaldıranda pul siyasəti sərtləşir.

2007-ci ildə başlayan qlobal maliyyə böhranından sonra qabaqcıl iqtisadiyyatların mərkəzi bankları qısamüddətli dərəcələr sıfıra yaxınlaşana qədər faiz dərəcələrini azaldaraq pul siyasətini yumşaltdılar və əlavə ixtisarlar üçün variantları məhdudlaşdırdılar. Bəzi mərkəzi banklar qeyri-ənənəvi pul siyasətindən istifadə edərək, uzunmüddətli dərəcələri daha da aşağı salmaq üçün uzunmüddətli istiqrazlar alıblar. Bəziləri hətta qısamüddətli dərəcələri sıfırdan aşağı götürdülər. COVID-19 pandemiyasına cavab olaraq mərkəzi banklar pul siyasətini yumşaltmaq, bazarlara likvidlik təmin etmək və kredit axınını saxlamaq üçün tədbirlər gördü. Valyuta və istiqraz bazarlarında stressi azaltmaq üçün bir çox inkişaf etməkdə olan bazar mərkəzi bankları valyuta müdaxilələrindən və ilk dəfə olaraq aktivlərin alış proqramlarından istifadə etdilər. Bu yaxınlarda, sürətlə artan inflyasiyaya cavab olaraq, bütün dünya üzrə mərkəzi banklar faiz dərəcələrini artırmaqla pul siyasətini sərtləşdirdilər (Shijun, 2012: 12).

Ölkənin pul siyasəti onun məzənnə rejimi ilə sıx bağlıdır. Ölkənin faiz dərəcələri onun valyutasının dəyərinə təsir edir, buna görə də sabit məzənnəyə malik olanlar, çevik məzənnəyə malik olanlarla müqayisədə müstəqil pul siyasəti üçün daha az imkana malik olacaqlar. Tam çevik məzənnə rejimi effektiv inflyasiya hədəfləmə çərçivəsini dəstəkləyir.

2007-2009-cu illərin qlobal maliyyə böhranı göstərdi ki, ölkələr bütövlükdə maliyyə sistemi üçün riskləri müəyyən etməli və məhdudlaşdırmalıdırlar. Bir çox mərkəzi banklar maliyyə sabitliyini təşviq etmək üçün prudensial alətlərdən istifadəni qəbul etmiş və makroprudensial siyasət çərçivələri yaratmışlar. Makroprudensial alətlər buferlər yaratmaq və maliyyə sistemini şoklara həssas edən zəiflikləri ehtiva etmək üçün istifadə olunur (Liang, 2011: 5). Bu, maliyyə sisteminə şokların maliyyə xidmətlərinin göstərilməsini pozması və iqtisadiyyat üçün ciddi mənfi nəticələrə səbəb olması ehtimalını azaldır. Mərkəzi banklar makroprudensial siyasət aparmaq üçün yaxşı mövqedədirlər, çünki onlar sistem riskini təhlil edə bilirlər və çox vaxt nisbətən müstəqil və avtonom olurlar. Müstəqillik və muxtariyyət vacibdir, çünki makroprudensial siyasətə cavabdeh olan qurum siyasi təzyiqlərə və sənaye qruplarının müxalifətinə tab gətirə bilməlidir.

BVF-nin mərkəzi bankların effektivliyinin artırılmasında iştirakının müxtəlif aspektlərini ümumiləşdirən məlumatları bu cür təqdim edə bilərik:

| BVF İştirakının Aspekti | Təsvir |
|---|---|
| **Siyasət Məsləhəti** | Pul və makroprudensial siyasətlər, habelə konkret siyasət tədbirləri üçün effektiv çərçivələrin yaradılması üzrə məsləhətlər verir. |
| **Maliyyə Nəzarəti** | Maliyyə sistemlərini qiymətləndirmək və sabitlik risklərini idarə etmək üçün Maliyyə Sektorunun Qiymətləndirilməsi Proqramı (FSAP) vasitəsilə qiymətləndirmələr aparır. |
| **Texniki yardım** | Ölkələrə pul siyasəti, valyuta məzənnələri və mərkəzi bank əməliyyatları kimi sahələrdə institutların, qanunvericilik bazalarının və potensialın inkişaf etdirilməsinə kömək edir. |
| **Mərkəzi Bankın şəffaflığı** | Mərkəzi Bankın Şəffaflıq Məcəlləsi (MBŞ) vasitəsilə mərkəzi banklara şəffaflıq təcrübələri üzrə rəhbərlik edir və şəffaflıq səviyyələrini qiymətləndirmək üçün təhlillər aparır. |
| **Məlumatların toplanması** | Pul siyasətinin tənzimlənməsi (AREAER), mərkəzi bankın qanunvericilik bazaları (CBLD), makroprudensial tədbirlər, müdaxilələr və s. haqqında məlumat bazalarını saxlayır. |
| **Tədqiqat Dəstəyi** | Siyasət işlənməsi, tədqiqat və siyasət effektlərinin ölçülməsi üçün məlumat və verilənlər bazası təmin edir (məsələn, iMaPP, CBID). |

**Mənbə: IMF, 2024: 1-3**

Yekun olaraq qeyd edək ki, Beynəlxalq Valyuta Fondu (BVF) bütün dünyada mərkəzi bankların effektivliyinin təşviqində mühüm rol oynayır. Siyasət üzrə məsləhətlər, maliyyə nəzarəti, texniki yardım, mərkəzi bankın şəffaflıq qaydaları və məlumatların toplanması kimi müxtəlif vasitələrlə BVF möhkəm pul-kredit və makroprudensial siyasət çərçivələrini inkişaf etdirməkdə ölkələrə yardım edir (Li, 2016: 2). Bu mövzunu inkişaf etdirmək, qiymətləndirmələri təmin etmək və potensialın yaradılması və tədqiqat üçün resurslar təklif etməklə BVF qlobal miqyasda mərkəzi bank əməliyyatlarının, maliyyə sabitliyinin və ümumi iqtisadi idarəetmənin gücləndirilməsinə əhəmiyyətli töhfə verir.

## Nəticə

Mərkəzi Bankın pul siyasəti Azərbaycanda bank sektorunun tənzimlənməsində həlledici rol oynayır. Mərkəzi Bank özünün müxtəlif alətləri və strategiyaları vasitəsilə makroiqtisadi sabitliyə nail olmaq, dayanıqlı iqtisadi artımı təşviq etmək və maliyyə sisteminin sabitliyini təmin etmək məqsədi daşıyır. Pul siyasətinin bank sektorunun tənzimlənməsində effektivliyini bir neçə əsas istiqamət üzrə müşahidə etmək olar (Beynəlxalq əməkdaşlıq, 2024).

Birincisi, Mərkəzi Bank iqtisadiyyatda borclanma və kreditləşmənin dəyərinə təsir göstərmək üçün faiz dərəcələrindən əsas alət kimi istifadə edir. Yenidən maliyyələşdirmə dərəcəsi və uçot dərəcəsi kimi siyasət dərəcələrini tənzimləməklə Mərkəzi Bank bankları kreditləşdirməyə həvəsləndirə və ya çəkindirə, bununla da pul kütləsinə nəzarət edə və iqtisadi fəaliyyətə təsir göstərə bilər. Faiz dərəcələrinin aşağı salınması borclanma və investisiyaları stimullaşdıra bilər ki, bu da bank sektorunda iqtisadi artımın və kredit ekspansiyasının artmasına səbəb olur. Əksinə, faiz dərəcələrinin artırılması inflyasiya təzyiqlərini cilovlaya və bankların həddən artıq risk almasının qarşısını ala bilər.

İkincisi, Mərkəzi Bank bankların likvidlik mövqeyini tənzimləmək üçün məcburi ehtiyat normalarından istifadə edir. Banklara əmanətlərinin müəyyən faizini ehtiyat kimi saxlamağa məcbur etməklə, Mərkəzi Bank kredit vermək üçün mövcud olan pul miqdarına nəzarət edə bilər. Ehtiyat tələblərinin tənzimlənməsi bankların kredit vermək qabiliyyətinə təsir edə bilər və bank sistemində likvidliyin idarə edilməsi üçün istifadə edilə bilər. Daha yüksək ehtiyat tələbləri maliyyə sabitliyinə töhfə verən həddindən artıq kreditləşməni və spekulyativ fəaliyyətləri məhdudlaşdıra bilər (Hu, 2014: 11).

Bundan əlavə, Mərkəzi Bank likvidliyi idarə etmək və faiz dərəcələrinə təsir etmək üçün açıq bazar əməliyyatları (OMO) ilə məşğul olur. Açıq bazarda dövlət qiymətli kağızlarını alqı-satqı yolu ilə Mərkəzi Bank likvidliyi bank sisteminə daxil edə və ya çıxara bilər. Bu alət Mərkəzi Banka qısamüddətli faiz dərəcələrini dəqiq tənzimləməyə və bazarda likvidlik balanssızlığını aradan qaldırmağa imkan verir və bununla da bank sənayesinin ümumi sabitliyini dəstəkləyir.

Bundan əlavə, Mərkəzi Bank bankların sağlamlığını və prudensial normalara uyğunluğunu təmin etmək üçün onlara nəzarət və tənzimləmədə mühüm rol oynayır. Tənzimləyici standartlar müəyyən etməklə, yoxlamalar aparmaqla və kapitalın adekvatlığına dair tələblər qoymaqla Mərkəzi Bank təhlükəsiz və dayanıqlı bank sektorunu təşviq edir. Effektiv nəzarət kredit riski, likvidlik riski və əməliyyat riski kimi riskləri azaltmağa, əmanətçilərin vəsaitlərini qorumağa və əhalinin bank sisteminə inamını qorumağa kömək edir.

Yekun olaraq qeyd edək ki, Azərbaycan Mərkəzi Bankı tərəfindən həyata keçirilən pul siyasəti çərçivəsi bank sektorunun fəaliyyətinin tənzimlənməsində mühüm rol oynayır. Faiz dərəcələrinin tənzimlənməsi, ehtiyat tələbləri, açıq bazar əməliyyatları və tənzimləyici nəzarətdən istifadə etməklə Mərkəzi Bank maliyyə sabitliyinə nail olmağa, iqtisadi artımı dəstəkləməyə və sağlam bank sektorunu qorumağa çalışır. Mərkəzi Bankın öz mandatını səmərəli şəkildə yerinə yetirməsi və Azərbaycan iqtisadiyyatında davamlı inkişafı təşviq etməsi üçün davamlı sayıqlıq, dəyişən iqtisadi şəraitə uyğunlaşma və digər siyasət tədbirləri ilə əlaqələndirmə vacibdir.

Bundan əlavə, Azərbaycan Mərkəzi Bankı bank sektorunda maliyyə inklüzivliyinin və inkişafın təşviqində mühüm rol oynayır. Maliyyə savadlılığı proqramları, az xidmət göstərən icmalarla əlaqə və kiçik və orta müəssisələrə (KOB) dəstək kimi təşəbbüslər vasitəsilə Mərkəzi Bank daha inklüziv

maliyyə sistemini təşviq edir. Mərkəzi Bank bank xidmətlərinə çıxış imkanlarını artırmaqla, məsuliyyətli kreditləşdirmə təcrübələrini təşviq etməklə və maliyyə texnologiyalarında innovasiyaları təşviq etməklə, iqtisadi imkanların gücləndirilməsinə və yoxsulluğun azaldılmasına töhfə verir.

Bundan əlavə, Mərkəzi Bankın pul siyasəti qərarları qiymət sabitliyi, məzənnənin idarə edilməsi və xarici tarazlıq da daxil olmaqla daha geniş iqtisadi məqsədlərlə sıx uyğunlaşdırılır. Mərkəzi Bank inflyasiya, məşğulluq səviyyəsi və tədiyyə balansı kimi makroiqtisadi göstəriciləri nəzərə alaraq, sabit və rəqabətqabiliyyətli bank sektorunu qoruyub saxlayaraq, davamlı iqtisadi artımı dəstəkləyən siyasətlər formalaşdırır (2024-2026-cı illərdə maliyyə sektorunun inkişaf Strategiyası, 2024).

## Nəticə

Son illərdə Azərbaycan Mərkəzi Bankı da pul siyasəti çərçivəsində şəffaflığın, kommunikasiyanın və hesabatlılığın artırılmasına diqqət yetirmişdir. Siyasət məqsədləri üzrə aydın təlimatlar verməklə, qərarları maraqlı tərəflərə effektiv şəkildə çatdırmaqla və bazar iştirakçıları ilə dialoqu inkişaf etdirməklə Mərkəzi Bank öz fəaliyyətlərinin etibarlılığını gücləndirir və maliyyə sisteminə etimadı artırır.

Gələcəyə nəzər salsaq, Mərkəzi Bank bank sektorunu tənzimləməkdə davam edən problemlər və imkanlarla üzləşir. Bunlara texnoloji irəliləyişlərə uyğunlaşma, kibertəhlükəsizlik təhdidləri kimi yaranan risklərin həlli və qlobal iqtisadi qeyri-müəyyənliklərin idarə edilməsi daxildir. Dövlət qurumları, beynəlxalq təşkilatlar və sənaye maraqlı tərəfləri ilə birgə səylər bu problemlərin həllində və Azərbaycanda dayanıqlı iqtisadi inkişafı dəstəkləyən davamlı və dinamik bank sektorunun təşviqində mühüm əhəmiyyət kəsb edəcək.

## Ədəbiyyat

1. Mou, L. (2011). The study of the effectiveness of China's monetary policy — Conduction from intermediatetarget to the ultimate goal. In 2011 2nd International Conference on Artificial Intelligence, Management Science and Electronic Commerce (AIMSEC). IEEE.
2. Selim, M. (2020). Countercyclical monetary policy for overcoming COVID 19 induced recession by introducing incentive based digital currency. In 2020 International Conference on Data Analytics for Business and Industry: Way Towards a Sustainable Economy (ICDABI). IEEE.
3. Lomachynska, I. (2020). Infocommunication Tools of Unconventional Monetary Policy. In 2020 IEEE International Conference on Problems of Infocommunications. Science and Technology (PIC S&T). IEEE.
4. Yu-hang, Z. (2011). The slowdown of China's monetary velocity: A viewpoint from both short time and long time. In 2011 International Conference on E-Business and E-Government (ICEE). IEEE.
5. Lin, L. (2012). Literature Review of Monetary Policy Transmission. In 2012 Second International Conference on Business Computing and Global Informatization. IEEE.
6. ARMB. (2024). Pul siyasəti. URL: https://www.cbar.az/page-11/monetary-policy
7. Shijun, Z. (2012). Research on Asymmetric Response of Overinvestment to Monetary Policy. In 2012 Second International Conference on Business Computing and Global Informatization. IEEE.
8. Liang, Y. (2011). The research on the impact of capital requirements on credit channel of monetary policy. In 2011 2nd International Conference on Artificial Intelligence, Management Science and Electronic Commerce (AIMSEC). IEEE.
9. IMF. (2024). URL: https://www.imf.org/en/About/Factsheets/Sheets/2023/monetary-policy-and-central-banking
10. Li, X.M. (2016). Modeling and Simulation of Central Bank Independence Coordination Mechanism. In 2016 International Conference on Robots & Intelligent System (ICRIS). IEEE.
11. Beynəlxalq əməkdaşlıq. (2024). URL: https://www.cbar.az/page-68/international-cooperation

12. Hu, R. (2014). Financial market reaction to China's monetary policy communication: Does the crisis make a difference? In 2014 International Conference on Management Science & Engineering 21th Annual Conference Proceedings. IEEE.
13. 2024-2026-cı illərdə maliyyə sektorunun inkişaf Strategiyası. (2024). URL: https://www.cbar.az/pages/strategy

Göndərilib: 28.01.2024 Qəbul edilib: 24.03.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/83-97

**Yuxuan Tang**
Xəzər Universiteti
magistrant
yuxuan.tang2022@khazar.org

# AZƏRBAYCAN DİLİNDƏKİ YİYƏLİK HALIN ÇİN DİLİNDƏ İFADƏ VASİTƏSİ


## Xülasə

Azərbaycan dilində hal kateqoriyası var. Çin dili isə kök dil olduğuna görə qrammatik kateqoriya yoxdur və hal anlayışı da yoxdur, amma hal kateqoriyasının ifadə vasitəsi var. Azərbaycan dilində yiyəlik halın iki növü var: müəyyən yiyəlik hal və qeyri-müəyyən yiyəlik hal. Azərbaycan dilində müəyyən yiyəlik hal ***-ın***$^{4}$ şəkilçisi ilə düzəlir və Çin dilində müəyyən yiyəlik halı ifadə etmək üçün *的 (de)* hissəciyi işlənir.

Çin dilində yiyəlik hallı sözdən sonra ümumi əşyaları bildirən sözlər gəldikdə onların arasına *的 (de)* hissəciyi artırılır.

Çin dilində yiyəlik hallı sözdən sonra qohumluq bildirən sözlər işləndikdə, və ya bu birləşmə bütöv və hissə arasındakı əlaqə bildirəndə, onların arasında *的 (de)* hissəciyi işlənə də bilər, işlənməyə də bilər.

Çin dilində yiyəlik hallı söz şəxs bildirir və mənsub olan söz insana aid əzaları - bədən üzvlərini bildirirsə, *的 (de)* hissəciyi həmişə işlənməlidir.

*的 (de)* hissəciyinin istifadə edilib-edilməməsi başqa amillərdən də asılıdır, məsələn: sözlərin mənasının düzgün və aydın çatdırılması məsələsi, heca məsələsi və s. Çin dilində müəyyən və ya qeyri-müəyyən yiyəlik halın istifadəsi heca ilə sıx bağlıdır.

Bu məqalədə yiyəlik halın Çin dilində ifadə vasitələri azərbaycanlı oxuculara təqdim edilir. Bundan başqa, Azərbaycan dilində yiyəlik hal və Çin dilində onun ifadə vasitəsi arasında oxşar və fərqli cəhətlər tədqiq edilir.


***Açar sözlər:*** *Çin dili, yiyəlik hal, müəyyən, qeyri-müəyyən, hissəcik*

**Yuhuan Tang**
Khazar University
master student
yuxuan.tang2022@khazar.org

## The Chinese expression of Azerbaijani possessive case


## Abstract

There is a case category in the Azerbaijani language. Since Chinese is a root language, there is no grammatical category and there is no concept of case in Chinese, but the case category has a means of expression. There are two types of possessive case in Azerbaijani language: definite possessive case and indefinite possessive case. The definite possessive case is formed with the affix ***-ın***$^{4}$ in Azerbaijani, and the particle *的 (de)* is used to express the definite possessive case in Chinese.

If the possessive word is followed by words denoting common objects in Chinese, the particle *的 (de)* is added between them.

If the possessive word is followed by the kinship terms, or if the phrase expresses a relationship between the whole and its parts in Chinese, the particle *的 (de)* may or may not be used between them.

If the possessive word refers to a person and the genitive word represents a human organ in Chinese, the particle *的 (de)* is always used.

Whether or not the particle *的 (de)* is used depends on other factors as well, for example: correctly and clearly conveying of the meaning of the words, syllables, etc. The use of the definite or indefinite possessive case is closely related to the syllable in Chinese.

The mean of expressing the possessive case in Chinese is presented to Azerbaijani readers in this essay. In addition, similarities and differences between the possessive case in Azerbaijani and its means of expression in Chinese are studied.

***Keywords:*** *Chinese, possessive case, definite, indefinite, particle*

## Giriş

Azərbaycan və Çin dili müxtəlif tipoloji dil ailəsinə mənsubdur. Çin dili Çin-Tibet dil ailəsinin ən böyük dilidir və dünyada ən çox istifadə olunan dillərdən biri sayılır. Azərbaycan dili Türk dilləri ailəsinin Oğuz qrupuna aiddir. Çin dili kök dildir,Azərbaycan dili isə aqlütinativdir.

Müasir Çin dili qrammatikasının ümumi xarakteri ondan ibarətdir ki, birincisi, morfoloji dəyişiklik zəngin deyil (Yang, 2011: 8); ikincisi, qrammatik əlaqələri və mənaları ifadə etmək üçün söz sırası və köməkçi nitq hissələri kimi qrammatik vasitələrdən istifadə olunur (Yang, 2011: 9). Məsələn:

1. 我问他 (wǒ wèn tā) “mən ondan soruşuram” və 他问我 (tā wèn wǒ) “o məndən soruşur”, üç kök morfem tam eynidir, yalnız söz sırasının dəyişməsi ilə semantika tamamilə fərqlənir.

2. 上海大学 (shàng hǎi dà xué) “Şanxay Universiteti” çindəki bir universitetin adıdır. Bu birləşməyə köməkçi vasitə olan*的 (de)* hissəciyinin əlavə olunması ilə 上海的大学 (shàng hǎi de dà xué) birləşmənin mənası dəyişir və Şanxaydakı 60-dan çox universiteti bildirir.

Həm Azərbaycan, həm də Çin dilində nitq hissələri iki yerə bölünür: əsas nitq hissələri və köməkçi nitq hissələri. Azərbaycan dilində altı əsas nitq hissəsi (isim, sifət, say, əvəzlik, feil, zərf) və beş köməkçi nitq hissəsi (qoşma, bağlayıcı, ədat, modal sözlər, nida) var.

Çin dilində əsas nitq hissələri isim, feil, sifət, say, zərf, əvəzlikdən başqa, fərqləndirici söz, numerativ söz, xüsusi onomatopoetik sözlər, nidadan ibarətdir. Çin dilində köməkçi nitq hissələri ön söz, bağlayıcı, köməkçi söz, modal sözdən ibarətdir (Huang, Liao, 2017: 8).

Çin dilində numerativ söz çox zəngindir. İsmi və feili numerativ söz olur. İsmi numerativ söz insanlar və əşyalar üçün hesablama vahidini ifadə edir (Huang, Liao, 2017: 16). Məsələn: 一个人 (yī gè rén) “bir nəfər adam”, 两只猫 (liǎng zhī māo) “iki dənə pişik”, 三匹马 (sān pǐ mǎ) “üç dənə at”, feili numerativ söz hərəkətlərin sayını və onların baş verdiyi ümumi vaxtı bildirir (Huang, Liao, 2017: 16). Məsələn: 看五次 (kàn wǔ cì) “beş dəfə baxmaq”, 住了三年 (zhù le sān nián) “üç il yaşamaq”, 来了两趟 (lái le liǎng tàng) “iki dəfə gəlmək”.

Çin dilində Azərbaycan dilindən fərqli olaraq, fərqləndirici sözlər və köməkçi söz var. Çin dilində fərqləndirici söz həmişə cüt-cüt özünü göstərir, məsələn, kişi: qadın, dövlət: özəl, qızıl: gümüş, böyük: orta: kiçik, mülki: hərbi.

Çin dilində feili sifət, feili bağlama qrammatik anlayışı yoxdur.

Azərbaycan dilində ismin tərifi və ismə məxsus xüsusiyyətlər bunlardır: Əşya adı bildirən sözlərə isim deyilir. Məlumdur ki,《əşya》dedikdə maddi varlıq, obyektiv aləmdəki konkret cisimlər, gözlə görünən, əllə toxunula bilən şeylər nəzərdə tutulur. İsim xüsusi və ümumi, konkret

və mücərrəd olur. İsim cəmlənir, hallanır, mənsubiyyət şəkilçiləri qəbul edərək dəyişir, şəxs (xəbərlik) şəkilçisi qəbul edir (Kazımov, 2010: 42).

İsmin hal dəyişmələrinin dildə böyük rolu var. İsmin hal dəyişmələri çox qədim tarixi olan prosesdir. Hal şəkilçiləri bu günə qədər çox uzun inkişaf yolu keçmişdir (Kazımov, 2010: 61). Hal dəyişmələri isimlərin xarakter morfoloji xüsusiyyətidir. Müasir Azərbaycan dilində ismin halları altıdır: adlıq hal, yiyəlik hal, yönlük hal, təsirlik hal, yerlik hal və çıxışlıq hal (Kazımov, 2010: 62).

Çin dilində insan, əşya, zaman və yer adı bildirən sözlərə isim deyilir. Çin dilində ismə məxsus xüsusiyyətlər aşağıdakılardır (Huang, Liao, 2017: 9).

1. Xüsusi və ümumi isim olur. Məs: 中国 (zhōng guó) "Çin", 阿塞拜疆 (ā sài bài jiāng) "Azərbaycan", 尼扎米·占贾维 (ní zhā mǐ · zhàn jiǎ wéi) "Nizami Gəncəvi" və s.

2. Ümumi isim dörd yerə bölünür: fərdi və toplu isim, konkret və mücərrəd isim.

| Çin dilində və onun tələffüzü | Azərbaycan dilində tərcümə |
|---|---|
| Təklik bildirən isimlər | 人 (rén) "adam", 鸟 (niǎo) "quş", 牛 (niú) "inək", 马 (mǎ) "at" , 书 (shū) "kitab", 朋友 (péng yǒu) "dost", 桌子 (zhuō zi) "stol", 作家 (zuò jiā) "yazıçı" , 学生 (xué shēng) "tələbə" , 飞机 (fēi jī) "təyyarə", 原子 (yuán zǐ) "atom" |
| Topluluq bildirən isimlər | 人民 (rén mín) "xalq" , 人口 (rén kǒu) "əhali", 群众 (qún zhòng) "camaat" , 物品 (wù pǐn) "əşya" , 马匹 (mǎ pǐ) "ilxı" |
| konkret isimlər | 水 (shuǐ) "su" , 电 (diàn) "elektrik" , 风 (fēng) "külək" , 雨 (yǔ) "yağış" , 蔬菜 (shū cài) "tərəvəz" , 水果 (shuǐ guǒ) "meyvə" , 阳光 (yáng guāng) "günəş şüası" |
| mücərrəd isimlər | 想法 (xiǎng fǎ) "fikir", 文化 (wén huà) "mədəniyyət" , 情况 (qíng kuàng) "vəziyyət", 因素 (yīn sù) "amil" , 愿望 (yuàn wàng) "arzu", 困难 (kùn nán) "çətinlik" |

3. Zaman bildirən isimlər. Məs: 春天 (chūn tiān) "yaz", 晚上 (wǎn shàng) "axşam", 现在 (xiàn zài) "indi", 昨天 (zuó tiān) "dünən", 去年 (qù nián) "keçən il", 明年 (míng nián) "gələn il" və s. Azərbaycan dilində bu sözlərin bəziləri zaman zərfləri, bəziləri isə I növ təyini söz birləşməsi kimi götürülür.

4. Yer bildirən isim. Məs: 河岸 (hé àn) "çayın sahili", 周围 (zhōu wéi) "ətraf", 西郊 (xī jiāo) "qərb şəhərətrafı", 里屋 (lǐ wū) "daxili otaq" və s. Azərbaycan dilində belə nümunələrin əksəriyyəti təyini söz birləşməsi olur.

Onu da qeyd etmək lazımdır ki, Çin dilində 巴库 "Bakı", 北京 "Pekin", 亚洲 "Asiya", 欧洲 "Avropa" və s. həm xüsusi, həm də yer bildirən isimdir. Azərbaycan dilində isə bunlar xüsusi isimlərdir.

5. İstiqamət-yönəlmə bildirən isimlər. Məs: 前 (qián) “irəli”, 后 (hòu) “geri”, 左 (zuǒ) “sol”, 右 (yòu) “sağ”, 之上 (zhī shàng) “yuxarı”, 以下 (yǐ xià) “aşağı” və s. Azərbaycan dilində belə sözlər yer zərfləridir.

Çin dilində qrammatik kateqoriya yoxdur və hal anlayışı da yoxdur, amma hal kateqoriyasının ifadə vasitəsi var.

Qeyd etmək istərdik ki, Azərbaycan oxucularına məqalədəki nümunələr daha yaxşı aydın olmaq üçün biz tərcümə edərkən semantik mənaya əsaslanan tərcüməyə üstünlük vermişik, yəni mənsubiyyət şəkilçilərini qeyd etmişik. Məsələn: “树根” (shù gēn) hərfi tərcümə “ağac kök” və semantik mənaya görə tərcümə isə “ağac kökü” dür.

Bu məqalədə Azərbaycan dilindəki yiyəlik halın Çin dilində ifadə vasitəsi azərbaycanlı oxuculara təqdim edilir. Bundan başqa, Azərbaycan dilində yiyəlik hal və Çin dilində onun ifadə vasitəsi arasında oxşar və fərqli cəhətlər tədqiq olunur.

Çin dilini öyrənən azərbaycanlılar üçün *的 (de)* hissəciyinin nə vaxt istifadə edilib-edilməməsini bilmək vacibdir. Azərbaycan dilini öyrənən çinlilər üçün ismin hallanması çox əhməiyyətli mövzudur. Məsələn: Azərbaycan dilində müəyyən yiyəlik hal nə vaxt işlənir, qeyri-müəyyən yiyəlik hal nə vaxt işlənir? Tələbələr əcnəbi dili öyrənəndə həmişə ana dilinin inteqrasiyasına məruz qalır.

Yiyəlik hal tam qrammatik haldır (Hüseynzadə, 2007: 48). İsmin yiyəlik halı yiyəlik, sahiblik, aidlik bildirir. Bu münasibət özünü sahib şəxslə mənsub əşya arasında və ya müxtəlif əşyalar, şəxslər arasında göstərir və ona görə də yiyəlik halda olan sözlər, adətən, söz birləşməsi tərkibində işlənir (Kazımov, 2010: 64).

Yiyəlik hallı isimdən sonra, adətən, mənsubiyyət şəkilçili söz gəlir və söz birləşməsi yaranır (Kazımov, 2010: 68). Bu cür söz birləşməsinin birinci tərəfi yiyəlik (sahiblik), ikinci tərəfi isə mənsubluq (aidlik) bildirir.

Yiyəlik hal iki növə bölünür: müəyyən yiyəlik hal və qeyri-müəyyən yiyəlik hal. Azərbaycan dilində müəyyən yiyəlik halın göstəricisi ***-ın***$^4$ şəkilçisidir.

Çin dili kök dilidir, ona görə də qrammatik kateqoriya yoxdur və hal anlayışı da yoxdur, amma hal kateqoriyasının ifadə vasitəsi var. Çin dilində müəyyən yiyəlik halı ifadə etmək üçün *的 (de)* hissəciyindən istifadə edilir. Çin dilində qeyri-müəyyən yiyəlik hal kimi işlənəndə *的 (de)* hissəciyi işlənmir.

Bəs Çin dilində *的 (de)* hissəciyi nə vaxt işlənməlidir və ya işlənməməlidir, nə vaxt *的 (de)* hissəciyi işlənə də, işlənməyə də bilər? Bu, Çin dilçiliyində ən maraqlı, mürəkkəb, mübahisəli elmi məsələlərdən biridir.

1. Çin dilində yiyəlik hallı xüsusi isimlərdən sonra ümumi əşyaları bildirən sözlər gəldikdə onların arasına *的 (de)* hissəciyi artırılır (Si, 2014: 44). Məsələn:

| Çin dilində və onun tələffüzü | Azərbaycan dilində tərcümə |
|---|---|
| 父亲的电脑 (fù qīn de diàn nǎo) | Atanın kömpüteri<br>Qeyd: 父亲电脑 (fù qīn diàn nǎo) “ata kömpüteri” deyə bilmirik. Aşağıdakı nümunələrdə də elədir. |
| 阿吉乐的钢笔 (ā jí lè de gāng bǐ) | Aqilin qələmi |
| 武萨的鞋子 (wǔ sà de xié zi) | Vüsalın ayaqqabısı |
| 贾维德的帽子 (jiǎ wéi dé de mào zi) | Cavidin papağı |
| 吴娟的裙子 (wú juān de qún zi) | Ulduzun donu |

| | |
|---|---|
| 保罗的书 (bǎo luó de shū) | Pərvizin kitabı |
| 图兰的车 (tú lán de chē) | Turanın maşını |
| 阿里的信 (ā lǐ de xìn) | Əlinin məktubu |
| 阿扎特的照片 (ā zhā tè de zhào piàn) | Azadın şəkli |
| 埃尔山的包 (āi ěr shān de bāo) | Elşənin çantası |

2. Çin dilində yiyəlik hallı sözdən sonra qohumluq bildirən sözlər işləndikdə, və ya bu birləşmə bütöv və hissə arasındakı əlaqəni bildirəndə, onların arasında ***的 (de)*** hissəciyi işlənə də bilər, işlənməyə də bilər (Si, 2014: 44). Məsələn:

| Çin dilində və onun tələffüzü | Azərbaycan dilində tərcümə |
|---|---|
| 我的女儿 (wǒ de nǚ ér) / 我女儿 (wǒ nǚ ér) | mənim qızım / mən qızım (qohumluq) |
| 你的母亲 (nǐ de mǔ qīn) / 你母亲 (nǐ mǔ qīn) | sənin anan / sən anan |
| 他的儿子 (tā de ér zi) / 他儿子 (tā ér zi) | onun oğlu / o oğlu |
| 我的奶奶 (wǒ de nǎi nai) / 我奶奶 (wǒ nǎi nai) | mənim nənəm / mən nənəm |
| 谁的孩子 (sheí de hái zi) / 谁孩子 (shuí hái zi) | kimin uşağı / kim uşağı |
| 电脑的屏幕 (diàn nǎo de píng mù) / 电脑屏幕 (diàn nǎo píng mù) | kompüterin ekranı / kompüter ekranı (bütöv və hissə arasındakı əlaqə) |
| 梨子的皮儿 (lí zi de pí ér) / 梨子皮儿 (lí zi pí ér) | armud qabığı / armudun qabığı |
| 橘子的瓣儿 (jú zi de bàn er) / 橘子瓣儿 (jú zi bàn er) | mandarinin dilimi / mandarin dilimi |
| 桌子的腿儿 (zhuō zi de tuǐ er) / 桌子腿儿 (zhuō zi tuǐ er) | stolun ayağı / stol ayağı |
| 老鹰的翅膀 (lǎo yīng de chì bǎng) / 老鹰翅膀 (lǎo yīng chì bǎng) | qartalın qanadı / qartal qanadı |

Çin dilində yiyəlik hallı söz şəxs bildirdikdə mənsub olan söz insana aid əzaları - bədən üzvlərini bildirirsə, ***的 (de)*** hissəciyi mütləq işlənməlidir (Lei, Guo, 2015: 129). Məsələn:

| Çin dilində və onun tələffüzü | Azərbaycan dilində tərcümə |
|---|---|
| 努兰的头 (nǔ lán de tóu) | Nurlanın başı |
| 阿里的耳朵 (ā lǐ de ěr duǒ) | Əlinin qulağı |
| 穆拉德的鼻子 (mù lā dé de bí zi) | Muradın burnu |
| 艾塞尔的嘴唇 (ài sài ěr de zuǐ chún) | Ayselin dodağı |
| 图兰的手 (tú lán de shǒu) | Turanın əli |

3. Amma onu da qeyd etmək lazımdır ki, ***的 (de)*** hissəciyinin istifadə edilib-edilməməsi başqa amillərdən də asılıdır. Məsələn: sözlərin mənasının düzgün və aydın çatdırılması məsələsi, heca məsələsi və s (Si, 2014: 44). Sözlərin mənasının düzgün və aydın çatdırılması üçün ***的 (de)*** hissəciyi işlənir.

Birincisi, sözlərin mənası düzgün və aydın çatdırılması məsələsi. Məsələn: 秦古斯爷爷 / 秦古斯的爷爷 "Çingiz babası / Çingizin babası". "baba" qohumluq bildirən sözdür, yuxarıda qeyd etdiyimiz kimi , "Çingiz" və "baba" sözlərinin arasında ***的 (de)*** hissəciyi işlənə də bilər, işlənməyə də bilər. Lakin Çin dilində mənsubiyyət şəkilçisi olmadığına görə 秦古斯爷爷 (hərfi tərcümə "Çingiz baba" ) həm "Çingiz babası", həm də Ⅲ növ təyini söz birləşməsi olan "Çingizin babası" kimi başa düşülə bilər. ***的 (de)*** hissəciyi artırmaqla isə 秦古斯的爷爷 çox aydın olaraq "Çingizin babası" birləşməsi əmələ gəlir. Çin dilində şəxs bildirən isim və dəyişməz sosial münasibətləri (o cümlədən qohumluq) ifadə edən isim işləndikdə mənanın səhv başa düşülməməsi üçün ***的 (de)*** hissəciyi işlənir (Si, 2014: 44). Misal üçün, 阿里舅舅 "Əli dayısı" yox, 阿里的舅舅 "Əlinin dayısı", 蕾拉阿姨 "Leyla xalası" yox, 蕾拉的阿姨 "Leylanın xalası" kimi işlənir.

法国朋友 (fǎ guó péng yǒu) "fransız dost" dostun haradan olduğunu göstərir. Fransız dost, yapon dost, gürcü dost və s. Məsələn 我有一个法国朋友 (wǒ yǒu yī gè fǎ guó péng yǒu) "Bir fransız dostum var" ***的 (de)*** hissəciyinin əlavə olunması ilə 法国的朋友 (fǎ guó de péng yǒu) iki cür başa düşülə bilər, biri "fransız dost", digəri "Fransanın dostu" kimi. Məsələn 中国是法国的朋友 (zhōng guó shì fǎ guó de péng yǒu) "Çin Fransanın dostudur" , burada 法国的朋友 (wǒ yǒu yī gè fǎ guó péng yǒu) Fransanın mənsub olduğu dostunu bildirir. ***的 (de)*** hissəciyi iki hissəni bir-birindən ayırır və "Fransa" kimi sözünün sahiblik funksiyası aktivləşir (Xu, 2011: 77).

Ona görə də Çin dilində çox vaxt mənanın düzgün və aydın çatdırılması üçün ***的 (de)*** hissəciyi əlavə olunur.

Müasir Çin dilində söz quruluşu çox vaxt sözlərin bir və ya ikihecalı olmasından asılıdır. Əsas tendensiya "ikihecalı"ya doğrudur (LǓ, 1999: 3).

Hər iki tərəf isim olanda, ***的 (de)*** hissəciyinin artırılması sözlərin bir və ya ikihecalı olmasından asılıdır. ***的 (de)*** hissəciyinin istifadə edilib-edilməməsi ahəng qanunu kimi ritmik harmoniyaya riayət etməlidir (Xu, 2012: 33).

Hecaların sayına görə sözlər tək, iki, üç, dörd, beş hecalı və beşdən çox hecalıya bölünür. Müasir Çin dilində sözlərin 70%-dən çoxu ikihecalıdır ki, bu da müasir Çin dilində sözlərin əsas fonetik formasıdır (běi jīng dà xué, 2012: 190).

1. Əgər asılı və əsas tərəflərin hər ikisi təkhecalıdırsa, ikihecalı isim kimi sayılır və ***的 (de)*** hissəciyi əlavə edilə bilmir, yəni mütləq qeyri-müəyyən yiyəlik hal kimi işlənir. Çünki iki heca bir ***yinbu*** (Çin dilində ritmin əsas vahidi) təşkil edir. ***的 (de)*** hissəciyi əlavə edilsə, ritmin harmoniyasını pozar (Xu, 2012: 33).

Məs:

| Çin dilində və onun tələffüzü | Azərbaycan dilində tərcümə | Çin dilində və onun tələffüzü | Azərbaycan dilində tərcümə |
|---|---|---|---|
| 树根 (shù gēn) | ağac kökü | 牙医 (yá yī) | diş həkimi |
| 湖水 (hú shuǐ) | göl suyu | 牙刷 (yá shuā) | diş fırçası |
| 书页 (shū yè) | kitab səhifəsi | 房号 (fáng hào) | otaq nömrəsi |
| 书店 (shū diàn) | kitab dükanı | 水滴 (shuǐ dī) | su damcısı |
| 书架 (shū jià) | kitab şkafı | 医嘱 (yī zhǔ) | həkim məsləhəti |
| 树叶 (shù yè) | ağac yarpağı | 租金 (zū jīn) | kirayə haqqı |
| 花香 (huā xiāng) | çiçək ətri | 食品 (shí pǐn) | qida məhsulu |
| 鸭肉 (yā ròu) | ördək əti | 果汁 (guǒ zhī) | meyvə şirəsi |
| 鸡翅 (jī chì) | toyuq qanadı | 水杯 (shuǐ bēi) | su qabı |
| 鸡腿 (jī tuǐ) | toyuq bupu | 发夹 (fà jiá) | saç sancağı |
| 牛肉 (niú ròu) | dana əti | 面霜 (miàn shuāng) | üz kremi |
| 蛋盒 (dàn hé) | yumurta qutusu | 地块 (dì kuài) | yer sahəsi |
| 伞架 (sǎn jià) | çətir dayağı | 门铃 (mén líng) | qapı zəngi |
| 浴袍 (yù páo) | hamam xalatı | 信箱 (xìn xiāng) | poçt qutusu |
| 背包 (bēi bāo) | bel çantası | 手袋 (shǒu dài) | əl çantası |
| 唇膏 (chún gāo) | dodaq boyası | 茶几 (chá jī) | çay masası |
| 眼影 (yǎn yǐng) | göz kölgəsi | 邮轮 (yóu lún) | səyahət gəmisi |
| 画框 (huà kuàng) | şəkil çərçivəsi | 窗台 (chuāng tái) | pəncərə altlığı |
| 菜刀 (cài dāo) | mətbəx bıcağı | 腮红 (sāi hóng) | dırnaq boyası |
| 货舱 (huò cāng) | yük yeri | 色卡 (sè kǎ) | rəng kataloqu |
| 背肌 (bèi jī) | kürək əzələsi | 气管 (qì guǎn) | nəfəs borusu |

*Nümunələr《wài jiào shè ā sāi bài jiāng yǔ yīng yǔ hàn yǔ tú jiě cí diǎn》"Şanxay xarici dillərin tədrisi nəşriyyatı tərəfindən çap olunmuş Azərbaycan, İngilis və Çin dillərinin İllüstrasiya Lüğəti"-ndən götürülüb.

Qeyd: Bəzən, asılı və əsas tərəfin hər ikisi təkhecalı olduqda ***的 (de)*** hissəciyi işlənə də, işlənməyə də bilər. Məs: 牛角 (niú jiǎo) "öküz buynuzu" və 牛的角 (niú de jiǎo) "öküzün buynuzu", 人脸 (rén liǎn) "insan üzü" və 人的脸 (rén de liǎn) "insanın üzü" hər ikisi işlənir.

2. Əgər asılı tərəf təkhecalı və əsas tərəf ikihecalıdırsa, hecaların simmetriyası və koordinasiyası üçün ***的 (de)*** hissəciyi əlavə edilməlidir. Çin dilində təkhecalı söz ikihecalı sözə çevrilməyə meyillidir (LǓ, 1999: 3). Burada***的 (de)*** hissəciyinin əlavə edilməsi ilə birinci tərəfdə olan təkhecalı

söz ikihecalı sözə çevrilir. Məsələn, ***的 (de)*** hissəciyi ilə təkhecalı söz 人 (rén) - dən ikihecalı sözə 人的 (rén de) çevirildi. Nümunələr:

| Çin dilində və onun tələffüzü | Azərbaycan dilində tərcümə |
|---|---|
| 人的个性 (rén de gè xìng) | insanın xarakteri |
| 书的颜色 (shū de yán sè) | kitabın rəngi |
| 水的温度 (huǒ de wēn dù) | suyun temperature |
| 云的形状 (yún de xíng zhuàng) | buludun forması |
| 山的高度 (shān de gāo dù) | dağın hündürlüyü |
| 花的香气 (huā de xiāng qì) | çiçəyin ətri |
| 风的声音 (fēng de shēng yīn) | küləyin səsi |
| 鸟的翅膀 (niǎo de chì bǎng) | quşların qanadı |
| 肉的质量 (ròu de zhì liàng) | ətin kefiyyəti |
| 人的表情 (rén de biǎo qíng) | insanın ifadəsi |
| 树的影子 (shù de yǐng zi) | ağacın kölgəsi |
| 纸的颜色 (zhǐ de yán sè) | kağızın rəngi |
| 杯的容量 (bēi de róng liàng) | fincanın həcmi |
| 心的跳动 (xīn de tiào dòng) | ürəyin döyüntüsü |
| 狗的眼睛 (gǒu de yǎn jīng) | itin gözü |
| 猫的尾巴 (māo de wěi bā) | pişiyin quyruğu |
| 人的身高 (rén de shēn gāo) | insanın boyu |
| 海的深度 (hǎi de shēn dù) | dənizin dərinliyi |
| 钱的价值 (qián de jià zhí) | pulun dəyəri |
| 茶的品种 (chá de pǐn zhǒng) | cayın növləri |
| 鸟的羽毛 (niǎo de yǔ máo) | quşun lələyi |

Qeyd 1: Bəzi hallarda istisna olaraq ***的 (de)*** hissəciyi əlavə edilə bilər, bəzən isə əlavə edilməyə də bilər. Məs: 皮的鞋子 (pí de xié zi) "*dərinin ayaqqabı*" *və* 皮鞋子 (pí xié zi) "dəri ayaqqabı" , 马的尾巴 (mǎ de wěi ba) "atın quyruğu" və 马尾巴 (mǎ wěi ba) "at quyruğu" hər ikisi işlənir.

Azərbaycan dilində, asılı tərəf əşyanın nədən hazırlandığını bildirirsə, ümumiyyətlə *1-ci növ təyini söz birləşməsi şəklində işlənir. Məsələn, dəri ayaqqabı, dəmir qapı, taxta qaşıq, gümüş üzük, daş bina, baton çörək və s. Dərinin ayaqqabısı, dəmirin qapısı və s. deyə bilmirik, amma Çin dilində, tutaq ki,* 皮的鞋子 (pí de xié zi) "*dərinin ayaqqabısı*" və 皮鞋子 (pi xie zi) "dəri ayaqqabı" hər ikisi işlənə bilir. Burada fərqlərə rast gəlinir.

Qeyd 2: Bəzən *的 (de)* hissciyi leksik mənaya da təsir edir. Çin dilində məzaci mənada 牛脾气 (niú pí qì) "inək xasiyyəti" işlənir. Məsələn: Orxanın inək xasiyyəti var, yəni Orxanın inadcıl xasiyyəti var. Əgər *的 (de)* hissciyi işlətsək, bu həqiqi mənanı bildirər; Məsələn: 牛的脾气 (niú de pí qì) "inəyin xasiyyəti" . Çin dilində deyə bilmirik ki, Orxanda inəyin xasiyyəti var.

3. Əgər birinci tərəf ikihecalı və ikinci tərəf təkhecalıdırsa, bu zaman *的 (de)* hissəciyi həmişə əlavə edilmir və qeyri-müəyyən yiyəlik hal kimi işlənir; Məsələn:

| Çin dilində və onun tələffüzü | Azərbaycan dilində tərcümə |
|---|---|
| 南瓜汤 (nán guā tāng) | balqabaq şorbası |
| 羊肉串 (yáng ròu chuàn) | quzu kababı |
| 大米粥 (dà mǐ zhōu ) | düyü sıyığı |
| 玻璃杯 (bō lí bēi) | şüşə qabı |
| 艺术史 (yì shù shǐ) | incəsənət tarixi |
| 山羊奶 (shān yáng nǎi) | keçi südü |
| 炭火炉 (tàn huǒ lú) | kömür sobası |
| 休息室 (xiū xí shì) | istirahət otağı |
| 防晒霜 (fáng shài shuāng) | günəş kremi |
| 手术室 (shǒu shù shì) | cərrahiyyə otağı |
| 手术台 (shǒu shù tái) | cərrahiyyə stolu |
| 垃圾袋 (lā jī dài) | zibil paketi |
| 候诊室 (hòu zhěn shì) | gözləmə otağı |
| 消防站 (xiāo fáng zhàn) | yanğınsöndürmə məntəqəsi |
| 少女塔 (shào nǚ tǎ) | Qız qalası |
| 瞭望塔 (liào wàng tǎ) | müşahidə qülləsi |
| 工具箱 (gōng jù xiāng) | alətlər qutusu |
| 工作台 (gōng zuò tái) | iş platforması |
| 鹌鹑蛋 (ān chún dàn) | bildirçin yumurtası |
| 干酪屑 (gān lào xiè) | pendir qırıntısı |
| 番茄汁 (fān qié zhī) | pomidor şirəsi |
| 咖啡豆 (kā fēi dòu) | qəhvə paxlası |
| 运动服 (yùn dòng fú) | idman paltarı |
| 指甲剪 (zhǐ jiá jiǎn) | dırnaq qayçısı |
| 指甲油 (zhǐ jiá yóu) | dırnaq cilası |
| 壁炉台 (bì lú tái) | sobanın üstü |
| 厨房秤 (chú fáng chèng) | mətbəx tərəzisi |

| | |
|---|---|
| 橄榄油 (gǎn lǎn yóu) | zeytun yağı |
| 芥末酱 (jiè mò jiàng) | xardal sousu |
| 婴儿床 (yīng ér chuáng) | uşaq çarpayısı |
| 玉米片 (yù mǐ piàn) | qarğıdalı lopası |
| 时刻表 (shí kè biǎo) | vaxt cədvəli |
| 商务区 (shāng wù qū) | biznes rayonu |
| 公寓楼 (gōng yù lóu) | yaşayış binası |
| 工业区 (gōng yè qū) | səyane zonası |
| 糕点店 (gāo diǎn diàn) | şiriniyyat dükanı |
| 足球队 (zú qiú duì) | futbol komandası |
| 服务费 (fú wù fèi) | xidmət haqqı |
| 体育馆 (tǐ yù guǎn) | idman zalı |
| 信用卡 (xìn yòng kǎ) | kredit kartı |
| 登记表 (dēng jì biǎo) | qeydiyyat vərəqi |
| 旅行社 (lǚ xíng shè) | turizm agentliyi |
| 胜利日 (shèng lì rì) | Zəfər günü |
| 葡萄叶 (pú táo yè) | üzüm yarpağı |
| 滑雪裤 (huá xuě kù) | xizək şalvarı |
| 领带夹 (lǐng dài jiā) | qalstuk sancağı |
| 化妆包 (huà zhuāng bāo) | kosmetika qabı |
| 铅笔尖 (qiān bǐ jiān) | karandaşın ucu |

*Nümunələr《wài jiào shè ā sāi bài jiāng yǔ yīng yǔ hàn yǔ tú jiě cí diǎn》"Şanxay xarici dillərin tədrisi nəşriyyatı tərəfindən çap olunmuş Azərbaycan, İngilis və Çin dillərinin İllüstrasiya Lüğəti"-ndən götürülüb.

Qeyd: Kitabın rəngi, atanın adı, Orxanın dostu və s. nümunələrdə yiyəlik-mənsubluq əlaqəsi mövcuddur. Sual verə bilərik ki, nəyin rəngi? Kimin adı? Kimin dostu?

Bazarlıq arabası, ev tapşırığı, su qabı və s. nümunələrdə, qeyri-müəyyən yiyəlik halın strukturu olsa, "bazarlıq" və "araba", "ev" və "tapşırıq" arasındakı əlaqə əslində yiyəlik-mənsubluq deyil. Bazarlığın arabası deyil, bazarlıq üçün arabadır. Evin tapşırığı deyil, evdə yazılan tapşırıqdır. Suyun qabı deyil, su içməyə qabdır.

Çin dilində isə 购物车 (gòu wù chē) "bazarlıq araba" , 家庭作业 (jiā tíng zuò yè) "ev tapşırıq" , 水杯 (shuǐ bēi) "su qab" kimi işlənir, yəni burada ***的 (de)*** hissəciyi işlənmir. Çin dilində belə nümunədəki əlaqə yiyəlik-mənsubluq əlaqəsi kimi götürülmür.

Çin dilində təyin-əsas söz birləşməsində asılı və əsas tərəf arasında semantik əlaqənin müxtəlif növü mövcuddur. Bunların arasında, yiyəlik-mənsubluq əlaqəsi ilk və ən mühüm əlaqələrdən biridir. Başqa semantik əlaqə də mövcuddur. Asılı tərəf yiyəlikdən başqa, funksiya, xüsusiyyət, zaman, yer və s. də bildirir.

Məs:

(1) 购物车 (gòu wù chē) “bazarlıq arabası” - Asılı tərəf funksiyanı bildirir, yəni bazarlıq üçün arabadır.

(2) 家庭作业 (jiā tíng zuò yè) “ev tapşırığı” - Asılı tərəf yeri bildirir, yəni evdə yazılan tapşırıqdır.

(3) 水杯(shuǐ bēi) “su qabı” - Asılı tərəf funkasiyanı bildirir, yəni su içməyə qabdır.

4. Hər iki tərəf ikihecalı olanda, əgər yiyəlik-mənsubluq münasibəti bildirirsə, bu zaman ***的 (de)*** hissəciyi həmişə əlavə olunur və müəyyən yiyəlik hal kimi işlənir. Məsələn:

| Çin dilində və onun tələffüzü | Azərbaycan dilində tərcümə |
|---|---|
| 妹妹的钢笔 (mèi mèi de gāng bǐ) | bacının qələmi |
| 父亲的习惯 (fù qīn de xí guàn) | atanın vərdişi |
| 同学的玩具 (tóng xué de wán jù) | sinif yoldaşının oyunacağı |
| 班长的座位 (bān zhǎng de zuò wèi) | sinif nümayəndəsinin yeri |
| 舅舅的手机 (jiù jiù de shǒu jī) | əminin telefonu |

Əgər yiyəlik-mənsubluq münasibəti bildirmirsə, *的 (de)* hissəciyi işlənə də, işlənməyə də bilər, əksər hallarda *的 (de)* istifadə edilmir.

Heca baxımından, Çin dilində çoxlu sayda dörd heroqlifdən ibarət olan söz mövcuddur, onların böyük əksəriyyəti iki dənə ikihecalı sözün birləşməsidir (LǙ, 1999: 9) . Tutaq ki, 木头房子 (mù tou fáng zi) “taxta ev” və 木头的房子 (mù tou de fáng zi) “taxta ev” , 历史事实 (lì shǐ shì shí) “tarixi faktlar” və 历史的事实 (lì shǐ de shì shí) “tarixin faktları” hər ikisi işlənir, amma *的 (de)* -siz, yəni 木头房子 (mù tou fáng zi) “taxta ev” və 历史事实 (lì shǐ shì shí) “tarixi faktlar” daha çox işlənir.

| Çin dilində və onun tələffüzü | Azərbaycan dilində tərcümə |
|---|---|
| 企业管理 (qǐ yè guǎn lǐ ) | biznes idarəetməsi |
| 自然科学 (zì rán kē xué) | təbiət elmləri |
| 大门钥匙 (dà mén yào shi) | əsas qapının açarı |
| 学生宿舍 (xué shēng sù shè) | tələbə yataqxanası |
| 消化系统 (xiāo huà xì tǒng) | həzm sistemi |
| 呼吸系统 (hū xī xì tǒng) | tənəffüs sistemi |
| 花园座椅 (huā yuán zuò yǐ) | bağ oturacağı |
| 花园池塘 (huā yuán chí táng) | bağ hovuzu |
| 钥匙挂钩 (yào shi guà gōu) | açar asqısı |
| 交通堵塞 (jiāo tōng dǔ sè) | nəqliyyat tıxacı |
| 公交车站 (gōng jiāo chē zhàn) | avtobus dayanacağı |
| 儿童座椅 (ér tóng zuò yǐ) | uşaq oturacağı |

| | |
|---|---|
| 货运火车 (huò yùn huǒ chē) | yük qatarı |
| 行李推车 (xíng lǐ tuī chē) | yük arabası |
| 市场价格 (shì chǎng jià gé) | bazar qiyməti |
| 奶酪专柜 (nǎi lào zhuān guì) | pendir məmulatları |
| 旅游指南 (lǚ yóu zhǐ nán) | səyahət kitabçası |
| 街头艺人 (jiē tóu yì rén) | küçə musiqiçisi |
| 工作时间 (gōng zuò shí jiān) | iş vaxtı |
| 到达大厅 (dào dá dà tīng) | qarşılama zalı |
| 电话号码 (diàn huà hào mǎ) | telefon nömrəsi |
| 自然风景 (zì rán fēng jǐng) | təbiət mənzərəsi |
| 窗户玻璃 (chuāng hù bō li) | pəncərə şüşəsi |
| 工业城市 (gōng yè chéng shì) | sənaye şəhəri |
| 宝宝餐椅 (bǎo bao cān yǐ) | uşaq stulu |
| 婴儿推车 (yīng ér tuī chē) | uşaq arabası |

*Nümunələr《wài jiào shè ā sāi bài jiāng yǔ yīng yǔ hàn yǔ tú jiě cí diǎn》"Şanxay xarici dillərin tədrisi nəşriyyatı tərəfindən çap olunmuş Azərbaycan, İngilis və Çin dillərinin İllüstrasiya Lüğəti"-ndən götürülüb.

**Şəxs əvəzlikləri hallanarkən:**

Çin dilində də şəxs əvəzlikləri var - mən, sən, o, biz, siz, onlar. Çin dilində şəxs əvəzlikləri hallanarkən, əsas tərəf həm təkhecalı, həm də qohumluq bildirirsə, ***的*** *(de)* hissəciyi həmişə əlavə edilmir. Məs: 我爸(wǒ bà) "mənim atam", 他姐(tā jiě) "onun bacısı".

İkinci tərəfdə ölkə, təşkilat və ya qohumluq bildirən sözlər olmadıqda, ***的*** *(de)* hissəciyi həmişə əlavə edilməlidir. Məs: 我的书 (wǒ de shū) "mənim kitabım", 他们的财产 (tā men de cái chǎn) "onların mülkiyyəti" .

İkinci tərəfdə söz ölkənin, təşkilatın adı olanda, təkhecalıdırsa, ***的*** *(de)* hissəciyi əlavə edilə bilməz. Məs: 我国 (wǒ guó) "mənim ölkəm", 我们厂 (wǒ men chǎng) "bizim zavodumuz"; Əgər təkhecalı deyilsə, ***的*** *(de)* hissəciyi işlənə də, işlənməyə də bilər. Misal üçün, 你们的学校 (nǐ men de xué xiào) "sizin məktəbiniz" və 你们学校 (nǐ men xué xiào) "sizin məktəbiniz" hər ikisi işlənir.

İkinci tərəfdə işlənən söz qohumluq bildirəndə, birinci tərəf (əvəzlik) təkhecalıdırsa, ***的*** *(de)* hissəciyi işlənə də, işlənməyə də bilər, yəni bu vəziyyətdə müəyyən və qeyri-müəyyən yiyəlik halın hər ikisi işlənə bilər. Məs: 他的弟弟 (tā de dì dì) "onun qardaşı" və 他弟弟(tā dì dì) "onun qardaşı", 我的母亲 (wǒ de mǔ qīn) "mənim anam" və 我母亲 (wǒ mǔ qīn) "mənim anam", burada ***的*** *(de)* hissəciyi işlənə də, işlənməyə də bilər (Lei, Guo, 2015: 128-132).

Əgər birinci tərəf (əvəzlik) ikihecalıdırsa, ***的*** *(de)* hissəciyi həmişə əlavə edilir. Məs: 我们的妹妹 (wǒ men de mèi mèi) "bizim kiçik bacımız" deyirik, amma 我们妹妹 (wǒ men mèi mèi) deyə bilmirik.

我们的母亲 (wǒ men de mǔ qīn) "bizim atamız" deyirik, amma 我们母亲 (wǒ men mǔ qīn) deyə bilmirik.

**Azərbaycan dilində yiyəlik hal və Çin dilində onun ifadə vasitəsi arasında oxşar və fərqli cəhətlər.**

**Oxşar cəhətlər:**

1. Azərbaycan dilində III növ təyini söz birləşmələrinin birinci tərəfi müəyyən yiyəlik halda olur. Məsələn: kitabın səhifəsi, şagirdin gündəliyi, çiçəyin ətri, otağın rəngi, şəhərin mənzərəsi və s. Azərbaycan dilində sintaktik təhlili zamanı 3-cü növ t.s.b bölünmür, amma arasına söz əlavə edilə bilər.

Çin dilində də biz buna rast gəlirik (LǓ, 1999: 158). Məs:

| Çin dilində və onun tələffüzü | Azərbaycan dilində |
|---|---|
| 奥尔汗美丽的母亲很友善。<br>(ào ěr hàn měi lì de mǔ qīn hěn yǒu shàn) | Orxanın gözəl anası səmimidir. |
| 莎赫拉有趣的书被撕破了。<br>(shā hè lā yǒu qù de shū bèi sī pò le) | Şəhlanın maraqlı kitabı cırılmışdır. |
| 我喜欢这座城市的迷人景色。<br>(wǒ xǐ huān zhè zuò chéng shì de mí rén jǐng sè) | Bu şəhərin valehedici mənzərəsi xoşuma gəlir. |
| 学生皱巴巴的日记掉在了地板上。<br>(xué shēng zhòu bā bā de rì jì diào zài le dì bǎn shàng) | Şagirdin əzilmiş gündəliyi yerə düşdü. |
| 花朵芬芳的香气四散。<br>(huā duǒ fēn fāng de xiāng qì sì sàn) | Çiçəyin xoş ətri ətrafa yayıldı. |

2. Azərbaycan dilində II növ təyini söz birləşmələrinin birinci tərəfi qeyri-müəyyən yiyəlik halda olur. Məsələn: sinif otağı, məktəb həyatı, tələbəlik illəri və s. Azərbaycan dilində II növ təyini söz birləşmələri bölünmür və arasına söz əlavə edilə bilmir.

Çin dilində də eyni vəziyyətdir (LǓ, 1999: 158), 教室 (jiào shì) "sinif otağı" , 苹果树 (píng guǒ shù) "alma ağacı" bu birləşmələrin arasına söz artırıla bilmir. Məslən:

| Çin dilində və onun tələffüzü | Azərbaycan dilində |
|---|---|
| 老师住在地铁站附近。<br>(lǎo shī zhù zài dì tiě zhàn fù jìn) | Müəllim metro stansiyasının yaxınlığında yaşayır. |
| 我喜欢果汁。<br>(wǒ xǐ huān guǒ zhī) | Mən meyvə şirəsi xoşlayıram. |
| 院子里有许多苹果树。<br>(yuàn zi lǐ yǒu xǔ duō píng guǒ shù) | Həyətdə çoxlu alma ağacları var. |
| 医嘱很有用。<br>(yī zhǔ hěn yǒu yòng) | Həkim məsləhəti çox faydalıdır. |
| 湖水要么是咸的,要么是甜的。<br>(hú shuǐ yào me shì xián de,yào me shì tián de) | Göl suyu ya duzlu, ya da şirin olur. |

3. Azərbaycan dilində yiyəlik halda olan ismə yenidən hal şəkilçisi artırmaq olmaz, lakin mənsubiyyət şəkilçili sözlər bütün hallar üzrə dəyişə bilir (Kazımov, 2010: 68). Çin dilində də elədir.

Məsələn: ***Orxanın evi*** birləşməsində mənsubiyyət şəkilçili ikinci tərəfə diqqət yetirək: Orxanın evi, Orxanın evinin, Orxanın evinə, Orxanın evini, Orxanın evində, Orxanın evindən. Çin dilində də mənsubiyyətdən sonra halın göstəricisi işlənir.

Nümunə göstərirəm:

| Çin dilində və onun tələffüzü | Azərbaycan dilində |
|---|---|
| 这只猫的尾巴的颜色是黑色。 (zhè zhī māo de wěi bā de yán sè shì hēi sè) | Bu pişiyin quyruğunun rəngi qaradır. |
| 昨天我把房租付给了房东。 (zuó tiān wǒ bǎ fáng zū fù gěi le fáng dōng) | Dünən mən ev sahibinə kirayə haqqını ödədim. |
| 大家都为街头艺人鼓掌。 (dà jiā dōu wèi jiē tóu yì rén gǔ zhǎng) | Küçə musiqiçisini hamı alqışladı. |
| 奥尔汗的家里有很多客人。 (ào ěr hàn de jiā lǐ yǒu hěn duō kè rén) | Orxanın evində çoxlu qonaqlar var. |
| 我从公交车站回到家。 (wǒ cóng gōng jiāo chē zhàn huí dào jiā) | Avtobus dayanacağından evə gəldim. |

3. Həm Azərbaycan dilində, həm də Çin dilində, ismi birləşmələrin iki tərəfi olur və birinci tərəf ikinci tərəfi izah edir. Azərbaycan dilində birinci tərəfə həmişə asılı tərəf, Çin dilində isə ona izah edən tərəf deyilir. Hər iki dildə ikinci tərəfə əsas tərəf deyilir. Söz sırası baxımından, hər iki dildə asılı / izah etdiyi tərəf əsas tərəfdən əvvəl gəlir.

4. Azərbaycan dilində yiyəlik halın iki növü var - müəyyən və qeyri-müəyyən yiyəlik hal. Çin dilində yiyəlik hal olmasa da, yiyəlik hal bildirən hissəcik işlənir. Sözlərə ***的*** *(de)* hissəciyi əlavə edildikdə müəyyən yiyəlik hal, ***的*** *(de)* hissəciyi əlavə edilmədikdə isə qeyri-müəyyən yiyəlik hal kimi işlənir. ***的*** *(de)* hissəciyi Azərbaycan dilində yiyəlik halın şəkilçisinin (***-ın4)*** qrammatik funkiyasını daşıya bilir. Hər ikisi yiyəlik-mənsubluq münasibəti bildirə bilir. Hər ikisi təyini söz birləşmələrinin simvoludur.

**Fərqli cəhətlər:**

1. Çin dilində Azərbaycan dilindən fərqli olaraq, bir neçə yiyəlik-mənsubluq strukturu ardıcıl gəldikdə yiyəlik halın şəkilçisi yalnız sonuncu sözdən əvvəlki sözə qoşulur (Xu, 2011: 78). Məsələn:

(1) 阿里的儿子 (ā lǐ de ér zi) "Əlinin oğlu"

(2) 阿里儿子的衣服 (ā lǐ ér zi de yī fú) "Əli oğlunun paltarı"

(3) 阿里儿子衣服的颜色 (ā lǐ ér zi yī fú de yán sè) "Əli oğlu paltarının rəngi"

Azərbaycan dilində isə bir neçə yiyəlik-mənsubluq strukturu üst-üstə düşdükdə yiyəlik halın şəkilçisi bütün sözlərə əlavə olunur. Məsələn: Əlinin oğlu - Əlinin oğlunun paltarı - Əlinin oğlunun paltarının rəngi, dostumun kitabının adı və s.

2. Çin dilində ***的*** *(de)* hissəciyinin qrammatik, semantik və praqmatik funksiyaları daha zəngindir. Demək olar ki, ***的*** *(de)* hissəciyi Azərbaycan dilində yiyəlik halın şəkilçisinin (***-ın$^4$)*** qrammatik funkiyasını tam daşıya bilər, lakin ***-ın4*** ***的*** *(de)* hissəciyinə bərabər olduğunu deyə bilmirik (Ajiakbar, 2012: 81).

3. Buna diqqət yetirməliyik ki, müəyyən yiyəlik hal strukturunda mütləq ***的*** *(de)* hissəciyi olur, amma ***的*** *(de)* hissəciyinin qrammatik mənası çox olduğuna görə, onun işlənməsi o anlama gəlmir

ki, bu mütləq müəyyən yiyəlik hal strukturudur. Çin dilində ***的** (de)* hissəciyinin qrammatik mənası çoxdur. ***的** (de)* hissəciyi müəyyən yiyəlik halı ifadə etməklə yanaşı I növ təyin söz birləşməsini də düzəldə bilir (Dralle, 2018). Tutaq ki,

| Çin dilində və onun tələffüzü | Azərbaycan dilində tərcümə |
|---|---|
| 高高的楼房 (gāo gāo de lóu fáng) | hündür bina |
| 铁的意志 (tiě de yì zhì) | dəmir iradə |
| 幸福的生活 (xìng fú de shēng huó) | gözəl həyat |
| 有趣的书 (yǒu qù de shū) | maraqlı kitab |
| 干净的家 (gān jìng de jiā) | təmiz ev |
| 三千克的油 (sān qiān kè de yóu) | üç kiloqram yağ |

## Nəticə

Beləliklə, Çin dilində yiyəlik hal olmasa da, yiyəlik hal bildirən***的** (de)* hissəciyindən istifadə edilir. Azərbaycan dilində isə müəyyən yiyəlik hal ***-ın***$^{4}$ şəkilçisi ilə düzəlir. Çin dilində ***的** (de)* hissəciyinin istifadə edilib-edilməməsi bir neçə amillərdən asılıdır. Məsələn: yiyəlik bildirən söz və mənsub olan söz arasındakı əlaqə, sözlərin mənasının düzgün və aydın çatdırılması məsələsi, heca məsələsi və s. Azərbaycan dilində yiyəlik hal və Çin dilində onun ifadə vasitəsi - ***的** (de)* hissəciyi arasında həm oxşar, həm də fərqli cəhətlər mövcuddur.

## Ədəbiyyat

1. Yang, Y.L. (2011). guó jì hàn yǔ jiào shī yǔ fǎ jiào xué shǒu cè[M]. běi jīng: gāo děng jiào yù chū bǎn shè.
2. Huang, B.R., Liao X.D. (2017). xiàn dài hàn yǔ(zēng dìng liù bǎn) xià cè[M]. běi jīng: gāo děng jiào yù chū bǎn shè.
3. Kazımov, Q.Ş. (2010). Müasir Azərbaycan dili. Morfologiya. Bakı: Nurlan, 400 s.
4. Hüseynzadə, M. (2007). Müasir Azərbaycan dili. III hissə. Morfologiya. Bakı: Şərq-Qərb, 280 s.
5. Si, F.Z. (2014) "zhào běn shān de yé ye" hé "zhào běn shān de mào zi"- màn tán hàn yǔ zhōng de liǎng zhǒng lǐng shǔ jié gòu[J]. yǔ yán jiào xué yǔ yán jiū, № 2, s.43-51.
6. Xu, Y.C.(2012). "de" zì yǐn xiàn de zhì yuē yīn sù[J]. xiū cí xué xí, № 2, s.33-34. DOI:10.16027/j.cnki.cn31-2043/h.2003.02.018.
7. LǕ, S.X. (1999). xiàn dài hàn yǔ bā bǎi cí(zēng dìng běn)[M]. běi jīng: shāng wù yìn shū guǎn.
8. Lei, R., Guo, X.H. (2015). yīng hàn yǔ kě ràng dù jí bù kě ràng dù lǐng shǔ jié gòu de rèn zhī jiě shì[J]. hú běi dà xué xué bào (zhé xué shè huì kē xué bǎn). № 6(42), s.128-132. DOI:10.13793/j.cnki.42-1020/c.2015.06.022.9.
9. Běi jīng dà xué zhōng wén xì xiàn dài hàn yǔ jiào yán shì. (2012). xiàn dài hàn yǔ(zēng dìng běn)[M]. běi jīng: shāng wù yìn shū guǎn.
10. Xu, Y.C. (2011). bǎn kuài, tū xiǎn yǔ "de" zì de yǐn xiàn [J]. yǔ yán jiào xué yǔ yán jiū, № 6, s.76-82.
11. Ajiakbar, M. (2012). hàn yǔ hé wéi wú ěr yǔ míng cí xìng dìng zhōng duǎn yǔ jié gòu xíng shì duì bǐ fēn xī[J]. xīn jiāng jiào yù xué yuàn xué bào. № 1(28), s. 79-85.
12. Dralle, A. (2018). wài jiào shè ā sāi bài jiāng yǔ yīng yǔ hàn yǔ tú jiě cí diǎn[M]. shàng hǎi: shàng hǎi wài yǔ jiào yù chū bǎn shè.

Göndərilib: 04.01.2024 Qəbul edilib: 02.04.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/98-106

**Yunis Əvəzov**
Azərbaycan Dövlət İqtisad Universiteti
magistrant
yunis_avazov@unec.edu.az

# HEYDƏR ƏLİYEVİN İQTİSADİ SİYASİ XƏTTİNDƏ BİZNESİN İNKİŞAFI VƏ BU İSTİQAMƏTDƏ ŞƏFFAFLIĞIN TƏMİN OLUNMASI

## Xülasə

Heydər Əliyevin iqtisadi siyasətində şəffaflıq amilinin və biznesin inkişafında təhlükəsizlik siyasətində rolu xüsusilə Azərbaycanın iqtisadi və siyasi təkamülü kontekstində mühüm aktual mövzudur. 1993-cü ildən 2003-cü ilə qədər Azərbaycanın Prezidenti vəzifəsində çalışan Heydər Əliyev ölkənin mərkəzləşdirilmiş planlı iqtisadiyyatdan bazar iqtisadiyyatına keçidinə yönəlmiş bir sıra iqtisadi islahatlar həyata keçirdi. Şəffaflıq bu islahatların mühüm elementi idi, çünki o, xarici investisiyaların cəlb edilməsində və biznes üçün əlverişli mühitin yaradılmasında mühüm rol oynamışdır. Şəffaflığın onun iqtisadi siyasətinə nə dərəcədə inteqrasiya olunduğunu və onun biznesin inkişafına təsirini araşdırmaq ölkənin iqtisadi transformasiyası haqqında dəyərli fikirlər verə bilər.

Heydər Əliyevin iqtisadi və təhlükəsizlik siyasətində şəffaflıq amilinin rolunun tədqiqi onun Azərbaycanın iqtisadi inkişafına təsiri, idarəetmə və biznes etikasının qlobal kontekstində əhəmiyyəti, iqtisadiyyatın şaxələndirilməsi ilə bağlı müasir müzakirələrə uyğunluğu baxımından aktualdır. Bu mövzu davamlı və inklüziv biznesin inkişafına nail olmaq üçün iqtisadi siyasət, təhlükəsizlik problemləri və şəffaflığın təşviqi arasında mürəkkəb qarşılıqlı əlaqəni araşdırmaq imkanı verir.

Məqalədə Heydər Əliyevin postsovet dövründə ölkəmizin iqtisadi müstəqilliyinə təhlükə yaradan ünsürlərin aradan qaldırılmasında danılmaz rolu üzərində dayanacağıq. Bundan əlavə, Heydər Əliyevin rəhbərliyi dövründə ölkəmizin iqtisadi həyatında meydana gələn bir sıra dəyişikliklər, mövcud yeni sistemə uyğunlaşma və transformasiya məsələləri və bu kimi faktorlar işığında ölkədə biznes mühitinin necə və hansı formada şəkilləndiyi araşdırılıb təhlil olunacaqdır. Bununla yanaşı, məqalədə Heydər Əliyevin şəffalıq amilinin və təhlükəsizlik siyasətinin onun iqtisadi siyasətətindəki yeri təhlil olunaraq bu amillərin Azərbaycandakı biznes fəaliyyətinə təsirləri müzakirə olunacaqdır. Bu kontekstdə ilk növbədə Azərbaycanın müvafiq dövrdəki (1993-2003-cü illər) iqtisadi inkişafı makroiqtisadi göstəricilər prizmasından dəyərləndiriləcək və daha sonra bu inkişaf çərçivəsində Heydər Əliyevin iqtisadi siyasətindəki şəffaflıq amilinin və təhlükəsizlik siyasəti kontekstində Azərbaycandakı biznes fəaliyyəti baxımından imkanları tədqiq ediləcəkdir.

***Açar sözlər:*** *Heydər Əliyev, iqtisadi siyasət, iqtisadiyyatda şəffaflıq, biznesin inkişafı*

**Yunis Avazov**
Azerbaijan State University of Economics
master student
yunis_avazov@unec.edu.az

# Development of business in Heydar Aliyev's economic political line and providing transparency in this direction

## Abstract

An significant current issue, particularly in light of Azerbaijan's political and economic development, is the role that openness plays in Heydar Aliyev's economic policies and security measures in the growth of businesses. Azerbaijan underwent a series of economic reforms under Heydar Aliyev's administration (1993–2003) in an effort to move from a centrally planned to a

market economy. Since transparency attracted foreign investment and fostered a climate that was conducive to business, it was a crucial component of these reforms. A nation's economic transition can be better understood by looking at how much transparency is included into its economic policies and how that affects business development.

Examining how transparency functions in Heydar Aliyev's economic and security policies is important because it affects Azerbaijan's economic growth, is significant in the global context of management and business ethics, and is pertinent to current debates about economic diversification. This theme offers a chance to investigate the intricate relationships that exist between security issues, economic policy, and the advancement of transparency in order to create equitable and sustainable corporate development.

This paper will concentrate on Heydar Aliyev's indisputable contribution to the removal of the factors endangering our nation's economic autonomy throughout the post-Soviet era. Additionally, a number of changes to our nation's economic landscape that took place under Heydar Aliyev's leadership, challenges of adjustment and transition to the new system in place, and how and in what way the nation's business environment developed will be looked at and analyzed in light of these developments. Furthermore, the paper will examine the position of Heydar Aliyev's security policy and transparency component in his economic policy and talk about how these things affect business in Azerbaijan. First, through the lens of macroeconomic indicators, the economic development of Azerbaijan during the relevant period (1993-2003) will be assessed. Next, within the framework of this development, the transparency factor in Heydar Aliyev's economic policy and the potential for business activity in Azerbaijan within the context of security policy will be examined.

***Keywords:*** *Heydar Aliyev, economic policy, transparency in the economy, business development*

## Giriş

Hər hansı bir mövzunu tədqiqat obyektinə çevirərkən o mövzunun aktuallığı ilə yanaşı, həmin mövzunun hansı dərəcədə və hansı nöqteyi-nəzərdən tədqiq edilməsinin də bir o qədər vacibliyi danılmaz məsələlərdən biri olduğunu qeyd etmək lazımdır. Bu tədqiqat işinin əsas məqsədi Azərbaycanın müstəqillikdən sonrakı illərdə təcrübə etdiyi iqtisadi uğurlar işığında ümummilli lider Heydər Əliyevin iqtisadi siyasət kursunun və Heydər Əliyevin iqtisadi siyasəti çərçivəsində şəffaflıq amilinin və milli təhlükəsizliyin ölkəmizdə iqtisadiyyatın və biznesin inkişafındakı rolunun təhlil edilib araşdırılmasıdır.

Əvvəla qeyd edək ki, Heydər Əliyev rəhbərliyi altındakı iqtisadi siyasət sterategiyasının mahiyyətinə keçməzdən əvvəl Sovet İttifaqı dağıldıqdan sonra yenicə müstəqillik qazanmış Azərbaycan Respublikasının qarşılaşdığı çətinliklərdən bəhs etmək olduqca vacib əhəmiyyət kəsb edəcəkdir. Belə ki, Azərbaycan sözügedən dövrdə mövcud iqtisadi sıxıntılarla yanaşı Qarabağ müharibəsinin səbəb olduğu ağır bir yüklə də mübarizə aparmaq məcburiyyətində qalmışdır. Bununla yanaşı bir məqamı da vurğulamaq lazımdır ki, müharibənin nəticələri Rusiyanın da təsiri ilə respublikamızı qeyri-sabit bir mühitə düçar etmişdir. Bəhs olunan dövrdə Azərbaycanda iqtisadi çətinliklərlə birlikdə siyasi qeyri-sabitlik mühiti meydana gəlmiş və bu zaman dövlət başçısı vəzifəsinə yeni bir rəhbərin təyin olunması zərurəti yaranmışdır. Belə bir şəraitdə dövlət başçısı olan Heydər Əliyevin istər təbii sərvətlərin mənimsənilməsi istiqamətində atdığı addımlarda, istərsə də siyasi sabitliyin təmin olunmasında bugünkü müasir Azərbaycanın formalaşmasında böyük rolu olmuşdur. Heydər Əliyev hakimiyyətinin ilk illərində Qarabağda atəşkəsə nail olmuş və bu uğurun müsbət təsiri nəticəsində ölkənin bütün diqqətini iqtisadiyyata yönəldərək bu istiqamətdə mühüm addımların atılmasını həyata keçirməyə başlamışdır (Musayev, 2001: 8).

Müstəqillikdən sonrakı illərdə bazar iqtisadiyyatına keçid prosesi baxımından Qarabağ müharibəsinin mənfi və uzunmüddətli təsirləri danılmazdır. Belə bir sosial-iqtisadi mənzərə qarşısında Azərbaycan xalqı üçün lider kimi ön plana çıxan Heydər Əliyev Sovet dövründə də mühüm vəzifələrdə çalışmışdır. Zamanla Azərbaycanda daha çox rəğbət qazanması Heydər Əliyevi müstəqillik dövründə prezidentlik vəzifəsinə qədər yüksəlmişdir. Nəticə etibarilə Heydər Əliyevin ölkə idarəçiliyində fəal iştirakı ilə Azərbaycanda iqtisadi transformasiya daha da sürətlənmiş və

siyasi bir dayanıqlılıq formalaşmağa başlamışdır. Qarabağ müharibəsində atəşkəsə nail olunduqdan sonra isə "Əsrin Müqaviləsi" olaraq bilinən neft müqavilələri sayəsində ölkəmiz sahib olduğu zəngin təbii resursların emalı istiqamətində vacibliyi danılmaz bir addım atmağa müvəffəq olmuşdur. Beləliklə, bugünki müasir Azərbaycanın təməlini qoyan ümummilli lider Heydər Əliyev hər sahədə olduğu kimi müasir Azərbaycan iqtisadiyyatında da ən böyük təsirə malik dahi şəxsiyyətlərdən biri olmuşdur desək yanılmarıq. Heydər Əliyevin rəhbərliyi dövründə ölkəmiz öz iqtisadi inkişaf yolunu müəəyyən etmiş və bu yolda beynəlxalq təşkilatlarla əməkdaşlığın faydalarından və eyni zamanda inkişaf etmiş ölkələrin keçmiş təcrübələrindən yararlanmışdır (Şəkərəliyev, 2009).

Keçən əsrin yekunlarını yeni yaranmış Azərbaycan Respublikasının taleyi baxımından xarakterizə etdikdə görə bilərik ki, bu dövr ümummilli lider Heydər Əliyevin qərarlaşdırdığı strateji addımları və onun aldığı qərarları uğurlu bir şəkildə həyata keçirməyə nail olması ilə səciyyələnir. Sovet İttifaqının dağılması ilə birlikdə Azərbaycan müstəqilliyini yenidən bərpa edərək öz tarixində yeni bir mərhələyə qədəm qoymuş və bu yeni yaranmış respublika siyasi və dövlət xadimi Heydər Əlirza oğlu Əliyevin idarəçilik bacarıqları ilə daima irəliyə doğru addım atmağa nail olmuşdur. Qeyd etməliyik ki, Heydər Əliyevin bu bacarıqları təkcə diplomatik, siyasi və mədəni əlaqələr sferalarında deyil, həmçinin ölkəmizin iqtisadi sferasında da təsirsiz ötüşməmişdir.

Seçilmiş tədqiqat metodlarının tətbiqi üçün yerli və xarici ədəbiyyatlardan, mövzu ilə əlaqədar elmi məqalə, jurnal və elektron qəzetlər və s. resurslardan istifadə istifadə edilmişdir. Daha dəqiq desək, başda Azərbaycan Respublikasının Dövlət Statistika Komitəsi, Azərbaycan Respublikasının İqtisadiyyat Nazirliyi olmaqla bir sıra müxtəlif yerli dövlət orqanlarının internet portallarında təqdim olunmuş faydalı məlumatlar bu tədqiqat işinin informasiya bazası arasında öz yerini tapmışdır. Bununla yanaşı, dövlətimizə məxsus rəsmi sənədlər, tədqiqat mövzusu üzrə daha əvvəl aparılmış olan elmi araşdırmalar və digər elmi ədəbiyyatlardan da geniş istifadə edilmişdir. Bundan əlavə, ölkəmizdə nəşr edilən KİV-lərdən götürülən informasiyalar, Azərbaycan Respublikası Prezidentinin Fərman və Sərəncamları, Heydər Əliyevin məruzə və çıxışlarından götürülmüş materiallar, Azərbaycan, Türkiyə və Rusiya dövrü mətbuatında dərc olunmuş rəsmi məlumat və sənədlər bu tədqiqat işinin əsas informasiya bazasının təşkil etməkdədir. Məqalənin yekun hissəsində istifadə olunmuş bütün metodlar əsas götürülərək əldə edilən ümumi nəticə qeyd olunmuşdur.

Bu məqalənin əsas məqsədi Azərbaycanın müstəqillikdən sonrakı illərdə təcrübə etdiyi iqtisadi uğurlar işığında ümummilli lider Heydər Əliyevin iqtisadi siyasət kursunun və Heydər Əliyevin iqtisadi siyasəti çərçivəsində şəffaflıq amilinin və milli təhlükəsizliyin ölkəmizdə iqtisadiyyatın və biznesin inkişafındakı rolunun təhlil edilib araşdırılmasıdır. Bu tədqiqat işində ümummilli lider Heydər Əliyevin iqtisadi siyasət kursunda şəffaflıq amilinin və təhlükəsizlik siyasətinin ölkə iqtisadiyyatı və biznesin inkişafında müsbət təsirə malik olduğu nəticəsinə gəlinmişdir. Məqalənin yekun hissəsində istifadə olunmuş bütün metodlar əsas götürülərək əldə edilən ümumi nəticə qeyd olunmuşdur.

**Mövzunun təhlili.**

Azərbaycan keşməkeşli postsovet dövründən çıxdığı bir vaxtda Heydər Əliyev sabitliyin, inkişafın və beynəlxalq əlaqənin gücləndirilməsinə yönəlmiş mühüm iqtisadi islahatlar həyata keçirdi. Heydər Əliyev prezidentliyi dövründə Azərbaycan iqtisadiyyatının modernləşdirilməsinə və şaxələndirilməsinə yönəlmiş bir sıra əsas iqtisadi siyasət və təşəbbüslər həyata keçirmişdir. Neft gəlirlərinin cəlb edilməsi və idarə olunması üçün Dövlət Neft Fondunun yaradılmasından tutmuş xarici investisiyaların cəlb edilməsinə və infrastruktur layihələrinin başlanmasına qədər iqtisadi mənzərə əsaslı dəyişikliklərin şahidi oldu. Bu siyasətlərin nə dərəcədə şəffaf olduğunu başa düşmək bu dövrdə Azərbaycanın iqtisadi inkişafını istiqamətləndirən idarəetmə prinsiplərini qiymətləndirmək üçün çox vacibdir.

Heydər Əliyev rəhbərliyi altındakı iqtisadi siyasət sterategiyasının mahiyyətinə keçməzdən əvvəl Sovet İttifaqı dağıldıqdan sonra yenicə müstəqillik qazanmış Azərbaycan Respublikasının qarşılaşdığı çətinliklərdən bəhs etmək olduqca vacib əhəmiyyət kəsb edəcəkdir. Belə ki,

iqtisadiyyatda xüsusi çəkisinin artırılması nəzərdə tutulmuşdur (AzSTAT, 2023). Ümumilikdə isə, ötən müddətdə görülən işlər və dəstək mexanizmləri, eləcə də, KOB Dostu və KOB İnkişaf Mərkəzləri kimi dəstəkləyici qurumların fəaliyyətinin genişlənməsi ölkəmizdə bu bizneslərin inkişafına dövlət qayğısının göstəricisidir və böyük inkişaf perspektivlərinin mövcudluğundan xəbər verir.

## Nəticə

Araşdırma göstərir ki, KOB-lar qlobal miqyasda bir çox makroiqtisadi göstəricilərin formalaşmasında, o cümlədən, insanların məşğulluğunun təmin edilməsi, ölkənin ÜDM həcminin artırılması, əlavə dəyərin yaradılması və eləcə də, yeni innovasiya və texnologiyaların istehsalata tətbiqində mühüm rol oynayır. Buna görə də, müvafiq bizneslərin araşdırılmasına həsr olunan tədqiqat işlərinin də aktuallığı artmış və sayı çoxalmışdır. KOB-lar müştərilərlə daha sıx münasibətlər qurması, bazar tələbinə çevik cavab vermək imkanları və trendə uyğun məhsul və xidmətlər təklif edə bilmək, eləcə də, orta təbəqənin inkişafını dəstəkləmək kimi bir çox üstün cəhətlərə malik olmasına baxmayaraq onların müəyyən zəif cəhətləri də vardır. Məsələn, bu tip müəssisələr böyük maliyyə resurslarına malik olmadıqlarına görə müvafiq proqram və xidmətlərdən istifadə edə bilmirlər və kibertəhlükəsizlik baxımından təhdidlərlə qarşılaşırlar. KOB-ların digər bir problemi isə, onların maliyyə mənbələrinə çıxış imkanlarının zəif olması ilə bağlıdır. Bu amil onların fəaliyyətinə mənfi təsir edir, bəzən böyüməsi və inkişafına mane olur. KOB-ların təsnifləşdirilməsi meyarlarının müəyyənləşdirilməsi meyarlarına gəlincə, AB və Azərbaycanda biznes müəssisələrinin təsnifləşdirilməsi meyarları arasında ümumi yanaşmada böyük oxşarlıq olsa da, Azərbaycanda mikro, kiçik, orta və iri olmaqla dörd kateqoriya biznes subyektləri müəyyən olunduğu halda, AB-nin müvafiq sənədində iri sahibkarlardan bəhs olunmamışdır. Həm Azərbaycanda, həm də AB-də mikro, kiçik və orta sahibkarlar üçün müəyyən olunan işçi sayı əsasən eyni olsa da, bu sahibkarları fərqləndirmək üçün Azərbaycanda illik gəlir, AB-də isə maliyyə dövriyyəsi indikatorlarından istifadə olunduğuna görə birlik ölkələri üçün bu göstəricilər daha böyük maliyyə məbləği ilə müəyyənləşdirilmişdir. Digər bir əsas fərq də ondan ibarətdir ki, AK Azərbaycan NK-dən fərli olaraq müvafiq meyarları müəyyənləşdirərkən sahibkarların kapitalı indikatorundan da istifadə etmişdir.

## Ədəbiyyat

1. D Al-Tayyar, R.S., Abdullah, A.R.B., Abd Rahman, A., Ali, M.H. (2021). Challenges and obstacles facing SMEs in the adoption of e-commerce in developing countries; A case of Saudi Arabia.
2. Nizaeva, M., Coshkun, A. (2018). Determinants of the financing obstacles faced by SMEs: An empirical study of emerging economies. Journal of Economic and Social Studies, 7(2), 81 p.
3. Hewitt, L.M., van Rensburg, L.J.J. (2020). The role of business incubators in creating sustainable small and medium enterprises. The Southern African Journal of Entrepreneurship and Small Business Management, 12(1), 9 p.
4. Mammadli, G., Stasiak-Betlejewska, R. (2016). Factors affecting success of SMES in Azerbaijan. Archives of Engineering Knowledge, 1(1), pp.56-58.
5. Wozniak, M., Duda, J., Gąsior, A., Bernat, T. (2019). Relations of GDP growth and development of SMEs in Poland. Procedia Computer Science,
6. Gyori, A., Czako, A., Horzsa, G. (2019). Innovation, financial culture, and the social-economic environment of SMEs in Hungary. East European Politics and Societies, 33(4), pp.976-1004.
7. Hashi, I., Krasniqi, B.A. (2011). Entrepreneurship and SME growth: evidence from advanced and laggard transition economies. International Journal of Entrepreneurial Behavior & Research, 17(5), pp.456-487.
8. GEM. (2022). 2021/2022 Global Report. Opportunity Amid Disruption.

9. Bayramov, V., Hasanov, R., Aghayarli, L., Kadyrov, Z., Aghahasanli, I., Isayev, S. (2017). A comparative study on development of small and medium enterprises (SMEs) in Azerbaijan. Available at SSRN 3485576.
10. Publications Office of the European Union. (2018). Annual report on European SMEs 2017/2018.
11. https://ec.europa.eu/growth/smes/sme-definition_en
12. Ahmadov, F., Valiyev, J. (2019). The evaluation of small and medium enterprises role in economic development of Azerbaijan. Economic and Social Development: Book of Proceedings, pp.397-408.
13. http://www.e-qanun.az/framework/41048
14. AzSTAT. (2023). Azərbaycanda mikro, kiçik və orta sahibkarlıq.

Göndərilib: 24.01.2024 Qəbul edilib: 30.03.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/115-120

**Fatma Sultanova**
Lənkəran Dövlət Universiteti
magistrant
frzayeva652@gmail.com

# NAĞILLAR TƏLİM-TƏRBİYƏ VASİTƏSİ KİMİ

**Xülasə**

Azərbaycan xalqının zəngin el yaradıcılığı növlərindən biri də xalq nəsridir. Xalq nəsri öz fantastik mahiyyətinə görə digər janrlardan fərqlənir. Burada əməkçi xalqın arzu və istəkləri öz əksini tapır. Xalq nəsrinin tarixi çox qədimdir. Onlar insan cəmiyyətinin formalaşdığı ilk gündən yaranmağa başlamışdır. Xalq nəsri xalq düşüncəsinin və onun keçdiyi tarixi yolun, bu yolda keçirilən həyəcanın yaddaşı rolunu oynayır. Xalq nəsrində mifaloji süjetlərə tez-tez rast gəlmək olur. Bu süjetlər zaman etibarı ilə çox qədimdir. Belə xalq nəsri onu yaradan, öz mühitində bəsləyən və yaşadan insanın tarixi rolunu oynayır. Nağıl xalq ruhunun daşıyıcısıdır. Şərq xalqları üçün bu janr xüsusilə əhəmiyyətlidir. Çünki o, xalq ruhunun, hiss və duyğularının ifadəçisidir. Qəlbində insani ləyaqət hissləri şölələnən insanlar böyük xariqalər yaratmaq gücünə malikdirlər. Nağıla "köhnəlmiş", "arxaik" epitetləri yapışdırmaq, onu gözdən salmaq olmaz. Alman klassik fəlsəfəsinin ən böyük nümayəndəsi Hegel yazır: "Ruh hələ o dərəcədə mücərrədləşməmiş, təbii başlanğıcından ayrılmamışdır". Bu, o deməkdir ki, bədii ədəbiyyatın aparıcı gücü olan ruhun ən tükənməz mənbəyi olan nağılların orta məktəbdə tədrisi hələ uzun illər aktual olaraq qalacaqdır.

***Açar sözlər:*** *xalq nəsiri, folklor, epik növ, nağıl*

**Fatma Sultanova**
Lankaran State University
master student
frzayeva652@gmail.com

## Tales as a teaching tool

**Abstract**

Folk prose is one of the rich creative works of the Azerbaijani people. Folk prose differs from other genres due to its fantastic nature. The wishes and desires of the working people are reflected here. The history of folk prose is very old. They began to appear from the first day when human society was formed. Folk prose plays the role of a memory of folk thought and the historical path it traveled, the excitement experienced on this path. Mythological plots are often found in folk prose. These plots are very old in terms of time. Such folk prose plays the role of the history of the person who created it, nurtured it and lived it in its environment. The fairy tale is the bearer of the people's spirit. This genre is especially important for Eastern peoples. Because it is the expression of the people's spirit, feelings and emotions. People whose hearts are full of human dignity have the power to create great miracles. It is impossible to attach "outdated" and "archaic" epithets to the fairy tale and discredit it. Hegel, the greatest representative of German classical philosophy, writes: "The soul has not yet been abstracted to such an extent, it has not been separated from its natural beginning." This means that the teaching of fairy tales, the most inexhaustible source of spirit, the driving force of fiction, will remain relevant in high school for many years to come.

***Keywords:*** *folk prose, folklore, epic genre, fairy tale*

## Giriş

Epik növün ən qədim janrı olan nağıllar əsas folklor janrlarından biridir. Bu qədim şifahi xalq ədəbiyyatı nümunəsinin idraki və tərbiyəvi əhəmiyyəti şübhəsiz böyükdür.

Folklorun bu janrının əsas xüsusiyyəti onların süjetli olmasındadır. Belə ki, özünəməxsus məzmun müxtəlifliyi, ədəbi prinsipinə görə hər bir janrın süjetinin spesifikliyi var. A.İ.Nikiforov hər bir janrın müxtəlifliyini qeyd edərək yazırdı ki, nağıllarda əsas məqsəd əyləncədir. Sokolov qardaşları da nağılların əsas xüsusiyyətini əyləncəlilik və məşğulluq hesab edirdi. Puşkin deyirdi: «-Сказка лож, да вней намек, добрым молодцам урок». Nağılçının əsas məqsədi danışdığı nağıla dinləyicinin diqqətini cəlb etmək, əyləndirmək, hərdən heyrətləndirməkdir. Bu məqsədlə də o, real həyat həqiqətlərinə hərdən qeyri-adi, fantastik ifadə forması verir. Bütün bunlar müxtəlif nağıl janrlarında müxtəlif şəkildə öz əksini tapmışdır (Suleymanova, Bagirova, 2015).

Nağıl xalq ruhunun daşıyıcısıdır. Şərq xalqları üçün bu janr xüsusilə əhəmiyyətlidir. Çünki o, xalq ruhunun, hiss və duyğularının ifadəçisidir. Qəlbində insani ləyaqət hissləri şöləl期ən insanlar böyük xariqələr yaratmaq gücünə malikdirlər. Nağıla “köhnəlmiş”, “arxaik” epitetləri yapışdırmaq, onu gözdən salmaq olmaz. Alman klassik fəlsəfəsinin ən böyük nümayəndəsi Hegel yazır: “Ruh hələ o dərəcədə mücərrədləşməmiş, təbii başlanğıcından ayrılmamışdır”. Bu, o deməkdir ki, bədii ədəbiyyatın aparıcı gücü olan ruhun ən tükənməz mənbəyi olan nağılların orta məktəbdə tədrisi hələ uzun illər aktual olaraq qalacaqdır (Hasanli, 2014).

Xalq ruhunun ifadəçisi olan folklor insanın qəlbini müqəddəs, ülvi duyğularla doldurur. Nağıllarda ifadə edilən təmiz hisslər dinləyiciyə və ya oxucuya qanad verir, onu ucaldır, mənəvi dünyanın sirli, soraqlı aləminə aparır. İnsanı ağılla bərabər duyğularla da idarə edir. Onu qurub yaratmağa təhrik edir. Bütün bunlara görə orta məktəbin aşağı siniflərində folklor nümunələri, xüsusilə nağıllar tədris olunur.

Orta məktəblərin V sinifləri üçün bir-birinə alterantiv iki ədəbiyyat dərsliyi çap olunmuşdur. Birinci dərsliyin müəllifləri Soltan Hüseynoğlu, Bilal Həsənli, Əminə Səfərova, Əsgər Quliyev, ikinci dərsliyin müəllifi Afət Süleymanova, Təranə Bağırova və İlhamə Muradovadır. Birinci dərslikdə şifahi xalq ədəbiyyatı ilə bağlı kifayət qədər material verilmişdir. Bu dərslikdə “Yetim İbrahimin nağılı”, “Üç qardaş” özbək nağılı, “Pəri bulağı” əfsanəsi, A.Şaiqin “Ata sözü”, S.S.Axundovun “Əhməd və Məleykə”, “Padşahla Pinəçi”, “Loğmanın şəyirdi”, “Ağıllı uşaq” kimi həm müəllif, həm də xalq nağılları nəşr olunmuşdur. İkinci dərslikdə isə xalq ədəbiyyatı nümunələri çox zəifdir. Verilən nağıllar əsasən müəllifləri olan nağıllardır. Buna görə də biz xalq nağıllarından nümunə kimi “Yetim İbrahimin nağılı” üzərində dayanmaq istəyirik. Bu nağıl iki dərs saatında tədris olunur. Birinci dərsdə onun yarısının məzmunu, ikinci dərsdə isə o biri yarısının məzmunu öyrədilir. Bu nağılı çap edərkən dərslik müəllifləri kitabın əvvəlində belə sözlər yazırlar: Oxuyacağınız nağılda xeyirlə şərin mübarizəsi, yoxsul bir ovçunun oğlu olan İbrahimin, zalım padşah və vəzirlə qarşılaşmasında öz əksini tapır. Qəhrəman çətin sınaqlardan keçir. Oxuda diqqətli olun: Əsəri oxuyarkən İbrahimin bu sınaqlardan nəyin sayəsində qalib çıxdığını aydınlaşdırmağa çalışın. Əsəri oxuyarkən sizə tanış olmayan sözlərin mənasını lüğətlərin köməyi ilə aydınlaşdırın (Alizade, Alizade, 2010: 315).

Nağıl dərslikdə təxminən 10 səhifə yer tutmuşdur. Nağıl bitdikdən sonra müəlliflər belə tapşırıqlar verirlər.

“Məzmun üzərində iş

*Əsəri diqqətlə oxumusunuzmu?

1. İbrahimin atası başqa ovçulardan nə ilə fərqlənirdi?
2. İbrahim padşahın hansı tələblərini yerinə yetirirdi?
3. Ağ divin bağına göndərilən İbrahim kimdən məsləhət aldı?
4. İbrahim səfərdən kimlə qayıtdı?
5. İbrahim insanları padşahın zülmündən necə xilas etdi?

*Əsərin məzmununu fərqli formalarda danışın.

Əsəri hissələrə ayırıb ad verin, birinin məzmununu hazırladığınız plan əsasında yığcam nağıl edin. Öyrəndiyiniz yeni sözlərdən istifadə etməyi unutmayın.

*Yığcam nağıletmə

Biri var idi, biri yox idi. Bir yoxsul ovçu var idi. Ovçunun İbrahim adlı balaca oğlu var idi. Günlərin bir günündə İbrahim boya-başa çatmamış atası xəstələnib öldü. Elə ki İbrahimin on beş

yaşı tamam oldu, anasından atasından qalan tütəyi, bir də tələni istədi ki, ova getsin (Alizade, Alizade, 2010: 286).

Təhlil

*Əsərlə bağlı açıqlamalar.

Nağıllarda xalqın arzusu, istəyi ifadə olunur. Azad, firavan yaşamağı arzulayan xalq şər qüvvələrə, pisliklərə nifrət edir, sevimli qəhrəmanını yaradır. Bu qəhrəman şər qüvvələrə, pisliklərə qarşı çıxır, mübarizə aparır. Müdrik qocalardan məsləhət, xalqdan güc, qüdrət alan bu qəhrəman zalımlara qalib gəlir, zülmə son qoyur" (Yusifov, 2010). Göründüyü kimi bu sual və tapşırıqlar ənənəvi təhsilin tələblərinə daha çox cavab verir. Amma nəzərə almaq lazımdır ki, hər hansı bir oxunun bitməsi hələ dərsin sona yetməsi kimi dərk olunmamalıdır. Şagird nağılı oxuyub qurtardıqdan sonra aşağıdakı işləri görməlidir.

*oxuduğu nağıldan başa düşdüklərini dəqiqləşdirməlidir. Əgər hər hansı bir məsələni genişləndirmək istəyirsə, mətnə bir daha nəzər salmalıdır.

*şagird nağıl üzərində düşünməlidir. Bu folklor janrını oxuduqdan sonra bu nağıl ona nə demək istəyir.

*əsərin qəhrəmanı öz istəyinə nail oldumu? O, öz istəyinə hansı yollarla nail oldu? Burada onun fiziki gücümü, yoxsa ağlımı köməyinə çatdı?

*Əsərdəki əsas ideyanı ifadə etmək üçün şagird kiçik bir inşa, esse yazmalıdır. İmkan olsa həmin fikri ifadə etmək üçün bir şəkil də çəksə və yaxud həmin qəhrəmanın fiqurunu plastilindən düzəldə bilsə, bu, nağılın tam mənimsənilməsinə kömək edə bilər. Buna görə də biz həmin nağılın tədrisi zamanı bu prinsiplərlə yanaşdıq və nağılda bir sıra ədəbiyyatşünaslıq elementlərini axtarıb tapdıq. Dərsin bütöv məzmununu dərk etdikdən sonra şagirdlərə ünvanlanan bir neçə sual yaratdıq. Bu suallar əsasən obrazlı fikirlər, poetik ifadələr haqqında oldu və beləliklə biz elə hesab etdik ki, "Yetim İbrahimin nağılı" əsərini keçib qurtardıqdan sonra biz təkcə əsərin məzmununu mənimsətmədik, həm də bir sıra alt standartların reallaşmasına kömək etmiş olduq. Biz digər ədəbiyyat dərsliyindən "Mərd və namərd" nağılını seçdik. Bu nağıla keçməzdən əvvəl dərslik müəlliflərinin fikirlərini uşaqlara çatdırdıq. Dərslik müəllifləri yazırdı ki, hər bir bədii əsər həyatın obrazlı şəkildə ifadə olunmasıdır (Alizade, 2014). Yəni həyatda olduğu kimi əsərlərdə də insanlar xarici görünüşlərinə, düşüncələrinə, hisslərinə görə fərqlənirlər. Bu dərslikdə bir-birinin qarşısında dayanan iki insan başının təsviri verilmişdir. Hər ikisinin içində düşüncələr, hisslər, təsvir, məqsəd, hərəkət, səciyyəvi cəhət kimi şagirdi düşünməyə məcbur edən sözlər yazılmışdır. Hər bir şagird bu nağılı oxuyub qurtarandan sonra öz sinfini, ad və soyadını, əsərin adını, obrazları qeyd etdikdən sonra yuxarıdakı məfhumlara cavab verməyə çalışmalıdır. Həmçinin onlar müstəqil şəkildə əldə etdiyi fikirləri yoldaşları ilə bölüşməlidir. Bu dərsliyin üstün cəhəti ondan ibarətdir ki, hər bir abzasda müəlliflər şagirdləri oxuya cəlb edəcək suallar verirlər. Bu suallar mövzunun daha aydın dərk olunmasına kömək edir. Bu kitabda tapşırıqlar da maraqlıdır. Məsələn, tapşırıq 2-də yazılır ki, bu nağılı oxuduğun digər mətnlərlə əlaqələndir. Bizcə bu, yaradıcı tətbiqetmənin ən gözəl nümunəsidir. İkinci tapşırıqda yazılır ki, oxuduğun nağıl haqqında düşün. Ondan hansı qənaətə gəlmək olar? Mətnin sonunu sən necə bitirə bilərdin? Həmçinin uşaqlar üçün nağıllar haqqında müəyyən məlumatlar da verilir (Manifestation of innovative training methods and technologies, 2014).

V sinifdə "Şir və tülkü" nağılının tədrisi

Motivasiya: "Tülkü və şir" əsərinin mövzusu belədir: Bir şir meşədə tülküyə rast gəlir. Tülkü həddindən artıq arıqlamış və gücdən düşmüşdür. Şirin ona yazığı gəlir. Ondan soruşur ki, niyə bu günə düşüb? Tülkü cavab verir ki, çoxdandı yeməyə bir şey tapmır. Şir dərhal bir heyvanı ovlayıb gətirir və onun qabağına atır. Tülkü isə ətə yaxın durmur. Deyir ki, Şir burda olduğuna görə o, ətə ağzını vurmaz. Nəhayət, Tülkü həmin heyvanın bağırsaqları ilə Şirin əl-qolunu bağlayır və gözləyir ki, bağırsaqlar tamam qurusun. Şir yuxuya gedir və Tülkü yavaş-yavaş tələsmədən 2-3 günə həmin əti yeyir. Sonra Şirin əl-ayağını açmadan çıxıb gedir. Şirin əl-ayağını çaqqal açır, şir axtarıb həmin tülkünü tapır və məhv edir. Nağılın qısa məzmunu belədir: nağılın məzmununu bildikdən sonra

uşaqlara aşağıdakı sualları vermək olar (State Strategy for the development of education in the Republic of Azerbaijan, 2013):

1. Şir nə üçün tülküyə kömək etmək istəyirdi?
2. Bu hadisənin mahiyyəti haqqında nə deyə bilərsiniz?
3. Tülkü nəyə nail olmaq istəyirdi? Onun məqsədi nə idi?
4. Səncə, heyvanlar padşahı Şir nə üçün belə vəziyyətə düşdü?
5. Çaqqalın Şirə yardım etməsi nə üçün ona pis təsir etdi?
6. Hansı cümlə əsərin mövzusu ilə bağlıdır?

Bu suallara cavab tapdıqdan sonra əsərin məzmunu şagirdlər üçün tam aydın olur. Nağılların tədrisi prosesində hökmən atalar sözü və məsəllərdən istifadə etmək lazımdır. Çünki hər bir nağılın məzmunu müəyyən atalar sözünü ifadə edir.

Kiçik folklor janrlarına daxil olan atalar sözləri və məsəllərin də poetikası maraqlıdır. İctimai-tarixi həqiqətlərin bədii ifadəsindən ibarət olan bu janr xalq yaradıcılığının ən sadə formalarından biridir. Atalar sözü və məsəllərin yaradıcısı olan xalq özünün dahiyanə fikirlərini ən adi üsulla, təkcə bir-iki yığcam cümlə vasitəsi ilə ifadə etməyi böyük bir ustalıqla bacarmışdır (Süleymanova, Bagirova, Muradova, 2012).

Atalar sözü ilə məsəllər quruluş və məzmun etibarı ilə bir-birlərinə çox bənzəyirlər. Bu bənzəriş o dərəcədədir ki, hətta ilk baxışda bunların arasında heç bir fərq olmadığı zənn edilir. Lakin tədqiqatlar göstərir ki, bunları bir-birinə bənzədən ümumi əlamətlər mövcud olduğu kimi, bir-birindən fərqləndirən son dərəcə incə və çətinliklə sezilə bilən xüsusiyyətlər də vardır.

Atalar sözü mövzu, məzmun və poetik cəhətdən həm zəngin, həm də çox mürəkkəbdir.

Xalq təsərrüfatının müxtəlif sahələri ilə bağlı əməyi, zəhməti, peşəni, sənəti, elmi, ağıllı təqdir və təbliğ; İnsana xas olan nəcib sifətləri tərbiyə edən; Tənbəllik, bekarçılıq, yalançılıq, ikiüzlülük, paxıllıq və s. bu kimi eybəcər sifətləri pisləyən; Əxlaq-tərbiyə, ailə-məişət məsələləri ilə bağlı; Vətən, el, xalq, hüquq, din və s. məsələlərə toxunan atalar sözü və məsəllər vardır.

Atalar sözü və məsəllər istər mövzu, istərsə də məzmunlarına görə əsas etibarı ilə iki mənalı olur. Yəni əgər hər hansı bir atalar sözü və ya məsəldə bir şey- bir iş, əmək və ya hadisə, fikir və s. tənqid edilib pislənirsə, həmin şeyin, fikrin antonimi təriflənir, təqdir və təbliğ olunur:

“Tənbəllik azar artırar”

“İşləmək canı saf edər”.

Səfərdən, qürbətdən söz düşən kimi “Vətənə gəldim, imana gəldim” və s. hökmləri verir, fərdiyyətçilik, xüsusiyyətçilik psixologiyası “El gücü, sel gücü” kimi hökmlər qarşısında təslim olur. “Əldən qalan əlli il qalar”, “ot kökü üstə bitər” kimi deyimlər həyat təcrübəsinə əsaslanır və s.

Mövzu və poetik xüsusiyyətlərinə görə atalar sözü və məsəllər müxtəlifdir. Lakin janrın mahiyyəti onun məzmun və forma əlvanlığı ilə təyin olunur. Bu da öz növbəsində onların ayrı-ayrı tərkibli olmasına baxmayaraq, bədii formasından danışmağa imkan verir (Chopin, 1840: 12).

Poetik forma baxımından atalar sözü və məsəllər şərti olaraq üç hissəyə: a) məntiqi, b) sintaktik, c) poetik formaya ayrılır.

Atalar sözü və məsəllər dil cəhətdən materiala qənaət formasına əsaslanmışdır. Onlar əksər hallarda izah və şərh tələb etmir. Bu da janrın məntiqi, sintaksis və poetik quruluşundan irəli gəlir.

Məlumdur ki, atalar sözü və məsəllərin çoxu əsrlərin həyat təcrübəsindən irəli gələn məntiqi hökmlərdən, mühakimələrdən, sübutldardan, təsdiq və inkarlardan ibarət olur.

Tədqiqat göstərir ki, bir qayda olaraq atalar sözü və məsəllər bu məntiqi hökmlərin mühakimə formasından daha çox faydalanmışdır.

Məntiqi ümumtəsdiqin mühakimə forması atalar sözü və məsəllərdə ən geniş yayılmış tipdir:

“Dost bərk ayaqda tanınar”

“Ağıl yaşda deyil, başdadır”.

Hikmətli sözlərdəki məntiqi mühakimənin digər növü ümumi inkardır:

“Yaxşıya yaxşı deyiblər, pisə pis”.

Deməli, atalar sözü və məsəllərdə öz ifadəsini məntiqi mühakimə prosesində tapır. Beləliklə, məntiqi forma atalar sözü və məsəllərdə verilən cavabın ən yığcam, lakonik olmasını təmin edir.

(Əsərdəki obrazların xüsusiyyətlərinin müqayisəsi)

Bildiyimiz kimi, bədii əsərlər həyatın obrazlı ifadəsidir. Yəni həyatda olduğu kimi, əsərlərdə də insanlar xarici görünüşünə, düşüncələrinə, hisslərinə, məsələlərə münasibətlərinə görə fərqli və oxşar olurlar.

Bədii əsərdə bu oxşarlıqların və fərqlərin xüsusi əhəmiyyəti var. Bu, oxucuya həyatda qarşılaşdığı insanların ayrı-ayrı xüsusiyyətlərini müəyyən etməyə və ondan çıxış edərək həmin insanın şəxsiyyəti barədə nəticələrə gəlməyə kömək edir.

Ətrafdakıları qısa müddətdə tanımaq onlarla ünsiyyətin və münasibətin qurulmasına yardımçı ola bilər (Asmolov, 2014).

Yazıçı ayrı-ayrı obrazların oxşar və fərqli cəhətlərindən ideyanı yaradan fikirlərin formalaşmasında istifadə edir.

Filologiya üzrə fəlsəfə doktoru, dosent Q.Rufullayev qeyd edir ki, nağıllarda tarixilik, humanizm, birgə yaşayış, ümumi düşüncə, mübarizlik və qəhrəmanlıq bir dəyər kimi əks olunnmaqdadır. Ən təəccüblüsü budur ki, dünya xalqlarının nağıllarında eyni coşqu, oxşar süjetlər əsasında təqdim olunmuşdur (s.148). Doğrudur, xalq nağıllarında ifadə olunan bu dəyərlər gənc nəslin təlim- tərbiyəsində xüsusi rola malikdir. Yetişməkdə olan gənc nəsil tərəfindən çox bəyənilən janr olan nağıllar uşaqların tərbiyəsində, onların dünyagörüşünün artmasında, vətənpərvərlik ruhunda böyüməsində, saleh əməl sahibi olmasında, bir sözlə, hərtərəfli və mükəmməl şəxiyyət kimi formalaşmasında mühüm yer tutur. Bu məsələ ümumilli liderimiz H.Əliyevin də diqqətdə saxladığı problemlərdəndir. Uşaqlar bizim gələcəyimizdir. Gələcəyimizi nə cür tərbiyə edəcəyiksə, böyüdəcəyiksə, ölkəmizin, millətimizin, dövlətimizin gələcəyi bundanasılı olacaqdır» (Heydər Əliyev). Nağıllarımızla tanış olan şagirdlər bəşəriyyəti pisliklərdən xilas etmək, ehtiyacı olanlara yardım etmək, ac olanlara yemək vermək, böyüklərə hörmət, sevdiklərinin dəyərini bilmək, vətəni canı bahasına da olsa, qorumaq və s. kimi müsbət xarakterlərə köklənərək şəxsiyyət kimi formalaşırlar. Nağılların öyrədilməsi zamanı müəllimlərin üzərinə böyük yük düşür. Bu zaman əyani vasitələrdən istifadə, kiçik səhnəciklərin hazırlanması məqsəduyğundur. Daha yaxşı olar ki, nağılların məzmunu ilə bağlı müxtəlif suallar hazırlayıb onlara təqdim edilsin. Şagirdlərin diqqətini özünə çəkmək üçün ilk növbədə pişrov nümunəsi demək olar:

Hamam-hamam içində,
Xəlbir saman içində,
Dəvə dəlləklik elər
Köhnə hamam içində.
Hamamçının tası yox,
Baltaçının baltası,
Burdan bir tazı keçdi,
Onun da xaltası yox.
Qarışqa şıllaq atdı,
Dəvənin budu batdı.
Milçək mindik, Kür keçdik,
Yabaynan doğa içdik (Rufullayev, 2021: 210).

## Nəticə

Azərbaycan folklor nəsri xalqın həyatı, xalqın haqq-ədalət, azadlıq mübarizəsi ilə bağlı tarixi hadisələrdən bəhs edir. Bu nəsrin qəhrəmanları xalqdan olan mərd və cəsur insanlardır. Belə xalq nəsrinin orta məktəblərdə tədrisi şagirdlərin vətənpərvərlik ruhunda, yetişkin şəxsiyyət kimi, mənəvi dəyərlərlə zəngin bir insan olaraq tərbiyə olunmasında rolu əvəzolunmazdır.

Nağılları tədris etməklə biz şagirdlərə ata və babalarımızın keçdiyi tarixi yolu onların mənəviyyatında baş vermiş prosesləri öyrətmiş oluruq. Nağılda xalqın mənəviyyatı yaşayır. Nağıl xalq təfəkkürünün məhsuludur. Şagirdlərin ədəbi inkişafında ən mühüm amil nağılların təhlilidir. Təhlil prosesində birbaşa bədii təəssürat həyat təcrübəsi ilə əlaqələndirilir, zəruri nəzəri anlayışlar

mənimsənilir, emosional qiymətləndirmə fəaliyyəti formalaşır. Əsas metodoloji prinsip forma və məzmunun konsubstantivliyi prinsipidir. Lakin oxucunun bilavasitə qavrayışını və yaş xüsusiyyətlərini nəzərə almaq və təhlil edilən dastanın kontekstinə əsaslanma tələbini də nəzərə almaq vacibdir. Təhlildə mətn hərfi mənasında deyil, daxili şifahi, psixoloji, süjet və s. əlaqələri ilə dərk edilməlidir.

## Ədəbiyyat

1. Suleymanova, A., Bagirova, T. (2015). Methodical materials for the subject "Literature" of the 6th grade. Baku.
2. Hasanli, B.A. (2014). Methodology of teaching literature. Baku: Teacher.
3. Alizade, A., Alizade, H. (2010). Pedagogical psychology. Book I. Baku, 315 p.
4. Alizade, A., Alizade, H. (2010). Pedagogical psychology. Book II. Baku, 286 p.
5. Yusifov, F.A. (2010). Methodology of teaching literature. Baku: Publication of ADPU.
6. Alizade, A. (2014). The world view of the student world. "Azerbaijan School" magazine. No.
7. Manifestation of innovative training methods and technologies. (2014). Baku: XXI century Education Center.
8. State Strategy for the development of education in the Republic of Azerbaijan. (2013). "Azerbaijan teacher" newspaper. October 25.
9. Süleymanova, A., Bagirova, T., Muradova, I. (2012). Literature, textbook for class V. Baku.
10. Chopin, I. (1840). Ker-ogly. Tatar legend. I.Chopin. Rez. In Polyanova. Beacon of modern enlightenment and education. Works of Russian and foreign scientists and literary scholars. St. Petersburg, part 2, chapter 3, pp.12-25.
11. Asmolov, A.G. (2014). How to design universal educational activities in elementary school. - M.: Education.
12. Rufullaev, Q. (2021). "Lyric and epic genre in oral folk literature". Baku: Science and Education.

Göndərilib: 27.01.2024 Qəbul edilib: 28.03.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/121-125

**Azer Haziyev**
Wroclaw, Poland
azar.haziyev@gmail.com

# HYBRID WARFARE: HOW TO DEFINE AND COUNTER?

**Abstract**

The main aim of this paper is to analyze hybrid warfare, its characteristics and components, and the challenges that states face in their struggles with it. The paper also proposes several ways to counter hybrid warfare. Throughout the paper, the concept of hybrid warfare is mainly investigated based on the Crimean conflict. In the context of security issues in international relations, the analysis of the hybrid warfare concept carries paramount importance taking into account the increasing attention to it. The investigation of hybrid warfare and its tools can assist the countries to define potential hybrid threats and to design proper strategy to struggle with them.

***Keywords:*** *Hybrid Warfare, Russia, Ukraine, Crimea, war*

**Azər Həziyev**
Vrotslav, Polşa
azar.haziyev@gmail.com

## Hibrid müharibə: necə təyin etmək və ona qarşı necə mübarizə aparmaq?

**Xülasə**

Bu yazının əsas məqsədi hibrid müharibə, onun xüsusiyyətlərini və komponentlərini və dövlətlərin hibrid müharibələr zamanı qarşılaşdıqları problemləri təhlil etməkdir. Eyni zamanda, məqalə hibrid müharibəyə qarşı mübarizənin bir neçə yolunu təklif edir. Məqalə boyu hibrid müharibə anlayışı əsasən Krım münaqişəsi əsasında araşdırılır. Beynəlxalq münasibətlərdə təhlükəsizlik məsələləri kontekstində hibrid müharibə konsepsiyasının təhlili ona artan diqqəti nəzərə alaraq mühüm əhəmiyyət kəsb edir. Hibrid müharibənin və onun alətlərinin tədqiqi ölkələrə potensial hibrid təhlükələri müəyyən etməyə və onlarla mübarizə üçün düzgün strategiya hazırlamağa kömək edə bilər.

***Açar sözlər:*** *Hybrid Warfare, Rusiya, Ukrayna, Krım, müharibə*

## Introduction

### What is hybrid warfare?

The term of Hybrid Warfare was in use after the Hezbollah-Israel war in 2006, but became popular after the annexation of the Crimean Peninsula by the Russian Federation in 2014 in political, military, and academic circles. Despite being mainly explained by Russia's actions in Crimea, the hybrid warfare phenomenon had been used from the early 2000s. While the concept grabbed the attention of the large audience, the lack of clarity of the definition remained problematic. Reichborn and Cullen note that the term was being used with reference to different wars by different authors and this can simply show the analytical confusions over the use of hybrid warfare term. While it was used to describe a new type of warfare conducted by non-state actors in the early 2000s, later it referred to the actions of states, particularly Russia in the mid-2010s. Discussions over the topic of whether the hybrid warfare phenomenon is new or not is another sign of the inaccuracy regarding the conceptualization (Reichborn, Cullen, 2016: 1). Although there were many different explanations with regard to it, generally it was being defined as a mixed-use of regular and irregular forces against the enemy in conflicts.

Though there is no unanimously accepted definition of hybrid warfare among analysts, there are generally observed features through which it is possible to formulate a common definition. These

features are difficulty in differentiating between the state of war and peace, blurring warfare modes by simultaneously merging conventional and unconventional, regular and irregular, linear and non-linear, covert and overt methods of conducting war by states and non-state actors, being dynamic, flexible, unpredictable, subversive, complex and multidimensional (Rusnakova, 2017: 346; 3). Referring to these key features, Hoffman described contemporary hybrid threats as following:

"Hybrid threats incorporate a full range of modes of warfare, including conventional capabilities, irregular tactics, and formations, terrorist acts that include indiscriminate violence and coercion, and criminal disorder. These multi-modal activities can be conducted by separate units, or even by the same unit, but are generally operationally and tactically directed and coordinated within the main battlespace to achieve synergistic effects in the physical and psychological dimensions of the conflict" (Baezner, Robin, 2018; Sliwa, Veebel, Lebrun, 2018).

The definition suggested by European Parliamentary Research Service describes hybrid warfare as "…a phenomenon resulting from convergence and interconnection of different elements, which together form a more complex and multidimensional threat". Another definition of hybrid warfare provided by NATO in the Wales Summit of 2014 consisting of "…wide range of overt and covert military, paramilitary, and civilian measures employed in a highly integrated design" (Rusnakova, 2017: 346)

Although many analysts commented on the topic, there is not a fixed definition to describe hybrid warfare. What is more important on that point is to clearly describe the key components of hybrid warfare to better understand the concept. Therefore, I will be talking about the components of hybrid warfare in the second part (The Ukraine conflict, economicâ"military power balances and economic sanctions, 2016).

**Components of hybrid warfare.**

The components of hybrid warfare are various and diverge. While discussing the component of hybrid warfare, analysts mainly focus on Russia's hybrid war in Crimea. Research conducted by Caliskan and Cramers shows that approximately half of the authors mention the Russia-Ukraine conflict as a relevant example of hybrid warfare. Other examples such as "Russia's recent activities against the West or NATO" have also close ties with the Russia-Ukraine conflict (Caliskan, Cramers, 2019: 12). The analysis of data indicates that the authors mainly see the Russia-Ukraine conflict as hybrid war. The given case is a unique one that can help us clearly understand the full spectrum of the hybrid war. Therefore, this article also focuses on the Russia-Ukraine conflict and listed the components based on the Crimean case. These components are following:

1. Information warfare
2. Cyber Warfare
3. Psychological operations
4. Intelligence means
5. Proxies
6. Economic tools

Information warfare: is the conflict between two or more groups in the information environment (Porche, Paul, York, Serena, Sollinger, Axelband, Held, 2013: 14). While there is no unanimously accepted definition of information warfare, analysts mainly define it as a strategy for the use and management of information to pursue a competitive advantage, including both offensive and defensive operations (Deshpande, 2021). Russia has effectively used information warfare within the broader hybrid warfare perspective during the Crimean conflict as well as during the war in Georgia and East Ukraine. The main goal of information warfare is to influence the internal and external politics of the targeted state.

Cyberwarfare: In comparison with information warfare, cyber warfare has a more technical and specific meaning refers to the attacks aim to disrupt the computer and cyber system of the target. Generally, cyber warfare is referred together with information warfare due to their close relation (Chivvis, 2017: 5). Beyond stealing essential information, the goal of cyber attacks might be to influence and manipulate the population in favor of the attacker (Chivvis, 2017: 3).

Psychological operations: Such operations are conducted to transmit selected ideas and information to the target with the aim to affect the emotions, actions, behavior, policy as well as objective reasoning of the target. The target of psychological operations may vary from individual to certain groups, organizations, and states (Caliskan, Cramers, 2018: 5; Hunter, Pernik, 2015). As an example, throughout the actions in the Crimean Peninsula Russian side spread the myth claiming that the Ukrainian government is based on fascist ideology and it poses an existential threat to the civilian population in Crimea (Rusnakova, 2017: 362).

Intelligence means: Intelligence and special service organs actively participate in hybrid warfare. As a part of the modernization process of the military, Russia additionally strengthened its SOF (Special Operation Forces). These units have been involved in a broad range of activities including directly leaking other states (Chivvis, 2017: 4).

Proxies: are certain groups with sympathy to the side that conducts hybrid warfare and serve its interests. Night Wolves, a club of bikers known as an anti-American and nationalist group can be shown as a good example to the proxies. Generally, this group does not have certain goals, though it is being used to implement different tasks within hybrid warfare (Caliskan, Cramers, 2018: 4).

Economic tools: are also defined as a part of wider hybrid warfare. Davis emphasized that economic warfare (including specific economic sanctions) is intended mainly to influence economic, technology, and military power balances to the advantage of the country/alliance conducting it (Davis, 2016: 170). Blocking bank accounts, imposing restrictions on bilateral and multilateral trade, banning companies, and limiting free movement are examples of economic tools employed during hybrid warfare (Rusnakova, 2017: 350). In the context of the Crimean conflict, energy tools were used as a part of wider economic warfare to change the balance of powers in favor of Russia. By using the energy dependency of many European states, Russia still manages to influence the politics of these states (Caliskan, Cramers, 2018: 4).

**Countering hybrid warfare.**

After clarifying the meaning of hybrid warfare, as well as its components, the next milestone is to define how to counter hybrid warfare. In this context, it should be emphasized that it is expected to observe the increase of hybrid threats in near future. There are several reasons that lead us to come to this conclusion:

1. The changing balance of powers and competition over the sphere of influence will lead the actors to actively participate in confrontation and defy the current status quo;
2. In the context of rising cooperation among states, the actors of the system will be more vulnerable to hybrid threats as the interdependence among them increases;
3. Futuristic developments in the field of technology will enable more actors to actively involve in the power struggle and compete over the spheres of influence.

Considering the aforementioned factors, we can predict a rising use of hybrid tools in future conflicts. Therefore, defining a proper strategy to counter hybrid threats is quite essential with regard to the changing security environment (Cullen, Wegge, 2019: 17). Monaghan mentions three respective stages of countering hybrid threats. These are as following:

1. Detecting hybrid threats
2. Deterring hybrid threats
3. Responding to hybrid threats.

Detecting hybrid threats is based on two main principles: Firstly, building close cooperation among the bodies within the state. Secondly, cooperating with partners and allies. States can use two methods to detect the hybrid threats. These are the use of special intelligence and analysis of data from technical and physical assets across the state (Monaghan, 2019: 90). Austria has developed a method for detecting hybrid threats which is based on intelligence and data analysis. The Austrian model suggests us to define national vulnerabilities and link them to the capacity and goals of the adversary through hypotheses. The next phase is to produce a plan to counter the threats (Cullen, Wegge, 2019: 28; Robinson, Jones, Janicke, 2015).

Deterring the hybrid threats is considered the most essential stage of countering hybrid warfare. Deterrence of hybrid threats has two ways: Deterrence by denial intends to avoid the capacity of an adversary to conduct hybrid warfare; and, deterrence by punishment intends to convince the adversary that any hybrid attack will bear serious consequences for the side who conducts it (Cullen, Wegge, 2019: 35-36).

The next stage of countering hybrid warfare provided by Monaghan is responding to hybrid threats. In case the adversary continues to pose a threat after deterrence, states may apply to the responding measures in order to counter hybrid threats (Cullen, Wegge, 2019: 51). However, the side which plans to respond to hybrid threats should carefully take into consideration the risk of counterescalation which may further jeopardize its security (Monaghan, 2019: 91; 16).

## Conclusion

This paper investigated the phenomenon of hybrid warfare which is popular among political and military analysts especially after the annexation of Crimea. In the first part, I tried to answer the question of "What is hybrid warfare" based on different definitions provided by analysts. The second part assessed the characteristics and components of hybrid warfare. In order to clearly define the components of hybrid warfare, I used the Crimean case study as a complementary supplement. The third part of the paper was dedicated to how to counter hybrid warfare. In this part, the paper analyzed the reasons why it is essential to counter hybrid threats and the possible ways of countering them.

The analysis of hybrid warfare showed that there are still unclear points on what is hybrid warfare and how to counter it. Current political and legal tools to address the issue lacks and this further motivates the adversaries to employ hybrid warfare tools effectively. Therefore, there is still a need to rethink the political and legal sides of the issue to counter actual threats and to define a feasible strategy to respond to them. In this context, multilateral cooperation among the countries is essential to achieve the mentioned goals.

## References


1. Reichborn-Kjennerud, Cullen, E.P. (2016). What is Hybrid Warfare? https://core.ac.uk/download/pdf/52131503.pdf
2. Rusnakova, S.N. (2017). Russian New Art of Hybrid Warfare in Ukraine. Slovak Journal of Political Sciences, 17(3-4), pp.343-380. https://doi.org/10.1515/sjps-2017-0014
3. Countering Hybrid Warfare: So What for the Future Joint Force? (2018). https://ndupress.ndu.edu/Portals/68/Documents/prism/prism_8-2/PRISM_8-2_Monaghan.pdf
4. Baezner, M., Robin, P. (2018). Hotspot Analysis: Cyber and Information warfare in the Ukrainian conflict. https://www.researchgate.net/publication/322364443_Cyber_and_Information_warfare_in_the_Ukrainian_conflict
5. Sliwa, Z., Veebel, V., Lebrun, M. (2018). Russian ambitions and hybrid modes of warfare. https://www.baltdefcol.org/files/files/publications/HybridModes.pdf
6. The Ukraine conflict, economicâ"military power balances and economic sanctions. (2016). Taylor & Francis. https://www.tandfonline.com/doi/full/10.1080/14631377.2016.1139301
7. Caliskan, M., Cramers, P.A. (2019). What Do You Mean by "Hybrid Warfare"? A Content Analysis on the Media Coverage of Hybrid Warfare Concept. DIAL.Pr - BOREAL. https://dial.uclouvain.be/pr/boreal/object/boreal:208939
8. Porche, I., Paul, C., York, M., Serena, C., Sollinger, J., Axelband, E., Held, B. (2013). Redefining Information Warfare Boundaries for an Army in a Wireless World. RAND Corporation. Retrieved February 1, 2021, from http://www.jstor.org/stable/10.7249/j.ctt3fh1qp Congressional Research Service, Defense Primer: Information Operations, 2020.
9. Deshpande, V. (2021). Hybrid Warfare: The Changing Character of Conflict. Raj Publication.

10. Chivvis, S. (2017). Understanding Russian "Hybrid Warfare": And What Can Be Done About It. https://www.rand.org/pubs/testimonies/CT468.html.
11. Hunter, E., Pernik, P. (2015). The Challenges of Hybrid Warfare. https://icds.ee/wp-content/uploads/2013/Eve_Hunter__Piret_Pernik_-_Challenges_of_Hybrid_Warfare.pdf
12. Davis, C.M. (2016). The Ukraine conflict, economic–military power balances and economic sanctions. Post-Communist Economies, 28(2), pp.167-198. https://doi.org/10.1080/14631377.2016.1139301
13. Cullen, P., Wegge, N. (2019). MCDC Countering Hybrid Warfare Project: Countering Hybrid Warfare. https://assets.publishing.service.gov.uk/government/uploads/system/uploads/attachment_data/file/784299/concepts_mcdc_countering_hybrid_warfare.pdf
14. Robinson, M., Jones, K., Janicke, H. (2015). Cyber Warfare: Issues and Challenges, www.researchgate.net. https://www.researchgate.net/publication/276248097_Cyber_warfare_Issues_and_challenges
15. Monaghan, A. (2016). Putins Way of War. Www.Academia.Edu. https://www.academia.edu/24314231/Putins_Way_of_War
16. What Do You Mean by “Hybrid Warfare”? A Content Analysis on the Media Coverage of Hybrid Warfare Concept. (2018). https://www.researchgate.net/publication/329782285_What_Do_You_Mean_by_Hybrid_Warfare_A_Content_Analysis_on_the_Media_Coverage_of_Hybrid_Warfare_Concept

Received: 05.02.2024 Accepted: 25.04.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/126-130

**Nərmin İbrahimli**
Naxçıvan Dövlət Universiteti
ORCID ID 0000-0001-8929-3943
nermin.iskenderova.92@gmail.com

# AUTENTİK DİALOQLARIN DİSKURSİV XÜSUSİYYƏTLƏRİ

**Xülasə**

Məqalədə kommunikativ mühitin təqlidini yaratmağa kömək edən autentik dialoqların diskursiv xüsusiyyətləri tədqiqat obyektinə çevrilmişdir. Məlumdur ki, ünsiyyət prosesində dialoq nitqi aparıcı yer tutur və ali tədrisdə bu nitq formasının inkişaf etdirilməsi bir sıra müxtəlif növ üsulların istifadəsini zəruri edir. İngilis dilində dialoji nitqin formalaşmasında autentik dialoqların istifadəsi cəmiyyətdə ədalətli fikir mübadiləsinin və yaradıcı düşüncənin aşkarlanmasına səbəb olmuşdur. Autentik dialoqlar ingilis dilində fikir mübadiləsi zamanı iki tərəf arasında səmərəli ünsiyyəti və öyrənənlərin real dünyaya baxışlarını formalaşdırır. Autentik dialoq qarşı tərəfə bədənin, duyğuların, intellektin və ruhun danışdığı dildir. Autentik dialoqların istifadəsi zamanı tələbələr nədən söhbət etməyi planlaşdırır, çevik vaxt parametrlərinə malik olurlar və tapşırıqların yerinə yetirilməsi üçün məsuliyyət daşıyırlar. Bununla belə, bu dialoqlarda dinləmək uğurlu və orijinal dialoqa nail olmaq üçün ən vacib tərkib hissədir. Bu məqsədlə, kommunikativ şəraitdə dialoji dil mühitinin yaradılması tədris prosesinin metodik cəhətdən düzgün və məhsuldar qurulmasını tələb edir.

Bu sahədə araşdırmalar aparan tədqiqatçılar dialoqlu tədris metodunu tələbələrin formalaşmasında fəal rol oynamağa imkan verən müəllim-şagird qarşılıqlı əlaqəsinin tərbiyəvi potensialı hesab edirlər. Onlar dialoqların diskurs xüsusiyyətlərinin tezliyi və faizi müqayisə edərək, orijinal dialoqların bir çox xüsusiyyətləri arasında əhəmiyyətli fərqlər aşkar etmişlər. Buna baxmayaraq, autentik dialoqlar iştirakçıların daxili aləmini təsvir etməyə, onların şəxsiyyətini, *statusunu və psixologiyasını göstərməyə meyllidir.*

***Açar sözlər:*** *orijinal dialoq, real dil mühiti, ellipsis, ünsiyyət*

**Narmin Ibrahimli**
Nakhchivan State University
ORCID ID 0000-0001-8929-3943
nermin.iskenderova.92@gmail.com

## Discursive features of authentic dialogues

**Abstract**

In the article, the discursive features of authentic dialogues, which help to create an imitation of the communicative environment, have become the object of research. It is known that dialogue speech takes a leading place in the communication process, and the development of this form of speech in higher education requires the use of some different types of methods. The use of authentic dialogues in the formation of dialogic speech in English has led to the discovery of a fair exchange of ideas and creative thinking in society. Authentic dialogues in the exchange of ideas in English form effective communication between two parties and learners' views of the real world. Authentic dialogue is the language that the body, emotions, intellect and soul speak to the other party. When using authentic dialogues, students plan what to talk about, have flexible time settings, and take responsibility for completing tasks. However, in these dialogues, listening is the most important ingredient to achieving a successful and authentic dialogue. For this purpose, creating a dialogic language environment in communicative conditions requires a methodologically correct and productive construction of the teaching process.

Scientists conducting research in this field consider the dialogic teaching method as the educational potential of teacher-student interaction, which allows them to play an active role in the formation of students. They compared the frequency and percentage of discourse features of the dialogues and found significant differences between many features of the original dialogues. Nevertheless, authentic dialogues tend to describe the inner world of the participants, to show their personality, status and psychology.

***Keywords:*** *authentic dialogue, real language environment, ellipsis, communication*

## Giriş

Autentik dialoqların diskursiv xüsusiyyətləri dedikdə - *leksik sıxlıq, yanlış başlanğıclar, təkrarlar, pauzalar, terminalların* üst-üstə düşməsi, nitqdə kilidləmə, *tərəddüdlər və arxa kanallar* kimi dialoq komponentlərinin təhlili nəzərdə tutulur.

*Terminalların üst-üstə düşməsi (Terminals overlapping)* dinləyicinin dinlədiyi iştirakçının danışmasını bitirdiyini və ya danışmağı bitirmək üzrə olduğunu güman etdiyi zaman baş verir. Baxmayaraq ki, danışan keçidlə əlaqəli bir nöqtəyə çatmaq üzrə deyil, dinləyici növbəni mövzuyla əlaqəli şəkildə alır və fikirlər üst-üstə düşür.

*Orijinal dialoqlarda "Başlanğıc və bağlantılar" (Beginning and closing)* vacib sayılır. Dialoqda *başlanğıc* iştirakçıya fikirlərinin vacib olduğunu hiss etdirir. Əgər qarşı tərəf bir mövzu haqqında danışmağa başlayırsa, bu zaman mövzu haqqında danışmaq əvəzinə çoxlu sual vermək lazımdır. Şəxsin adını öyrəndikdən sonra sualları artıra bilərsiniz. Qarşı tərəf çıxışı zamanı qulaq asdığınızı göstərmək üçün başınızla təsdiqləmək lazımdır. Məsələn (Abbasəliyeva, 2018):

*a) Hey! how are you doing?*

*b) I'm ok, not bad! How about you?*

*c) I'm pretty good! Thanks!*

Söhbəti nəzakətlə bağlamaq onu yaxşı açmaq qədər vacibdir. Bu, hər şeyin əhatə olunduğuna və danışdığınız şəxsin əlavə sualları və ya həll edilməli olan problemləri olmadığını ifadə edir.

Məsələn,

*d) Ok, take care!*

*e) See you later!*

Söhbət zamanı "*Arxa kanal siqnalı"(Backchannel)* dinləyicinin danışığa diqqət yetirdiyini bildirmək üçün istifadə etdiyi səs-küy, jest, ifadə və ya sözdür.

Mum: *"Let's have a good breakfast today"*

Son: *Okey!*

Mum: *... and then add some porridge .... and pancakes"*

Son: *Uh-huh*

Mum: *If you want let's have breakfast outside*

Son: *Mmm…*

*Yanlış başlanğıclar (False starts)* dialoq zamanı iştirakçı həyəcanlandıqda və bir mövzudan digərinə keçməyə başlayanda da baş verə bilər. Bu tip təkrarlar və ya düzəlişlər ən çox söhbət intensivləşdikdə, birdən çox iştirakçının danışdığı zaman və ya danışan kəsildikdən sonra baş verir.

***Simon:*** *I need to go to Europe {whereever it's}- only where it's not too crowded.*

***Kate:*** *I like to go to Europe only where it's not too crowded.*

*Pauza və ya ellipslərlərdən (Ellipsis)* ellipslərdən personajın nitqinin arxada qaldığını və ya cümləni yarımçıq qoyduğunu göstərmək üçün istifadə olunur. Sözlər və ya ifadələr arasında fasilələr göstərilmir. For example (Eminli, 2019):

- *"Did he do it ... peacefully?" – asked the court?*
- *"Yes! He did it ... not to do anyone any harm" – Arthur replied.*

*Tərəddüdlərin (Hesitations) işlənməsi* fərqli durğu işarələrinin müxtəlif uzunluqlu fasilələrə və ya fikirlərin ayrılmasına imkan verir. Bu zaman vergül qısa fasilə və ya tərəddüd etməyə imkan verir və sözlər, ifadələr və fikirlər arasında sıx əlaqə olduğunu göstərir. Məsələn,

–*Could you join us to participate in the meeting?*

*–I'm afraid... I can't*

Göründüyü kimi dialoqda iştirak edənlər real həyatda olduğu kimi orijinal dialoqla danışıq prosesinin diskursiv təbiətini yaradırlar.

**Material və metodlar.**

Məqalədə "Cutting Edge" və *"English File"* dərsliklərindən dialoqlar qeydə alınmış, transkripsiya edilmiş və dərslik materiallarının müəyyən diskurs xüsusiyyətləri baxımından orijinal materiallarla müqayisə edilmişdir. Araşdırma autentik dialoqların komponentləri olan termialların üst-üstə düşməsi, arxa kanallar, pauza, elipslər, başlanğıc və bağlantıalrın olması, tərəddüdlərin istifadəsnin tədqiq edilməsini və autentik məlumatların toplanmasını tələb edir (Oxford University Press, 2023: 271).

**Cədvəl 1. Dərsliklərdə autentik dialoqların araşdırılması.**

| № | Cutting Edge – English File | |
|---|---|---|
| 1 | Dialoqda iştirak edənlər (T1) (T2) | Dialoqda (T1) və ya (T2) arasında aparılan növbəli nitq və oxşar məlumat |
| 2 | Terminalın üst-üstə düşməsi və bağlanması | Həm dərslikdə, həm də orijinal məlumatlarda keçid yerləri ilə bağlı səhvlər |
| 3 | Arxa kanallar | Hər iki məlumatda arxa kanallaşdırmanın baş verməsi |
| 4 | Açılış və bağlanmalar | Dialoqda uyğun açılışlar və bağlanmaların olması |
| 5 | Pauzaların olması | Pauzaların sayına görə dərslik ilə orijinal məlumatlar arasında fərqlərin olması |
| 6 | Tərəddüd vasitələri (erm, er, və s.) (ıı, ar, ımm) | Hər iki dərslikdə tərəddüd siqnallarının istifadəsi tezliyinin məlumatlar |

Cədvəldən göründüyü kimi dərsliklərdə işlədilən dialoqların istifadəsində bu elementlərin işlədilməsi kommunikativ səriştələrin hansı şərtlərlə təmin olunmasını əsaslandırır. Aydın görünür ki, dialoqlarda fikirlərin bir-birinə bağlılığı, üst-üstə düşməsi bəzi səhvlərin olmasını sübut etsə də, əsl real ünsiyyət baş verir. Dərslik boyu verilən dialoqlarda müxtəlif emosiyaları, jestləri və ifadə tərzini formalaşdıran bu elementlərin istifadəsi dildə səmərəli orijinallıq yaradır və tələbələr bu tip dialoqlara üstünlük verdiyinin fərqində olurlar (Əmiraslanova, 2005: 289-292).

Çox təəssüf ki, dərsliklərdə verilən dialoqların əksəriyyəti çox az hallarda bu faktların olmasını əks etdirmir. Tələbələr çox vaxt autentik dialoqların çətin anlaşılan mürəkkəb dil strukturları və lazımsız lüğət elementlərinə malik olmasından şikayətlənir və orijinal materialda verilən məlumatların mədəni cəhətdən uyğun olmadığını qeyd edirlər. Digər bir çətinlik dialoqların tətbiqində əsas baryerlərin ortaya çıxmasıdır. Bu baryerlərə orijinallığın nümayiş etdirilməsində diqqətsizliyin olması, məhdudlaşdırılmış məlumat kanallarının istifadəsi və əlaqənin olmamasıdır (Yunusov, 2010: 336-338). Verilmiş təlimat üzrə qeyd olunan dərsliklərdə 350 sözdən ibarət orijinal məlumatlardan istifadə tezliyinin danışıq xüsusiyyətlərində müqayisəsini təqdim edirik:

**Cədvəl 2. Autentik məlumatların iki dərslik üzrə müqayisəsi.**

| № | İngilis dilində autentik dialoqlar | *Dərslik məlumatları* | | *Autentik məlumatlar* | |
|---|---|---|---|---|---|
| | | New Cutting Edge | New English File | New Cutting Edge | New English File |
| *1* | *Yanlış başlanğıc* | 1 | 3 | 3.08 | 4.5 |
| *2* | *Pauzalar* | 2 | 4 | 11.02 | 12.3 |
| *3* | *Terminalın üst-üstə düşməsi* | 2 | 3 | 09.1 | 13.4 |
| *4* | *Arxa kanallar* | 0 | 3 | 07.3 | 09.6 |
| *5* | *Tərəddüd* | 0 | 3 | 1.2 | 3.5 |
| *6* | *Açılışlar* | 2 | 4 | 4.6 | 5.8 |
| *7* | *Bağlama* | 2 | 3 | 48 | 5.9 |

Cədvəl sübut edir ki, autentik dialoqlarda yanlış *başlanğıclar* təbii söhbətlər zamanı ən çox rast gəlinən səhvlərdir, baxmayaraq ki, bu cür ifadələrin minimuma endirilməsi gözlənilir, cədvəldə dərsliklərdə verilən dialoqların orijinal məlumatlardan fərqli olaraq səliqəli olması və mükəmməl göründüyü göstərilir (cədvəl 2) (Pearson Longman, 2013: 177).

Təqdim olunan bu cədvəl üzrə qeyri-real dildə tələbələrin motivasiyası azala bilər, çünki onlar mükəmməl dil istifadəsinə nail ola bilmirlər. Bundan əlavə, gözlənilməz sosial danışıqlar öyrənənlərin dialoqun məzmununu anlamaqda xeyli çətinlik çəkdiyi zaman çoxlu lazımsız ifadələri ehtiva edir (7; Swain, 2000: 97-114).

Bununla belə, *pauzalar* suala cavab vermək, bəzi məlumat vermək və ya orijinal nitqdə söz almaq üçün ümumi ünsiyyət hadisələridir. Bununla belə, dərslik dialoqlarında nadir hallarda və ya çox qısa müddətdə təbii söhbəti əks etdirmək üçün pauzalar olur. Real söhbət zamanı növbələrin təsadüfi üst-üstə düşməsi ən çox rast gəlinir, baxmayaraq ki, bu fasilələr nitqin arzuolunmaz pozuntuları hesab olunur; digər tərəfdən nitqin kəsilməsi dialoq zamanı iştirakçıların növbələri arasında keçidlərdə heç bir boşluq olmadığını göstərir. Şəkil 1-də göstərildiyi kimi, orijinal və dərslik dialoqları arasında əhəmiyyətli fərqlər var, çünki dərsliklərdəki dialoqlar ən təmiz və səliqəlidir. Bu təbii söhbətin qarşısını alır; başqa sözlə, real həyatdakı qarşılıqlı əlaqəni süzgəcdən keçirmək, öyrənənlərin orijinal dili görməsinə mane ola bilər. Tərəddüdlər haqqında məlumatlar ingilis dilində *"Ur" və "Umm"* kimi tərəddüd vasitələri həmsöhbətlərdən biri sözünü saxlamağa çalışdığı üçün təbii söhbətlərdə ən çox istifadə olunduğunu göstərir (Gupta, Lee, 2015: 10-17). Buna baxmayaraq, qeyd olunan məlumatlar bu təbii vasitənin çox az istifadəsini sübut edir.

Bir çox hallarda, *arxa kanallar* həssas və simpatik yanaşmanın əlaməti kimi kimi qəbul edilir və dialoqda mühüm affektiv rol oynayır. Əgər onlar həmsöhbətlər arasında söhbətlər üçün təsirli məqamlar hiss olunmursa, o zaman dərslikdəki dialoqlar soyuq, orijinal deyil və danışana qarşı diqqətsiz və yersiz görünə bilər. Bundan əlavə, əgər tələbələr auditoriyadan kənarda belə qarşılıqlı əlaqəyə uyğunlaşmasalar, çox güman ki, onlar özlərini ifadə etməkdə və qarşılıqlı anlaşmada çətinlik çəkəcəklər (Breen, 1983: 60 -65). Bununla belə, istifadə olunan dərsliklər dialoqların verilməsində açılışlardan fərqli olaraq, müvafiq yekunlaşmalar demək olar ki, çox az yer alır, halbuki belə sosial-praqmatik məqamlar ingilis dili dərsliklərində verilən dialoqlarda yer almağa layiqdir (Janey, 2017: 1-8).

## Nəticə

*Dialoqda elipsislər, arxa kanalları, başlanğlc və sonluqlardan istifadə* tapşırığı üzrə eksperiment qrup 46% (24 tələbə) ilə tapşığı demək olar ki, yerinə yetirir, 36% (19 tələbə) isə tam yerinə yetirir. İrəliləyiş 43/52 tələbə uğur əldə etmişdir. Kontrol qrup isə 32% (17 tələbə) -i bu tapşırğı yerinə yetirmiş, 22% (7 tələbə) tam yerinə yetirmişlər. Kontrol qrupdan 24/28 tələbə bu nailiyyəti qazana bilmişdir. Bu tapşırıqda tələbələr rollu oyunda nümayiş etdirdikləri elipsisləri, pauzaları, terminalları yerli yerində işlədə bildilər. Tədqiqat suallarını cavablandırmaq üçün orijinal diskursun xüsusiyyətləri - leksik sıxlıq, yanlış başlanğıclar, təkrarlar, pauzalar, terminalların üst-üstə düşməsi, kilidləmə, tərəddüdlər və arxa kanallar təhlil edilmişdir (Rogers, Medley, 2018: 467-478). İki verilənlər bazası altında diskurs xüsusiyyətlərinin tezliyini və faizini müqayisə edərək, o, bir sıra diskurs xüsusiyyətləri və xüsusən də orijinal dialoqların bir çox xüsusiyyətləri arasında əhəmiyyətli fərqlərin olduğu aşkar edilmişdir. Bunlara dərslik dialoqlarında istisna edilən tərəddüd, fasilə və üst-üstə düşən növbələr də daxildir. Əldə olunan nəticələr göstərir ki, autentik dialoqun tətbiqi bir sıra psixoloji sahələrə əhatə etməklə, müxtəlif yanaşma və münasibətləri birləşdirir, səmərəli dinləmə, dialoqu kəsməməyi, bloklanmanı, uzun təfərrüatlardan uzaq olmağı təklif edir. Tətbiqi təcrübənin araşdırılması sübut edə bildi ki, dərsliklər ənənəvi dialoq strategiyasının tətbiqindən fərqli olaraq autentik dialoqların sərbəst və plansız yaradılması yollarını izah etməlidir. Burada əsas məqsəd mədəni normaları, yəni müəyyən situasiyalarda nələrin deyilə biləcəyini və nəyin söylənilməməli olduğunu nəzərə alaraq bütün cəmiyyətlərdə olduğu kimi, ana dilimizdə də cəmiyyətin açılış və bağlanma kimi bəzi uyğun konvensiyalarına malik olmaqdır (13). Ana dilimizdə *"Salam", "Xoş günlər", "İşiniz uğurlu olsun", "Daha xoş günlərdə görüşənədək"* kimi

ifadələrin işlənməsində orijinallığın hiss olunması əvvəlcədən çox faydalı olur. Əgər öyrənənlər bu çeşidlərin ana dilimizdə daha çox olduğunu bilsələr, oxşar vəziyyətlərin ingilis dilində də daha rahat istifadə etməsinə həvəs göstərərlər

## Ədəbiyyat


1. Abbasəliyeva, R. (2018). Dildə ekspressivlik və emosionallığın verbal və qeyri-verbal ifadə vasitələri ISBN: 978-9952-37-040-9, s.97-109.
2. Eminli, B.İ. (2019). Dialoji nitqin struktur xüsusiyyətləri. Sumqayıt Dövlət Universiteti – “ELMİ XƏBƏRLƏR”– Sosial və humanitar elmlər bölməsi Cild 15 № 2, s.24-30
3. New English File – Oxford University Press. (2023). 271 p.
4. Əmiraslanova, S.F. (2005). Qeyri-verbal kommunikasiyanın ünsiyyətdə yeri haqqında. ADU-nun Elmi xəbərləri, № 5, s.289-292.
5. Yunusov, D.N. (2010). Konstruktiv dialoq və ya düzgün ünsiyyət qurmaq qabiliyyəti. “Mədəniyyətlərarası dialoq: Pedaqoji və ədəbi aspektlər” mövzusunda beynəlxalq elmi konfransın materialları. Bakı: Mütərcim, s.336-338.
6. New Cutting Edge - Pearson Longman. (2013). 3rd Revised Edition, 177 p.
7. https://cyberleninka.ru/article/n/dialogue-communicative-structures-in-the-process-of-teaching-foreign-language-dialogic-communication-skills
8. Swain, M. (2000). The output hypothesis and beyond: Mediating acquisition through collaborative dialogue. In J. Lantolf (Ed.), Sociocultural theory and second language learning New York: Oxford University Press. pp.97-114.
9. Gupta, A., Lee, G.L. (2015). Dialogic teaching approach with English language learners to enhance oral language skills in the content areas, pp.10-17.
10. Breen, M. (1983). Authenticity in the language classroom. Applied Linguistics /6/1, pp.60-65.
11. Janey, F. (2017). Authentic dialogue and how to achieve it. Australia, pp.1-8. https://www.linkedin.com/pulse/authentic-dialogue-how-achieve-janey-francis
12. Rogers, C., Medley, F. (2018). Language with a purpose: Using authentic materials in the foreign language classroom. Foreign Language Annals. Vol 21, pp.467-478. [Электронный ресурс]. URL: http://dx.doi.org/10.1111/j.1944- 9720. 1988. tb01098.
13. https://helenadailyenglish.com/english-conversations-in-real-life-with-common-phrases-meanin-example://


Göndərilib: 01.01.2024 Qəbul edilib: 18.03.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/131-137

**Afərim Həmzəyeva**
Bakı Dövlət Universiteti
magistrant
afa.hamzayeva @gmail.com

# İNSAN HÜQUQLARI HAQQINDA AVROPA KONVENSİYASININ 3-CÜ MADDƏSİNİN ÜMUMİ XARAKTERİSTİKASI

**Xülasə**

Avropa İnsan Hüquqları Konvensiyasının 3-cü maddəsi işgəncənin, qeyri-insani və ya ləyaqəti alçaldan rəftarın və ya cəzanın qadağan edilməsinə zəmanət verir. İnsan hüquq və azadlıqlarını qoruyan Konvensiyanın əsas maddələrindən biridir və 3-cü maddədə deyilir ki, heç kəs işgəncəyə və ya qəddar, qeyri-insani və ya ləyaqəti alçaldan rəftara və ya cəzaya məruz qala bilməz. Bu mühüm qayda insan hüquqlarının bölünməzliyini və universallığını müdafiə edir və onları fiziki və psixoloji zorakılığın bütün formalarından qoruyur.

Bu maddə pozulduğu halda, şəxsin öz hüquqlarını qorumaq və təzminat almaq üçün Avropa İnsan Hüquqları Məhkəməsinə müraciət etmək hüququ var. Avropa İnsan Hüquqları Konvensiyasının 3-cü maddəsi insana qarşı işgəncə, qeyri-insani və ya ləyaqəti alçaldan rəftar və ya cəzanı qadağan edir. Məqalədə işgəncə və pis rəftardan müdafiə kontekstində dövlət və fərd arasında münasibətləri tənzimləyən əsas prinsiplər və normalar təsvir olunur. Bu maddənin pozulması hallarına və Avropa insan hüquqları sistemi çərçivəsində insan hüquqlarının müdafiəsi mexanizmlərinə baxılır. 3-cü maddənin milli hüquq sistemlərində və hüquq-mühafizə praktikasında tətbiqi zamanı yaranan əsas problemlər və çətinliklər araşdırılır. İnsan hüquqlarının müdafiəsi üzrə bu beynəlxalq sənədin səmərəliliyi və inkişafının gələcək perspektivləri ümumiləşdirilmiş formada təsvir edilir.

***Açar sözlər:*** *işgəncə, konvensiya, insan hüquqları, zorakılıq, qeyri-insani və ya ləyaqəti alçaldan rəftarın qadağan edilməsi*

**Afarim Hamzayeva**
Baku State University
master student
afa.hamzayeva @gmail.com

## General characteristics of Article 3 of the European Convention on human rights

**Abstract**

Article 3 of the European Convention on Human Rights guarantees the prohibition of torture, inhuman or degrading treatment or punishment. It is one of the main articles of the Convention that protects fundamental human rights and freedoms and Article 3 states that no one shall be subjected to torture or cruel, inhuman, degrading treatment or punishment. This important rule upholds the indivisibility and universality of human rights and protects them from all forms of physical and psychological violence.

In case of violation of this article, a person has the right to apply to the European Court of Human Rights to protect his rights and receive compensation. Article 3 of the European Convention on Human Rights prohibits torture, inhuman or degrading treatment or punishment of a person. The article describes the basic principles and norms that govern the relationship between the state and the individual in the context of protection against torture and ill-treatment. Cases of violation of this article and mechanisms for the protection of human rights within the European human rights system are considered. The key problems and challenges that arise when applying Article 3 in national legal systems and law enforcement practice are examined. The effectiveness and further prospects

for the development of this international instrument for the protection of human rights are summed up.

***Keywords:*** *prohibition of torture, convention, human rights, violence, inhuman or degrading treatment*

## Giriş

Avropa Konvensiyasının 3-cü maddəsi işgəncəni, qeyri-insani və ya ləyaqəti alçaldan rəftar və ya cəzanı qadağan edir. Konvensiyanın 3-cü maddəsinin məzmununu müəyyən edən bu hərəkətlər arasındakı fərq onların ağırlıq dərəcəsi ilə müəyyən edilir. Avropa İnsan Haqları Komissiyası Yunanıstan məsələsi ilə bağlı qərarında aşağıdakıları qeyd edib:

"Tamamilə aydındır ki, işgəncə bütün təsvirlərin tətbiq olunduğu rəftar ola bilər, çünki işgəncə həmişə qeyri-insani və ləyaqəti alçaldan rəftardır və qeyri-insani rəftar həmişə alçaldıcıdır". Komissiya həmçinin qeyd edib ki, "qeyri-insani rəftar anlayışı, ən azı, konkret vəziyyətdə əsaslandırıla bilməyən, həm ruhi, həm də fiziki qəsdən ağır əzablara səbəb olan rəftarı əhatə edir. "İşgəncə" sözü ümumiyyətlə məlumat əldə etmək, etirafa məcbur etmək və ya cəza vermək məqsədilə qeyri-insani rəftarı təsvir etmək üçün istifadə olunur və ümumiyyətlə qeyri-insani rəftarın daha ağır formasıdır. Bir şəxsə qarşı rəftar və ya cəza onu başqalarının qarşısında əhəmiyyətli dərəcədə alçaldırsa və ya onu öz iradəsinə və vicdanına zidd hərəkət etməyə məcbur edərsə, alçaldıcı hesab edilə bilər" (Golovistikova, Grudtsyna, 2019: 87).

Avropa Konvensiyasının 3-cü maddəsində üç əsas anlayışdan istifadə olunur:

**işgəncə;**

**qeyri-insani rəftar və ya cəza;**

**ləyaqəti alçaldan rəftar və ya cəza**.

Birincisi, qeyd etmək lazımdır ki, yuxarıda göstərilən hadisələrin hər biri müstəqil cinayəti təşkil edir və yalnız birinin olması AİHM-ə şikayət vermək üçün kifayətdir. İkincisi, bu anlayışların düzgün tərifi və şərhi üçün işgəncənin qadağan edilməsi və qarşısının alınması ilə bağlı bütün beynəlxalq normalar toplusundan, lakin Avropa Məhkəməsinin presedent hüququnda öz əksini tapdığı həddə çıxış etmək lazımdır. Bundan əlavə, İnsan Hüquqları Konvensiyasına uyğun olaraq şikayətlərin qəbul edilməsi meyarları da nəzərə alınmalıdır. Onlar AİHM tərəfindən konkret işə onun yurisdiksiyasını və səlahiyyətlərini nəzərə almaqla baxa bilib-bilməyəcəyini anlamağa imkan verir (Gorbachova, 2017: 187).

Bunun üçün Avropa Konvensiyasının 3-cü maddəsində istifadə olunan anlayışların tərifi və şərhinin xüsusiyyətlərini nəzərdən keçirək.

İşgəncə insana qarşı həm qeyri-insani, həm də ləyaqəti alçaldan rəftarı özündə birləşdirən, lakin eyni zamanda insana ən dərin fiziki və ruhi sarsıntılar yaşadan, ağır iztirablara səbəb olan şəxsə qarşı amansız rəftarın xüsusi forması kimi önə çıxır. Yalnız pis rəftarın mahiyyəti deyil, həm də məqsədi - məsələn, insanı ifadə verməyə sövq etmək, onu nəyisə boynuna almağa məcbur etmək və ya işgəncə yolu ilə bir insanı nəyəsə görə cəzalandırmaq üçün qiymət verilir. Cinayətin mühüm xarakteristikası onun qəsdən törədilməsidir: işgəncə həmişə qəsdən və şüurlu şəkildə tətbiq olunur. Və nəhayət, cinayəti işgəncə kimi təsnif etmək üçün qəddarlığın minimum həddi meyarından istifadə olunur. O, qiymətləndirici xarakter daşıyır və hər bir halda öyrənilmə və təhlilə məruz qalır. Bununla belə, işgəncənin qeyri-insani və ləyaqəti alçaldan rəftarın ən yüksək forması kimi şərh edildiyini nəzərə alsaq, hətta Məhkəmə tələb olunan qəddarlıq dərəcəsini görməsə belə, qeyri-insani və ləyaqəti alçaldan rəftar və ya cəza faktı qalmaqdadır ki, bu da artıq Konvensiyanın 3-cü maddəsinin pozulmasıdır. Ümumiyyətlə, qəddarlığın minimum həddi adətən subyektiv olaraq - qurbanın çəkdiyi ağrı və iztirab dərəcəsi ilə qiymətləndirilir.

İşgəncə həmişə istintaq hərəkətlərinə və ya hərbi əməliyyatlar zamanı qəddarlığın təzahürlərinə xas olan cinayət deyil, baxmayaraq ki, bu, çox vaxt bununla əlaqələndirilir. İşgəncə həmişə sadizmin açıq təzahürü deyildir və əməlin işgəncə kimi qiymətləndirilməsi üçün işgəncənin xüsusi üsul və vasitələrindən istifadə tələb olunmur. Məsələn, AİHM məhbusların zorlanmasını, qeyri-

insani şəraitdə saxlanmasını və həddindən artıq qəddar rəftarın digər təzahürlərini işgəncə kimi tanıyıb.

Avropa Məhkəməsi birmənalı şəkildə işgəncə kimi şərh ediləcək hərəkətlərin (hərəkətsizliyin) konkret və məhdud siyahısının olmamasına dəfələrlə diqqət çəkib. Buna görə də, hər bir halda işin vəziyyətinin və hallarının hərtərəfli təhlili tələb olunur.

Əgər əməl işgəncə kimi qiymətləndirilə bilməzsə, Məhkəmə onu qeyri-insani və ya ləyaqəti alçaldan rəftar və ya cəza kimi qiymətləndirir.

Qeyri-insani və ləyaqəti alçaldan rəftar (cəza) arasında ilkin fərq, işgəncə halında olduğu kimi, qəddarlıq dərəcəsi meyarına əsaslanır. AİHM-in təcrübəsinə əsasən, "qeyri-insani rəftar" onun törədildiyi vəziyyət və şəraitlə əsaslandırıla bilməyən ağır ruhi və (və ya) fiziki iztirablara səbəb olan rəftardır.

Eyni zamanda, qeyri-insani rəftar müstəqil cinayət kimi:

qəddarlığın minimum həddini aşmamalı, əks halda işgəncə kimi qiymətləndirilməlidir;

kifayət qədər qəddar olmalıdır, əks halda ləyaqəti alçaldan rəftar kimi qiymətləndirilməlidir (Abashidze, 2017).

Qeyd etmək lazımdır ki, "qeyri-insani rəftar" və "ləyaqəti alçaldan rəftar" anlayışlarının qiymətləndirilməsi və fərqləndirilməsi zamanı Avropa Məhkəməsi çox vaxt özünə geniş və bir qədər qeyri-müəyyən yanaşmaya yol verir. Bu, qismən onunla əlaqədardır ki, cinayətin bu və ya digər təsnifatı Konvensiyanın 3-cü maddəsinin pozulması ilə bağlı şikayətin təmin edilməsinə təsir göstərmir. Bununla belə, bu, kompensasiyanın məbləğinə təsir edir və bəzi hallarda zərərin əhəmiyyətinin qiymətləndirilməsinə və qurban statusunun olub-olmamasına təsir göstərə bilər. Qəbul edilənlik meyarlarına uyğun gəlməməsinin qarşısını almaq üçün hər cür mübahisəli məsələlər şikayətin hazırlanması səviyyəsində dərindən təhlil edilir və aradan qaldırılır.

Müəyyən dərəcədə nəzəri və praktikada "ləyaqəti alçaldan rəftar" anlayışının şərhinin daha hərtərəfli nəzərdən keçirilməsi və müzakirəsi vəziyyəti "xilas edir". Bütün bunlar düzgün kvalifikasiya üçün aşağıdakı yanaşmadan istifadə etməyə kömək edir: Əgər İnsan Hüquqları Konvensiyasının 3-cü maddəsinin pozulması əməlin ağırlığına görə işgəncə kimi tövsif oluna bilmirsə, lakin bu, ləyaqəti alçaldan rəftara nisbətən daha qəddardırsa, o zaman o, qeyri-insani rəftar kimi müəyyən edilə bilər (Burkov, 2017: 68-84).

Ləyaqəti alçaldan rəftar insanın ləyaqətini pozan və kifayət qədər kobud xarakter daşıyan hərəkət kimi başa düşülür. Konsepsiyanın təfsirində konkretliklər AİHM-in presedent hüququnda öz əksini tapmışdır. Xüsusi işlərə baxarkən Məhkəmə aşağıdakıları nəzərə alır:

hadisənin faktiki halları;

alçalmanın dərəcəsi, üsulu və vasitələr, digər şeylərlə yanaşı, təhqir şəklində ifadə edilə bilər;

alçaldılmanın nəticələri, o cümlədən mümkün olanlar, məsələn, alçaldılma təhdidlərlə ifadə olunarsa;

başqalarının gözündə alçaldılmanın qiymətləndirilməsi (qəddarlıq dərəcəsi) və (və ya) qurbanın subyektiv qiymətləndirilməsi, onun baş verənləri dərk etməsi.

Konvensiyanın 3-cü maddəsinin pozulmasına səbəb olan qeyri-insani və ya ləyaqəti alçaldan cəzanı ayrıca nəzərdən keçirilməli olan mövzudur. Bu cür cəza ilə ümumiyyətlə cəzanı bir-birindən ayırmaq lazımdır. Qiymətləndirmə nisbilik meyarlarına əsaslanır subyektiv cəhəti ehtiva edir, cəzanın növündən və xarakterindən, onun həyata keçirilmə üsulu və vasitələrindən, habelə işin digər hallarından asılıdır. Cəzanın təhlili və qiymətləndirilməsi zamanı qeyri-insanilik və insan ləyaqətinin alçaldılması əlamətləri nəzərə alınmalıdır.

Son illərdəki tendensiya Məhkəmənin qeyri-insani və ya ləyaqəti alçaldan rəftarın və ya cəzanın mütləq qəsdən cinayət olması mövqeyindən uzaqlaşması olmuşdur. Bu gün üstünlük təşkil edən fikir ondan ibarətdir ki, cinayət törətmək niyyətinin olmaması Konvensiyanın 3-cü maddəsinin pozulmasını istisna etmir Dekhkanova, 2017: 171).

Niyyətin təhlili (niyyətin mövcudluğu) tez-tez şikayətlərə baxılması zamanı cinayətin hərəkətsizliklə ifadə edildiyi hallarda müşayiət olunur. Birincisi, hərəkətsizlik Avropa Konvensiyasının 3-cü maddəsinin mənasında məsuliyyətə səbəb ola bilər. İkincisi, hakimiyyət

orqanlarının qeyri-insani və ya ləyaqəti alçaldan rəftar və ya cəza elementlərinin hamısını və ya bəzilərini ehtiva edən halların aradan qaldırılması üçün tədbirlər görməməsi özlüyündə Konvensiyanın 3-cü maddəsinin pozulmasıdır. Bununla belə, niyyətin olub-olmaması işin nəticəsinə təsir edir. İnsan Hüquqları Konvensiyasının 3-cü maddəsinin pozulması sübuta yetirilsə də, AİHM-si niyyətin olmamasına görə kompensasiya nisbətən kiçik məbləğlə məhdudlaşdırıla bilər.

İrlandiya Böyük Britaniyaya qarşı işdə Avropa İnsan Hüquqları Məhkəməsi qeyri-insani rəftar və işgəncə arasında fərq qoyarkən qeyd etdi ki, işgəncə "çox dərin və qəddar iztirablara səbəb olan qəsdən qeyri-insani rəftar"ı əhatə edir və sözügedən işdə təhlil edilən hərəkətlər "adi anlayışda işgəncə sözünün nəzərdə tutulduğu kimi güc və qəddarlığın əzabına səbəb olmamasını özündə ehtiva edir (Kobzeva, 2017: 68).

Dörd ay sonra, Tyrer işində Məhkəmə qeyd etdi ki, "cəzanın 3-cü maddənin mənasında qeyri-insani kimi səciyyələndirilməsi üçün verilən əzab müəyyən dərəcədə olmalıdır". Buradan belə nəticəyə gəlmək olar ki, 3-cü maddə ilə qadağan edilən üç növ rəftar və cəza arasındakı fərq əsasən meydana gəlmiş vəziyyətin dərəcəsindən asılıdır.

İstənilən cəzada alçaldıcı elementin olduğunu nəzərə alaraq, Məhkəmə qərara almışdır ki, ləyaqəti alçaldan cəzanın fərqləndirici xüsusiyyəti alçaldılma dərəcəsidir və bu, sonradan hər bir konkret işin şəraitinə, xüsusən də cəzanın mövcudluğuna uyğun olaraq qiymətləndirilməlidir həmçinin "cəzanın özünün mahiyyəti və konteksti, habelə onun həyata keçirilmə üsulu və vasitələri" ilə bağlıdır. Üstəlik, bunun üçün həlledici amil Konvensiyanın yazıldığı dövrdə üstünlük təşkil edən fikirlər deyil, müəyyən bir zaman üçün xarakterik olan fikirlərdir, çünki "Konvensiya canlı sənəddir ki,hazırki şərait kontekstində şərh edilməlidir".

Bundan əlavə, Məhkəmə Avropa Şurasına üzv dövlətlərin həbsxana siyasətinin inkişafını və ümumi qəbul edilmiş standartlarını da nəzərə almalıdır.

Nə Komissiya, nə də Məhkəmə 3-cü maddənin fiziki əzab hallarına, eləcə də ruhi əzab hallarına şamil olunduğuna şübhə etmir. Komissiya sonuncunu "fiziki döyülmədən başqa üsullarla işgəncə və stress mühiti yaratmaqla ruhi əzab vermək" kimi müəyyən edib (Khazov, 2017: 120).

X və Y Hollandiyaya qarşı işdə olduğu kimi, tez-tez əqli və fiziki əzabların kombinasiyası mövcuddur. Fərdlər üçün emosional nəticələrə səbəb olan bütün hərəkətlər qeyri-insani rəftar hesab edilə bilməz, ancaq insana dərin ruhi və ya fiziki iztirablar verən hərəkətlər bu kateqoriyaya aid edilir.

Beləliklə, həlledici olan əməli törədənin niyyəti deyil, hərəkətlərin xarakteri və təsirlənən şəxs üçün nəticələridir.

Strasburqun nəzarət orqanlarının presedent hüququndan ümumiyyətlə belə bir nəticəyə gəlmək olmaz ki, müəyyən rəftara aidiyyəti olan şəxsin razılığının olmaması belə rəftarın 3-cü maddəyə əsasən qadağan olunmuş kimi təsnif edilməsi üçün zəruri şərtdir. Bununla belə, nəzarət orqanı səlahiyyətliləri bu amili diqqətlə araşdıracaqlar (Markelova, 2017).

Belə görünür ki, müvafiq şəxsin razılığı müəyyən şərtlər altında qeyri-insani və ya ləyaqəti alçaldan xarakterli bir hərəkətə səbəb ola bilər ki, əks halda da bu belə olardı. Bununla belə, təsəvvür etmək olar ki, təcrübələr və rəftar o qədər qeyri-insani və ya ləyaqəti alçaldan olacaq ki, müvafiq şəxs əvvəlcədən razılığa baxmayaraq, özünü 3-cü maddənin pozuntusunun qurbanı kimi hiss edəcək və əməl insan ləyaqətinə toxunan qeyri-insani rəftar xarakteri daşıyacaq. Ancaq görünən odur ki, əgər insan öz iradəsini ifadə edə bilirsə, onun iradə ifadəsi həlledici rol oynamalıdır, bu da ondan irəli gəlir ki, prinsipcə, insanın həyatı və bədəni ilə bağlı qərarlar qəbul etmək imkanı olmalıdır, bir şərtlə ki, bu başqalarının həyatına və sağlamlığına ciddi şəkildə təsir göstərmədiyi səviyyədə olsun.

Əhəmiyyətli olan odur ki, indiyədək Konvensiyanın 3-cü maddəsinə əsasən Strasburq Məhkəməsi hakimiyyət orqanlarına azadlıqdan məhrum edilmiş şəxslərin vəziyyətini nəzərdən keçirərkən müraciətlər etmişdir.

Birnəfərlik kameranın qeyri-insani rəftarın bir forması olub-olmaması məsələsində Komissiya belə bir qərardan çıxış edir ki, bu cür həbs prinsipcə arzuolunmazdır, xüsusən də müvafiq şəxs

məhkəməyəqədər həbsdə olarsa və yalnız müstəsna hallarda əsaslandırıla bilər (Dekhkanova, 2017: 71-74). Qeyri-insani və ya ləyaqəti alçaldan rəftar faktını müəyyən etmək üçün aşağıdakı amillər nəzərə alınmalıdır: işin xüsusiyyətləri; şiddətin dərəcəsi; müddəti; qarşıya qoyulan məqsəd; aidiyyəti şəxs üçün nəticələri; aidiyyəti olan şəxsin xarici dünya ilə hər hansı əlaqəsinin olub-olmaması.

Komissiya Kreçer və Möller İsveçrəyə qarşı iş üzrə öz hesabatında, o cümlədən, aşağıdakıları qeyd etmişdir:

"Təhlükəsizlik tələbləri ilə fundamental insan haqları arasındakı tarazlığın sonuncunun zərərinə pozulduğuna dair sual yaranır".

Konvensiyanın 3-cü maddəsinə uyğun olaraq birnəfərlik kamerada saxlama ilə bağlı məhkəmə təcrübəsini ümumiləşdirərək belə qənaətə gəlmək olar ki, belə bir həbs aşağıdakı hallarda əsaslandırılacaqdır (Nazar'yeva, 2017):

- həbsxananın daxilində və xaricində təhlükəsizliyin təmin edilməsi zəruri idi;
- müvafiq şəxslərin qaça bilməsi riski var idi;
- məhbusun davranışı təhlükəli hesab edilmişdir;
- məhbus digər məhbusları iğtişaş yaratmağa təhrik etmişdir;
- məhbusun özünün təhlükəsizliyini təmin etmək lazım idi;
- həbs zamanı sözügedən şəxs odlu silahdan istifadə edib.

Birnəfərlik kameranın aidiyyəti şəxsə təsirinə gəldikdə, Komissiya ərizəçidən cəzaçəkmə müəssisəsində saxlanma şəraitinin onun fiziki və psixi sağlamlığına mənfi təsir göstərdiyi barədə tibbi sübut təqdim etməyi tələb etdi. Bu sübut saxlanma şəraiti ilə ərizəçinin səhhətinin pisləşməsi arasında birbaşa əlaqənin olduğunu nümayiş etdirməlidir. Bundan əlavə, sübut edilməlidir ki, saxlanma şəraiti "şəxsiyyəti məhv edə, insana dərin ruhi və fiziki iztirablar verə bilsin".

Təcrid olunmanın dərəcəsinə gəlincə, Komissiya tam senzura və sosial təcridin heç bir təhlükəsizlik tələbləri ilə əsaslandırıla bilməyən qeyri-insani rəftar olması faktından çıxış edib.

Bundan başqa, Komissiya bir tərəfdən tam senzura və sosial təcrid, digər tərəfdən təhlükəsizlik, nizam-intizam və müdafiə məqsədilə başqa məhbuslarla ünsiyyətə qadağa qoyulmasını, digər tərəfdən isə qeyri-insani və ya ləyaqəti alçaldan rəftar və ya cəzaya bərabər olmayan digər məhbuslarla ünsiyyətə qadağa qoyulması arasında fərq qoyub. Sonuncu halda həbsxana işçiləri, həkimlər, vəkillər, qohumlar və s. ilə görüşmək, həmçinin qəzet, radio və televiziya vasitəsilə xarici aləmlə əlaqə saxlamaq mümkün olmalıdır (Peshkoska, 2017: 26).

Hər bir konkret halda Komissiya həbsin özünün məhbusun psixi sağlamlığına birbaşa təsir edib-etmədiyini müəyyən etməli idi. Bundan əlavə, tibbi müayinələrin və müalicələrin tezliyi, habelə məhkumun özünün tibbi yardım üçün müraciət edib-etməməsi nəzərə alınıb. Komissiya məhbusun davranışını da nəzərə alıb.

Mülki və Siyasi Hüquqlar haqqında Beynəlxalq Paktın 10-cu maddəsində təqsirləndirilən şəxslərin məhkum edilmiş şəxslərdən ayrı saxlanılması tələbi Konvensiyada öz əksini tapmamışdır. O, həmçinin Avropa Konvensiyasının 3-cü maddəsinin mətnindən irəli gəlmir (Frankovskaya, 2017: 42-44).

Avropa İnsan Haqları Komissiyası məhbusun əlləri qandallı və qoruyucu geyimdə şəhərdən keçməsini arzuolunmaz hesab edib, lakin eyni zamanda bunu ləyaqəti alçaldan rəftar hesab etməyib.

Qeyd etmək çox vacibdir ki, 3-cü maddə vasitəsilə Konvensiyada təsbit olunmayan bir sıra hüquq və azadlıqlar Konvensiyanın müdafiəsi çərçivəsinə daxil edilə bilər. Ən azından belə nəticəyə gəlmək olar ki, onlar Konvensiyanın mətnində nəzərdə tutulur. Bunun ən parlaq nümunəsi sözügedən dövlətin vətəndaşı olmayan şəxslərin ölkəyə qəbulu və ya ölkədən çıxarılması təcrübəsidir. Konvensiyada ölkəyə qəbul və ya sığınacaq verilməsi ilə bağlı ümumi qayda yoxdur, halbuki 4 saylı Protokolun 4-cü maddəsi yalnız əcnəbilərin kütləvi surətdə çıxarılmasını qadağan edir, 7 saylı Protokolun 1-ci maddəsi isə yalnız bəzi prosessual təminatları ehtiva edir.

Bununla belə, ölkəyə daxil olmaqdan imtina və ya ölkədən çıxarılma 3-cü maddənin mənasında qeyri-insani rəftara bərabər ola bilər, məsələn, müvafiq şəxsin fiziki vəziyyətinə görə və ya bu, həmin şəxsin başqa şəxsdən təcrid edilməsinə və ya ailə həyatı Konvensiyanın 8-ci maddəsinin

əhatə dairəsindən kənarda olsa belə, şəxsin yaxın əlaqəsi olan bir qrup şəxsdən təcrid olunmasına səbəb olmuşdursa işin hallarından asılı olaraq Məhkəmə tərəfindən qeyri-insani rəftar kimi qiymətləndirilə bilər (Tolstik, 2017: 167).

3-cü maddənin pozulması həmçinin obyektiv amillərə görə aidiyyəti şəxsin ekstradisiya olunduğu ölkədə məruz qala biləcəyi və ya ölkədən çıxarıldıqdan və ya ölkəyə gəlməkdən imtina edildikdən sonra geri qaytarılacağı rəftardan da ibarət ola bilər. Bu halda, çıxaran və ya ekstradisiya edən dövlət, ölkədən çıxaran və ya ekstradisiya edən dövlətin bu cür rəftarın dövlətlə əlaqəli olmayan vəzifəli şəxslərdən və ya digər şəxslərdən gözlənilməsindən asılı olmayaraq, digər dövlətdə baş verə biləcək qaçılmaz rəftara görə dolayısı ilə məsuliyyət daşıya bilər və qəbul edən dövlətin Konvensiyanın iştirakçısı olub-olmamasından asılı olmayaraq bu cür rəftarın qarşısını alınmasını nəzərdə tutulur. Beləliklə, rəftar Konvensiyada təsbit olunmuş hüquqların hər hansı birinin, o cümlədən 3-cü maddənin pozulmasını nəzərdə tutmalıdır. Belə rəftarın real təhlükəsinin mövcudluğu hər bir konkret halda Avropa İnsan Hüquqları Məhkəməsi tərəfindən müəyyən edilməlidir.

Avropa Komissiyası Kirkvud və Soering işlərinə dair qərarlarında ona əsaslanıb ki, Konvensiyanın 2-ci maddəsi ölüm hökmünün mümkünlüyünə açıq şəkildə icazə verdiyi üçün, şəxsin ölüm cəzasına icazə verilən ölkəyə çıxarılmasına icazə verilmir və belə hal Konvensiyanın 2-ci və ya 3-cü maddəsinin pozulmasına səbəb olur. Eyni zamanda, bu, ölüm hökmünün icrasının metodu və şərtləri ilə bağlı 3-cü maddənin mümkün pozulması ilə bağlı sualların yaranmasını da istisna etmir. Nümunə kimi şəxslərin ABŞ-a deportasiya edilməsini göstərmək olar, məlum olduğu kimi, ölüm cəzasına məhkum edilmiş məhbuslar cəzalarının icrasını uzun müddət gözləyə bilərlər. Xüsusilə, Soering işi üzrə qərarında Məhkəmə yekdilliklə müəyyən edib ki, ərizəçinin Birləşmiş Ştatlara deportasiyası haqqında qərar Konvensiyanın 3-cü maddəsinin pozulmasına səbəb olacaq. BMT-nin İşgəncələrə və digər qəddar, qeyri-insani və ya ləyaqəti alçaldan rəftar və ya cəzalara qarşı Konvensiyasının 3-cü maddəsini də nəzərə alan Avropa Məhkəməsinə görə, şəxsin işgəncəyə və ya pis rəftara məruz qala biləcəyi dövlətə deportasiya edilməməsi öhdəliyi dövlətin üzərinə düşür.Belə rəftar Avropa Konvensiyasında açıq şəkildə göstərilməsə də, Konvensiyanın 3-cü maddəsindən irəli gəlir.

3-cü maddə vasitəsilə Konvensiyaya əsasən müstəqil məna qazana bilən hüquq və ya azadlığın başqa bir nümunəsi ayrı-seçkiliyin qadağan edilməsidir. Belə qadağa Konvensiyaya müstəqil hüquq kimi daxil edilmir, yalnız digər hüquq və azadlıqların həyata keçirilməsi ilə bağlıdır. Bununla belə, irqi ayrı-seçkilik Avropa Komissiyası tərəfindən 3-cü maddənin mənasında ləyaqəti alçaldan rəftar kimi təsnif edilib və bu ayrı-seçkiliyin bu formasından azadlığı öz müstəqil hüququna çevirib.

1983-cü ildəki hesabatlarından birində Komissiya həmçinin etiraf etdi ki, "seksual və digər ayrı-seçkilik formaları" 3-cü maddənin pozulmasını təşkil edəcək dərəcədə alçaldıcı təsir göstərə bilər.

3-cü maddədə nəzərdə tutulan hüquq 15-ci maddənin 2-ci hissəsinə uyğun olaraq heç bir halda kənara çıxmalara yol verilməyən hüquqlar siyahısına daxildir.

## Nəticə

Beləliklə, bu hüquq təkcə 3-cü maddənin əsas müddəasının Konvensiyanın digər maddələrindən fərqli olaraq ona hər hansı qanunvericilik məhdudiyyətinin qoyulmasına yol verməməsi mənasında deyil, həm də o mənada mütləqdir ki, dövlətin ərazisində qanuni qüvvəyə minməsi halında fövqəladə vəziyyətlərdə belə deroqasiyalara yol verilmir.

## Ədəbiyyat

1. Golovistikova, A.N., Grudtsyna, L.YU. (2019). Prava cheloveka: evolyutsiya razvitiya. Istoricheskiye predposylki zarozhdeniya kontseptsii prav cheloveka. Advokat. №6, s.87-88.
2. Gorbachova, V.M. (2017). Problema zashchity prav i svobod cheloveka. Innovatsionnaya nauka. T. 4. № 4, s.185-187.
3. Abashidze, A.KH. (2017). Regional'nyye sistemy zashchity prav cheloveka: uchebnik dlya bakalavriata i magistratury, dlya studentov vuzov, obuchayushchikhsya po yuridicheskim

napravleniyam. 2-ye izd., pererab. i dop. Moskva: Yurayt, 378 s. (Bakalavr. Magistr). ISBN 978-5-9916-9435-3. Imeyutsya ekzemplyary v otdelakh: BYUF(10).

4. Burkov, A.L. (2017). Protsedura podachi zhaloby v Yevropeyskiy sud po pravam cheloveka: programma kursa. L.M.Churkina. Moskva: RUDN, 84 s. (Sovmestnaya magisterskaya programma po pravam cheloveka). Bibliogr, s.68-84. ISBN 978-5-209-08143-2.
5. Dekhkanova, K.A. (2017). O pravovoy prirode sistemy okhrany i zashchity prav i svobod cheloveka i grazhdanina. Theoretical & Applied Science. № 11 (55), s.171-174.
6. Kobzeva, Ye.I. (2017). K voprosu ob obespechenii prav i svobod cheloveka i grazhdanina. Natsional'naya Assotsiatsiya Uchenykh. № 6 (33), s.68-70.
7. Khazov, Ye.N. (2017). Yuridicheskiye garantii prav i svobod cheloveka i grazhdanina. Vestnik Moskovskogo universiteta MVD Rossii. № 5, s.120-123.
8. Markelova, YU.V. (2017). Institut prav i svobod cheloveka i grazhdanina. Science Time. № 1 (37), s. 271-276.
9. Nazaryeva, A.YU. (2017). Sudebnaya zashchita prav i svobod cheloveka kak mekhanizm pravoprimeneniya. Tsentral'nyy nauchnyy vestnik. T. 2. № 23s (40s), s.39-40.
10. Peshkoska, E. (2017). Svoboda i prava cheloveka. Aktual'nyye problemy gosudarstva i prava. T. 1. № 3-4, s.26-31.
11. Frankovskaya, K.D. (2017). Problemy zashchity prav cheloveka i svobod. Aktual'nyye problemy administrativnogo prava i protsessa. № 3, s.42-44.
12. Tolstik, V.A. (2017). Yuridicheskaya forma, tseli i mera ogranicheniya prav i svobod cheloveka. Vestnik Vladimirskogo yuridicheskogo instituta. № 4 (45), s.167-171.

Göndərilib: 23.02.2024 Qəbul edilib: 24.03.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/138-142

**Aytaj Gurbanova**
Baku State University
master student
aytajgurban@gmail.com

# IMITATION IN ENTREPRENEURIAL ACTIVITY PRACTICE IN THE CONTEXT OF UNFAIR COMPETITION: CONCEPT AND ELEMENTS

## Abstract

Engaging in economic activity by illegally benefiting from the fame and reputation that a person or organization has gained in society, usually by spending many years, hard work and serious capital, is seen as the easiest way to engage in economic activity without spending effort and is considered unfair competition.

In general, it is possible to systematize the elements of unfair competition as follows: 1) economic competition 2) compete in illegal ways 3) damage or likelihood of damage. But, imitation, which is a form of unfair competition in the literal sense, and imitation are different concepts. For this reason, the realization of one of the above 3 cases alone is not enough for imitation, which is a form of unfair competition. From the point of view of unfair competition law, the question is not whether or not it is imitation, but how it is. Because all kinds of imitation are not against unfair competition. If the imitation in question leads to a risk of confusion, it is possible to speak of unfair competition. The unfair competition law is not about the possibility of confusing the two signs, but rather the fact that a behavior leads to confusion among the consumers about the origin of the product.

***Keywords:*** *unfair competition, economic activity, imitation, risk of confusing, consumer*

**Aytac Qurbanova**
Bakı Dövlət Universiteti
magistrant
aytajgurban@gmail.com

## Sahibkarlıq fəaliyyəti təcrübəsində təqlid haqsız rəqabət kontekstində: anlayış və ünsürləri

## Xülasə

Bir şəxsin və ya təşkilatın cəmiyyətdə uzun illər zəhmət və ciddi sərmayə sərf edərək qazandığı şöhrət və nüfuzdan, adətən, qeyri-qanuni şəkildə yararlanaraq iqtisadi fəaliyyətlə məşğul olmaq zəhmət sərf etmədən iqtisadi fəaliyyətlə məşğul olmağın ən asan yolu kimi qiymətləndirilir və haqsız rəqabət hesab olunur.

Ümumiyyətlə, haqsız rəqabətin elementlərini aşağıdakı kimi sistemləşdirmək olar: 1) iqtisadi rəqabət 2) qeyri-qanuni yollarla rəqabət 3) zərər və ya zərər ehtimalı. Lakin haqsız rəqabətin bir növü olan təqlid ilə hərfi mənada təqlid fərqli anlayışlardır. Bu səbəbdən də haqsız rəqabət forması olan təqlid üçün yuxarıda qeyd olunan 3 haldan birinin təkcə reallaşması kifayət etmir. Haqsız rəqabət hüququ baxımından məsələ onun təqlid olub-olmaması deyil, necə olmasıdır. Çünki hər cür təqlid haqsız rəqabətə gətirib çıxarmır. Sözügedən təqlid çaşqınlıq riskinə səbəb olarsa, haqsız rəqabətdən danışmaq olar. Haqsız rəqabət iki əlaməti qarışdırmaq ehtimalı ilə bağlı deyil, əksinə, bir davranışın istehlakçılar arasında məhsulun mənşəyi ilə bağlı çaşqınlığa səbəb olmasıdır.

***Açar sözlər:*** *haqsız rəqabət, iqtisadi fəaliyyət, təqlid, çaşqınlıq riski, istehlakçı*

## Introduction

With the continuous and rapid development of civilizations, people's needs have increased accordingly and competition has become severe. It is essential that the competition be conducted in accordance with the game and professional rules and in a gentlemanly manner. Honest, ethical competition in economic, scientific and political life revitalizes society and ensures progress.

In addition to this legitimate competition, professional and moral sanctions are not sufficient in most cases against competition that is contrary to game and professional rules, moral and legal rules. In this case, the law and the legal mechanism must take action (Karayalçın, 1968: 441).

Economic competition can only exist in a system where freedom of economic activity exists. Freedom of economic activity requires the existence of rights such as personal freedom, professional freedom and freedom of contract. Although the scope and areas of these rights may vary over time and place, it is essential that they do not fall below a certain limit in a society that has reached a certain level (Örs, 1958: 3).

The regulation on unfair competition is not intended to prevent freedom of economic activity. It is to prevent the abuse of the right to economic activity through deceptive acts and other means that violate the rules of good faith.

The purpose of preventing unfair competition is to prevent the abuse of the right to economic competition. Unfair competition rules aim to protect competitors and competing businesses from unfair, deceptive and dishonest behavior. The underlying idea of unfair competition law is that no one should attempt an unauthorized advantage over another in order to gain his own interests. In other words, as in other competition provisions, the purpose of unfair competition is to ensure the protection of the small against the big, the weak against the strong, and to ensure polyphony in the economy, as required by the society's sense of justice (Aslan, 2001: 17).

It is regulated separately by Article 15 of the Constitution of the Republic of Azerbaijan under the title of Economic Development and State, where unfair competition is prohibited under the law of Azerbaijan. Therefore, considering Article 15:

I. Economic development in the Republic of Azerbaijan, based on various types of property, serves to increase the welfare of the people.

II. The state of Azerbaijan creates conditions for the development of socially oriented economics on the basis of market relations, guarantees free ownership, does not allow expropriation and unfair competition in economic relations (4).

With the aim of implementing constitutional laws and duties, ensuring free and solid competition in the Republic of Azerbaijan, and providing a fair basis for economic activity, including ownership activity, Competition Code was adopted in order to create a legal basis for the negotiations between the parties. Competition Code explains the concept of unfair competition as follows. Unfair competition - competitors by taking advantage of unfair methods that are contrary to the legality and officious principles of the discretionary subsidiarity in order to gain advantage in the appropriate market. These are the actions that harm the people's subordination or harm their busybodies' influence.

Article 19 of the Competition Code determines the forms of unfair competition as follows.

19.1.1. aggressive behavior towards customers;

19.1.2. the release of the rival təsarrüfat subject from influence;

19.1.3. imitation of the opponent's entrepreneurialship activity;

19.1.4. misleading and deceiving customers;

19.1.5. unlawful acquisition, use or dissemination of a commercial secret;

19.1.6. Other actions giving rise to unfair competition taken into account in Article 25 of this Code.

Therefore, unfair competition is prohibited in the jerseys specified in Article 19.1 of the Competition Code (5).

Based on Article 22.1 of the Competition Code, the following actions that imitate the ownership activity of the opponent are taken into account:

22.1.1. Imitation of the competitor's product and its uniform, with the exception of the external appearance of the product due to its technical characteristics, without agreeing to the external arrangement or fitting of that product;

22.1.2. the unintended duplication of the competitor's product by violating its property rights;

22.1.3. unlawful use of the competitor's name or company name (with the exception of cases of use of the company name with any distinctive insignia from the own name of the owner of the same name), including its employee insignia;

22.1.4. making use of the name of the competitor's Internet domain, the name of the competitor's Internet domain, or the design of the Internet page, which is so disparaging as to confuse the users, without agreeing to it;

22.1.5. Illegal use of a competitor's geographical indicator that is used lawfully (5).

According to the generally accepted opinion of the law, unfair competition is considered as unfair competition by taking advantage of the right to compete against the requirement of conscientiousness. Is to be son. According to another opinion, deceptive action or abuse of the competition law by other methods contrary to the principle of conscientiousness and therefore any person's access to the commercial establishment or other It is the fact that it harms the economic value or creates the risk of loss. According to another similar idea, unfair competition is a method contrary to conscientiousness, which is used with the aim of crushing rivals and eliminating them from the field of economic activity.

In general, it is possible to systematize the elements of unfair competition as follows:

- economic competition;
- to compete by legal means;
- harm or possibility of harm.

In order to be able to speak of unfair competition, the existence of an appropriate link between the risk of harm and the abuse of competition law is required (Tamer, 2011: 46). In the literal sense of Article 22 of the Competition Code, it can be concluded that for the imitation to take place, it is sufficient for one of the above-mentioned situations and actions to occur. However, we consider that imitation in the literal sense and imitation as a form of unfair competition are two different concepts. Therefore, for imitation, which is a form of unfair competition, to occur, it is not sufficient for one of the above three situations to occur. From the perspective of unfair competition legislation, the issue at hand is not whether it is an imitation, but rather how it is executed (Kohler, Helmut, 2012: 30). Moreover, it is also essential that any action be carried out with the aim of stimulating other market segments. If the recorded action was not carried out with a commercial purpose, that is, to stimulate other market subsections, it is not possible to consider it as unfair competition. For example, if you make a stand similar to the one produced by any person for the purpose of using it at home, even if that person imitates this movement, you can consider it as unfair competition. Addition is not possible.

For this reason, we must say that, in order for imitation, which is a form of unfair competition, to occur, it is necessary for the situations specified in the law to occur, and it is also necessary for these situations to occur with the aim of deceiving other market subsections (Pedrazzini, 2002: 84).

Under normal circumstances, it is accepted that a person who produces and sells any product that belongs to someone else without permission does this action with the purpose of confusing other market segments. However, everyone should be given the opportunity to prove that this move was not intended to provoke other market segments.

For this reason, it has been stated that in order for imitation, which is a form of unfair competition in many countries' legislation, to be realized, it must be fulfilled with the aim of stimulating other market subsections.

According to the first paragraph of Article 2 of WIPO's Model Provisions on the Prevention of Unfair Competition dated 1996, titled "Creating Confusion with the Business and Activities of Another Person"; Any act or conduct directed at an industrial or commercial activity that creates or may create interference with the business or activities of another, especially the products and

services of that business, constitutes unfair competition. In the 2nd paragraph, examples of confusion are listed. According to this; Confusion occurs especially in trademarks, whether registered or not, in trade names, in a commercial distinguisher other than the trademark or trade name, in the appearance of the product, in the presentation of the product or service, in a celebrity or a well-known fictitious character (WIPO, 1996: 17).

Based on legal experience, we can say that elements of unfair competition through imitation contains the following: 1) trying to create a confusion with another's commodity, work products, activity or business 2) violation of the use made by another person based on a valid reason 3) necessity of expert review 4) it is not necessary to have a competitive relationship, for example, it shows that being in a competitive relationship is not a requirement for confusion to be considered to exist, and even if two companies are in different cities and cannot compete with each other, confusion may exist due to the business names they use (Çevik, 1993: 219) 5) occurrence or likelihood of damage 6) possibility of confusion and possibility of connection 7) customer base. In unfair competition due to confusion, the most important element is the understanding of the customer who is the target of confusion and is intended to be deceived, rather than the personal views of the rival trader who claims confusion (Kaniti, 1961: 236). 8) product feature. While the end buyers and customer environment to which the products are addressed are taken into account in detecting confusion, the quality, technical specifications and even the price of the product subject to confusion also play an important role in determining the possibility of product confusion. 9) the same or similar identification sign must be used. Confusion may occur by using the same or similar identification mark (Poroy, 2001: 250). It is obvious that the same sign is used. The difficulty arises when a similar identification sign is used. Since verbatim use, that is, quotation, occurs as a result of the verbatim use of identification marks, it is almost certain that recipient groups will be confused and deceived. In case of confusion, the buyer groups must have an objective similarity so that they can mix the goods.

## Conclusion

In parallel with social and economic developments, there have been important developments in unfair competition law, the idea of only protecting competition between rival traders has been abandoned, and efforts have been made to ensure competition in accordance with the rules of honesty in the struggle for economic interests.

According to this purpose, the basic condition of acting in accordance with the rule of honesty is that everyone earns profit based on their own labor. For this reason, it is prevented from gaining unfair profit that is not based on labor, based on a value that is aimed at gaining profit created by someone else's physical or mental labor and economic expenses. For this purpose, a more effective combat system has been adopted by granting the right to fight against such unfair competition situations not only to the injured competitors, but also to buyers and even professional organizations when necessary.

In the face of developments in the field of intellectual and industrial rights, international and national regulations, and against the danger of confusion between the general unfair competition provisions, more effective and strong regulations have been introduced to the rights holders with special decree laws, including Competition Code.

The rules of unfair competition, which aim to use the right of economic competition within the framework of the rules of honesty, will also be applied in terms of the use of unregistered experimental rights, if there are conditions. Imitation of a certain original but unregistered right by others may cause consumers to be mistaken about the origin of the product and thus be protected by the provisions of unfair competition.

## References

1. Karayalçın, Y. (1968). Kommersiya hüququ. I Giriş - Biznes Müəssisəsi. 3-cü nəşr. Ankara.
2. Örs Halil, F. (1958). Haqsız rəqabət. Ankara.
3. Aslan, Y. (2001). Rəqabət Qanunu, Genişləndirilmiş 2-ci Nəşr. Bursa.
4. Azərbaycan Respublikasının Konstitusiyası.
5. Azərbaycan Respublikasının Rəqabət Məcəlləsi.
6. Tamer, A. (2011). Yanlış və Aldadıcı Bəyanatlar və Hərəkətlərlə Haqsız Rəqabət. Ankara: Ədalət nəşriyyatı.
7. Kohler, H. (2012). Gesetz gegen den unlauteren Wettbewerb UWG, 30. Aufl., München.
8. Pedrazzini Mario, M. (2002). Unlauterer Wettbewerb, UWG. Bern, 84 p.
9. Model Provisions on Protection Against Unfair Competition. (1996). Geneva. Switzerland. World Intellectual Property Organization (WIPO), 17 p.
10. Çevik Orhan, N. (1993). Türk Ticarət Məcəlləsinin Tətbiqinə dair Qanunvericilik, 2-ci Nəşr. Ankara, 219 s.
11. Kaniti, S. (1961). Əmtəə nişanları arasında qarışıqlığa dair İsveçrə Federal Məhkəməsinin Qərarları, Batider, cild. 1, 236 səh.
12. Poroy, R. (2001). Kommersiya Müəssisələri Qanunu, 9-cu Nəşr. İstanbul, 250 s.

Received: 07.01.2024 Accepted: 15.03.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/143-148

**Kamilə Quliyeva**
Bakı Dövlət Universiteti
magistrant
kamilequliyeva7@gmail.com

# HÜQUQİ ŞƏXSİN MÜFLİS OLMASININ VƏ ÖDƏMƏ QABİLİYYƏTSİZLİYİNİN ANLAYIŞI VƏ MƏZMUNU

**Xülasə**

Hazırki məqalədə hüquqi şəxslərin müflis olmasının anlayışı və onun Azərbaycan Respublikası qanunvericiliyində yeri ətraflı şəkildə şərh olunmuşdur. Müflis olma və iflasın anlayışları bir-birindən fərqləndirilmiş, müflis olma məfhumunun izahı qismində çıxış edən "ödəmə qabiliyyətsizliyi" anlayışının təfsiri və əhatə dairəsinə aid olan hallar aydınlaşdırılmış, bu hallara dair qanunvericiliyə müvafiq təkliflər verilmişdir.

***Açar sözlər:*** *hüquqi şəxs, iflas, müflis olma, ödəmə qabiliyyətsizliyi, balans müflisləşməsi, maliyyə vəsaiti müflisləşməsi, borclu müəssisə, fərdi borclu, kreditor*

**Kamila Guliyeva**
Baku State University
master student
kamilequliyeva7@gmail.com

## Definition and content of bankruptcy and insolvency of a legal entity

**Abstract**

In this article, the concept of insolvency of legal entities and its place in the legislation of the Republic of Azerbaijan are explained in detail. The concepts of insolvency and bankruptcy are distinguished from each other, the cases related to the interpretation and scope of the concept of "insolvency", which acts as an explanation of the concept of bankruptcy, are clarified, and relevant proposals for the legislation on these cases are given.

***Keywords:*** *legal entity, bankruptcy, insolvency, inability to pay, balance sheet insolvency, cash flow insolvency, debtor enterprise, individual debtor, creditor*

## Giriş

Bazar iqtisadiyyatının inkişaf etdiyi şəraitdə hüquqi şəxslərin müflis olması həm iqtisadi həm də hüquqi əhəmiyyət kəsb etməklə dünyada və ölkəmizdə aktual məsələ olmuşdur. İqtisadi tənzimetmə ilə yanaşı hüquqi şəxsin müflis olması həmçinin özünün hüquqi tənzimlənmə mexanizminə malik bir strukturdur. Belə ki, hüquqi şəxsin müflis olmasına dair münasibətlər ayrıca hüquq institutu və ya hüquq sahəsi kimi formalaşmamasına baxmayaraq, bu cür münasibətlər müvafiq normativ hüquqi aktlar ilə qismən tənzimlənmişdir.

İqtisadi nöqteyi-nəzərdən hüquqi şəxslərin, daha doğrusu, iqtisadi termin olaraq desək, müəssisələrin müflis olması bazar iqtisadiyyatı ilə və bazar iqtisadiyyatı şəraitində müəssisələrin rəqabətilə əlaqələndirilərək onların müəyyən qisminin uğur qazanması, digər bir qisminin iqtisadi uğursuzluğa düçar olmaqla iflasa uğraması və rəqib müəssisələr sırasından çıxması kimi xarakterizə edilsə də, hüquqi nöqteyi-nəzərdən müflis olma mülki hüquqların qorunmasının təminatı kimi kreditorların tələblərinin ödənilməsi üsulu qismində çıxış edir. Başqa sözlə desək, hüquqi şəxsin müflis olması onun öz kreditorlarının tələblərini ödəmə imkanının olmaması səbəbilə müflis elan edilərək ləğv edilməsi üsuludur. Beləliklə, aydın olur ki, qanunvericilik kreditorların tələblərini ödəmə imkanında olmayan hüquqi şəxsin müflis elan edilərək ləğv edilməli olduğu tələbini nəzərdə tutmaqla kreditorların mənafeyini təminat altına almışdır. İflas hüququnun əsas xüsusiyyəti və

məqsədi, borclu şəxs və onun kreditorlarının hüquq və mənafelərini müəyyən bir balans üzərində qorumaq və nəticədə kreditorların hüquqlarını təminat altına almaqdır (1).

Hüquqi şəxslərin müflis olmasına dair münasibətlərin hüquqi tənzimlənmədən kənarda qalması, yeganə tənzimetmə olan iqtisadi tənzimetmənin mənfi təsirlərinin yaranmasına və nəticədə mülki dövriyyə iştirakçılarının hüquqlarının pozulmasına səbəb ola bilərdi. Bu səbəbdən hüquqi şəxsin müflis olması və iflası proseduru hüquqi tənzimlənmə zərurəti olan münasibətlər kimi çıxış etmişdir.

Hüquqi şəxsin müflis olması mövzusunun mahiyyətini aydınlaşdırmaq üçün, əvvəla, “müflisləşmə” və “iflas” terminlərinin izahını vermək gərəkdir:

Müflis ifadəsi ərəbcə-“iflas olmaq, kasıblamaq” sözündən olmaqla, “müflisləşmək” var-dövlətini itirmək, var-dövləti əlindən çıxmaq anlamını verir (2). “İflas” ifadəsi isə ərəb sözündən olmaqla bankın, tacirin və s.-in borc iltizamlarını vaxtında ödəyə bilməməsi nəticəsində müflis olması, sınıq çıxması deməkdir.

Müflis olma termininə iqtisadi və hüquqi olmaqla 2 aspektdən anlayış verə bilərik:

İqtisadi mənada müflis olma dedikdə, sahibkarlıq subyektlərinin maliyyə tarazlığının pozulması, müəssisənin aktivləri hesabına onun borclarının ödənilə bilməməsi və bu səbəbdən müəssisənin sahibkarlıq sahəsində uğura nail ola bilməməsi, nəticədə onun sahibkarlıq subyektləri sırasından çıxması anlaşılır. Bununla əlaqədar olaraq xarici mənbələrdə müəssisənin müflis olmasının 2 növü qeyd edilir:

1) maliyyə vəsaiti müflisləşməsi (cash flow insolvency);

2) balans müflisləşməsi (balance sheet insolvency yaxud accounting insolvency) (3).

Maliyyə müflisləşməsi müəssisənin elə iqtisadi vəziyyətidir ki, öz kreditorlarının tələblərini ödəmək üçün müəssisənin maliyyə vəsaitləri yoxdur və faktiki olaraq bu cür tələbləri ödəmək imkanında deyildir, lakin onun balansında müəyyən aktivləri (məs; daşınmaz əmlak, nizamnamə kapitalı və s.) vardır. Azərbaycan Respublikasının cari qanunvericiliyində hüquqi şəxsin müflis olmasının yalnız qeyd edilən birinci növü, yəni maliyyə vəsaiti müflisləşməsi nəzərdə tutulmuş, iflas prosedurundan sonra kreditorların tələblərinin ödənilməsi qaydası kimi məhz onun aktivlərinin satılması və ya təminatlı kreditorlara əmlak aktivinin bilavasitə verilməsi nəzərdə tutulmuşdur.

Balans müflisləşməsi isə elə iqtisadi vəziyyətdir ki, bu zaman müəssisənin xalis aktivi mövcud olmuş olmur, belə ki, müəssisənin mövcud öhdəlikləri, iqtisadi terminlə desək, borcları onun aktivlərinin miqdarından çox olur. Nəticədə isə, müəssisənin ödəmə qabiliyyəti olmamaqla onun öz öhdəliklərini icra etməsi real olaraq qeyri-mümkün olmuş olur. Göründüyü kimi, maliyyə vəsaiti müflisləşməsi hüquqi şəxsin öz maliyyə öhdəliklərinin icrası üçün büdcəsində maliyyə vəsaitinin olmaması vəziyyətidirsə, hüquqi şəxsin balans müflisləşməsi isə onun öhdəliklərinin, yəni əmlak passivlərinin, onun əmlak aktivlərindən çox olması ilə səciyyələnən iqtisadi vəziyyətdir.

Göstərilənləri ümumiləşdirərək qeyd edə bilərik ki, iqtisadi mənada müflisləşmə dedikdə, hüquqi şəxsin öz öhdəliklərini yerinə yetirə bilməməsi səbəbindən iflasa uğraması, bununla da iqtisadi uğursuzluğa düçar olaraq sahibkarlıq subyektləri sırasından çıxması anlaşılır.

Hüquqi mənada müflisləşmə və iflas isə onun iqtisadi mənasından fərqlənir. Belə ki, qüvvədə olan Müflisləşmə və iflas haqqında Qanunda müflisləşməyə borclunun öz öhdəliklərini ödəmə qabiliyyətinin olmaması kimi anlayış verilmişdir (4).

AR Mülki Məcəlləsində isə hüquqi şəxsin müflis olması onun ləğvi üsullarından biri kimi göstərilmişdir. Belə ki, həmin Məcəlləyə əsasən hüquqi şəxs əgər kreditorların tələblərini ödəməyə qadir deyildirsə, onun məhkəmənin qərarı ilə müflis sayıla bilməsi nəzərdə tutulmuşdur (5).

Müflis olma və iflasın anlayışına dair müxtəlif hüquq ədəbiyyatlarında müəlliflərin mövqeləri öz əksini tapmışdır. S.N.Viktoroviçin fikrinə əsasən müflisləşmə borclunun öz kreditorlarının maliyyə və digər tələblərini ödəmə qabiliyyətinin olmamasıdır (Svistushkin Nikilgp Viktorovich, 2019: 1).

T.D.Vladimiroviçin mövqeyinə əsasən müflisləşmə (iflas) dedikdə, borclunun pul öhdəlikləri və digər məcburi ödənişlərini ödəmə öhdəliyini tam təmin edə bilməməsinin məhkəmə tərəfindən tanınması başa düşülür (7).

S.E.Sergeyevna qeyd edir ki, müflisləşmənin (iflasın) hüquqi tərifi özündə aşağıdakı elementləri özündə ehtiva edir: a) kreditorların tələblərini ödəmə imkanında olmama; b) pul öhdəlikləri və (və

ya) digər icbari ödənişlər üzrə kreditorların, habelə işçilərin əməkhaqqının və keçmiş işçilərin işdən çıxma müavinətinin və (və ya) əmək haqqının ödənilməsinə dair tələblərinin irəli sürülməsi; c) belə faktın məhkəmədə təsdiqi (8). Göründüyü kimi, S.E.Sergeevnanın fikrinə əsasən müflis olma hüquqi şəxsin öz kreditorlarının pul öhdəlikləri və (və ya) digər icbari ödənişlər üzrə tələblərini, həmçinin işçilərinin əməkhaqqı və keçmiş işçilərin işdən çıxma müavinəti və (və ya) əmək haqqının ödənilməsinə dair tələblərini ödəmə qabiliyyətində olmaması faktının məhkəmə tərəfindən təsdiq edilməsidir.

E.A.Vasiliev müflis olmanın nisbi və mütləq növlərini fərqləndirirdi: 1) nisbi müflisolma hüquqi şəxsin öz kreditorlarının tələblərini ödəməyə qismən qadir olmaması; b) mütləq müflisolma isə borclunun öhdəliklərinin onun aktivlərindən artıq olması və normal dövriyyə şəraitində borclarını ödəyə bilməməsi deməkdir (Vasilyev, 1983: 94).

Türk hüquq ədəbiyyatlarında iflasın anlayışını dərk etmək üçün onun icra hüququ kontekstində təhlili aparılmışdır. Belə ki, Türkiyə Cümhuriyyənin hüquqi sitеminə əsasən, öhdəliklərin icrası ilə əlaqəli münasibətləri tənzimləyən hüquq institutu İcra hüququ adlanır. İcra hüququ öhdəliklərin könüllü icrası deyil, icra edilməmiş öhdəliklərin icra orqanları vasitəsilə məcburi icrası münasibətlərini tənzimləyir. Bu cür məcburi icra yolu ilə borclunun əmlakına həbs qoyulur, əmlak satılır və kreditorların tələblərini ödənilir.

Hüquqi doktrinaya əsasən İflas hüququ İcra hüququnun alt kateqoriyası kimi çıxış etməklə, iflas proseduru öhdəliyin məcburi icrası üsullarından biridir (Aslanoğlu, 2008: 203). Belə ki, öhdəliyin məcburi icrası üsulları qismən (cüzi) icra və tam (külli) icra olmaqla, sonuncusu iflas prosedurundan bəhs etməkdədir. Belə ki, qismən icrada borclunun bir və ya bir neçə kreditoru vardır. Bu halda borclunun bir və ya bir neçə əmlakı məcburi icra predmeti olmaqla onun kreditorlarınının tələblərinin ödənilməsi üçündür. Tam (külli) icrada, yəni iflas prosedurunda isə müvafiq məhkəmə tərəfindən müflis elan edilmiş borclunun bütün əmlak aktivləri hesabına onun bütün kreditorlarının tələbləri ödənilir. Beləliklə, iflas öhdəliyin icrasının kollektiv və məcburi üsuludur.

İcra hüququna əsasən borclu şəxsin bir və ya bir neçə kreditoru öz borclarını borclunun əmlakından almağa çalışırlar. Bu qayda cari qanunvericiliyimizdə də nəzərdə tutulmuş öhdəliyin icrası qaydasıdır. Məsələn: borclu şəxs öz öhdəliyinin icrası üçün pul verməli, əmlak verməli və s. hərəkətləri etməlidir. Lakin iflas hüququnda bütün kreditorların tələblərinin borclunun aktivlərindən təmin edilməsi prinsipi qəbul edilir (11). Yəni iflas hüququnda borclu müəssisənin öz əmlak aktivləri hesabına öhdəliyini icra etməsi deyil, borcun tutulması məqsədilə borclu müəssisənin bütün aktivləri üzrə həyata keçirilən məcburi ləğvetmə prosedurudur. İflas prosedurunun məqsədi borclunun müsadirə edilə bilən bütün əmlakının kreditorların borclarına ödənilməsidir (Pekcanıtez, Atalay, Özkan, Özekes, 10). İcranın digər növündən fərqli olaraq iflasda, borclu şəxsin müflis elan edilməsi qərarından sonra onun kreditorları kreditorlar yığıncağında öz tələblərini irəli sürürlər və kreditorlar hər biri üçün ayrıca müflisləşmə haqqında qərara ehtiyac olmadan bir iflas qərarından faydalanırlar (Önal, 2014: 2883).

Cari qanunvericiliyə əsasən hüquqi şəxsin müflis olmasının anlayışı verilmiş, lakin geniş şəkildə şərh edilməmişdir. Hüquqi şəxsin müflis olması və iflasının anlayışı verildiyi kimi, onun izahı olan “ödəmə qabiliyyətsizliyi” anlayışının da izah edilməsi və bu anlayışın hansı halları əhatə etməsinin aydınlaşdırılması da zəruridir.

Mülki Məcəlləyə əsasən hüquqi şəxsin onun müflis olması nəticəsində ləğvi nəzərdə tutulmuş, hüquqi şəxs öz kreditorlarının tələblərini ödəmə qabiliyyətində deyildirsə, onun ləğvinin yalnız müflis olma formasında həyata keçirilməsi tələbi təsbit olunmuşdur. Həmçinin həmin Məcəlləyə əsasən hüquqi şəxsin öz kreditorların tələblərini ödəməyə qadir olmaması halında, onun məhkəmənin qərarı ilə müflis hesab edilə bilməsi imkanı nəzərdə tutulmuşdur (5). Lakin qeyd edilən normalarda hüquqi şəxsin ödəmə qabiliyyətsizliyinin anlayışı verilməmişdir. Qeyd edilənlərə əsasən ödəmə qabiliyyətsizliyinə anlayış verilməsi və cari qanunvericilikdəki ziddiyyətlərin aydınlaşdırılması zəruridir.

İflas və müflis olma sferasında münasibətləri tənzimləyən “Müflisləşmə və İflas haqqında” Qanunun 1-ci maddəsində müflisləşməyə borclunun öz öhdəliklərini ödəmə qabiliyyətinin

olmaması kimi anlayış verilir. Həmin Qanuna əsasən hüquqi şəxsin ödəmə qabiliyyətsizliyi anlayışı və məzmunu verilmiş, bu anlayışa aşağıdakı hallar daxil edilmişdir:

a) borclu həyata və ya sağlamlığa vurulmuş zərərin ödənilməsi, alimentin tutulması, əmək və onunla bağlı münasibətlərdən yaranan öhdəliklər üzrə, müəlliflik müqaviləsinə görə ödənilən haqlar ilə bağlı öz kreditorları qarşısında öhdəliklərini icra müddəti başladığı andan etibarən ardıcıl 2 (iki) ay ərzində tam icra etməmişdir;

b) borclu vergilər (faizlər və tətbiq edilmiş maliyyə sanksiyaları) və başqa dövlət ödənişlərini onların hesablandığı gündən etibarən ardıcıl 10 (on) ay ərzində tam icra etməmişdir;

c) borclu digər kreditorlar qarşısında öhdəliklərini onun icrası üçün müəyyənləşdirilmiş müddətdə icra etməmişdir (4).

Lakin hesab edirik ki, qanunvericilikdə verilmiş bu anlayış qüsurludur. Belə ki, qeyd olunan maddənin 1-ci bəndinə əsasən borclunun ödəmə qabiliyyətinin olmaması meyarlarına alimentin tutulması da aid edilmiş, bu əsasla hüquqi şəxsin müflis olmuş elan edilməsi imkanı nəzərdə tutulmuşdur.

Lakin qeyd edilməlidir ki, aliment ailə-hüquqi münasibətlərdən irəli gələn bir məfhum olmaqla, bu cür öhdəliyin yerinə yetirilməməsi kommersiya hüququ subyekti olan borclu şəxsin müflis olmasının əsası qismində çıxış edə bilməz.

"Müflisləşmə və iflas haqqında" Qanunun 1-ci maddəsindən görünür ki, borclu şəxs anlayışı özündə borclu müəssisə və fərdi borclu anlayışlarını birləşdirmiş, borclu müəssisəyə-Azərbaycan Respublikasının ərazisində fəaliyyət göstərən və ya fəaliyyəti dayandırılmış və borcu olan hüquqi şəxs; fərdi borcluya isə-öz fəaliyyətini hüquqi şəxs yaratmadan həyata keçirən və borcu olan sahibkar, yəni fiziki şəxs kimi anlayış verilmişdir. Göründüyü kimi, müflis olma imkanı nəzərdə tutulan şəxs ya borclu müəssisə, ya da fərdi borclu ola bilməklə, bu şəxs hər bir halda sahibkarlıq subyekti olmalıdır. Beləliklə, sahibkarlıq subyekti qismində çıxış edən şəxsin ödəmə qabiliyyətinin olmamasının əsasları qismində ailə-hüquqi münasibətlərdən irəli gələn alimentin ödənilməməsi çıxış edə bilməz.

Bundan əlavə, qeyd edilməlidir ki, ödəmə qabiliyyətinin olmaması məzmunca borclu şəxsin öz borclarını "ödəməməsi" deyil, "ödəmə imkanında olmaması" anlayışını özündə ehtiva edir. Beləliklə göstərilən maddədə borclu şəxsin hüquqazidd hərəkətsizliyi müvafiq öhdəliklərin "icra edilməməsi" deyil, "icra edə bilməməsi", yaxud "icra etmə imkanında olmaması" kimi qeyd edilməlidir.

Göstərilənlərə əsasən hesab edirik ki, Qanunun müvafiq maddəsinin bəndləri aşağıdakı redaksiyada verilməlidir:

a) borclu həyata və ya sağlamlığa vurulmuş zərərin ödənilməsi, əmək və onunla bağlı münasibətlərdən yaranan öhdəliklər üzrə, müəlliflik müqaviləsinə görə ödənilən haqlar ilə bağlı öz kreditorları qarşısında öhdəliklərini icra müddəti başladığı andan etibarən ardıcıl 2 (iki) ay ərzində tam icra etmə imkanında olmamışdır;

b) borclu vergilər (faizlər və tətbiq edilmiş maliyyə sanksiyaları) və başqa dövlət ödənişlərini onların hesablandığı gündən etibarən ardıcıl 10 (on) ay ərzində tam icra etmə imkanında olmamışdır;

c) borclu digər kreditorlar qarşısında öhdəliklərini onun icrası üçün müəyyənləşdirilmiş müddətdə etmə imkanında olmamışdır.

Qeyd edilən əsaslar hüquqi şəxsin ödəmə qabiliyyətsizliyinin məzmununu təşkil etməklə, onun müflis edilməsinin meyarları qismində çıxış edə bilər.

Əlavə olaraq qeyd edək ki, cari qanunvericilikdə müflis olma və iflas anlayışları bir-biri ilə eyniləşdirilsə də, bu ifadələri bir-birindən fərqləndirmək lazımdır. Belə ki, hüquqi şəxsin müflis olması onun öz kreditorlarının tələblərini ödəmə qabiliyyətində olmamasıdır. Baqa sözlə desək, hüquqi şəxsin müflis olması onun aktiv maliyyə vəsaitlərinin tükənməsi səbəbindən öz kreditorlarının tələblərini ödəmə imkanında olmamasıdır.

Hüquqi şəxsin iflası isə onun müflis olmasının, yəni onun ödəmə qabiliyyəti olmaması faktının məhkəmə qaydasında təsdiq edilməsidir. Qeyd edək ki, Azərbaycan Respublikasının qüvvədən

düşmüş olan 22 iyul 1994-cü il tarixli, 857 №-li "Müflisləşmə və iflas haqqında" Qanununun 1-ci maddəsində "müflis olma" və "iflas" bir-birindən fərqləndirilmişdir. Həmin Qanunun 1-ci maddəsinə əsasən müflisləşməyə-borclunun öz öhdəliklərini ödəmə qabiliyyətinin olmaması, iflasa isə-borclunun öhdəliklərini mütləq ödəmə qabiliyyətində olmamasının məhkəmə tərəfindən təsdiq edilməsi kimi anlayış verilmişdir.

## Nəticə

Hazırki məqalənin məzmununda qeyd edilmiş təhlilə əsasən aşağıdakı aşağıdakı nəticələrə gəlinmişdir:

Hüquqi şəxsin müflis olması və onun iflası fərqli anlayışlar olmaqla müflis olma-hüquqi şəxsin öz kreditorlarının tələblərini ödəmə qabiliyyətində olmaması, iflas isə-hüquqi şəxsin kreditorlarının tələblərini ödəmə qabiliyyətində olmamasının məhkəmə qaydasında təsdiq edilməsidir.

Hüquqi şəxsin müflis olmasının maliyyə vəsaiti müflisləşməsi (cash flow insolvency) və balans müflisləşməsi (balance sheet insolvency) olaraq 2 forması vardır. Azərbaycan Respublikasının cari qanunvericiliyində hüquqi şəxsin müflis olmasının yalnız birinci növü nəzərdə tutulmuşdur. Balans müflisləşməsi dedikdə hüquqi şəxsin nizamnamə kapitalı da daxil olmaqla bütün balansının tükənməsi nəzərdə tutulur.

Lakin məlumdur ki, Azərbaycan Respublikası qanunvericiliyinə və hüquqi praktikasına əsasən icra edilməmiş öhdəlikləri olan hüquqi şəxsin təsisçilərinin öz təsis paylarını özgəninkiləşdirməsi yolverilməzdir. Bu səbəbdən Azərbaycan Respublikası qanunvericiliyi üçün hüquqi şəxsin balans müflisləşməsi formasında ləğvinin nəzərdə tutulması məqsədəuyğun deyildir.

Hüquqi şəxsin ödəmə qabiliyyətsizliyi ifadəsinə qanunvericilikdə verilmiş anlayış qüsurludur. Belə ki, həmin anlayışa əsasən borclunun ödəmə qabiliyyətinin olmaması meyarlarına alimentin tutulması da aid edilmiş, bu əsasla hüquqi şəxsin müflis elan edilməsi imkanı nəzərdə tutulmuşdur. Lakin aliment ailə-hüquqi münasibətlərdən irəli gələn bir məfhumdur və bu cür öhdəliyin yerinə yetirilməməsi sahibkarlıq hüququ subyekti olan borclu şəxsin müflis olmasının əsası qismində çıxış edə bilməz. Bu səbəbdən həmin meyar "Müflisləşmə və iflas haqqında" Qanunun 3-cü maddəsindən çıxarılaraq maddə müvafiq redaksiyada verilməlidir.

Ödəmə qabiliyyətinin olmaması məzmunca borclu şəxsin öz borclarını "ödəməməsi" deyil, "ödəmə imkanında olmaması" anlayışını özündə ehtiva edir. Beləliklə göstərilən maddədə borclu şəxsin hüquqazidd hərəkətsizliyi müvafiq öhdəliklərin "icra edilməməsi" deyil, "icra edə bilməməsi", yaxud "icra etmə imkanında olmaması" kimi qeyd edilərək həmin maddə müvafiq redaksiyada verilməlidir.

## Ədəbiyyat

1. https://ets.anadolu.edu.tr/storage/nfs/HUK206U/ebook/HUK206U-13V3S1-8-0-1-SV1-ebook.pdf
2. https://obastan.com/iflas/18105?l=az
3. https://gocardless.com/guides/posts/cash-flow-insolvency-vs-accounting-insolvency/
4. https://e-qanun.az/framework/4014.
5. https://e-qanun.az/framework/46944
6. Svistushkin Nikilgp Viktorovich. (2019). Bankrotstvo yuridicheskikh lits. Moskva, 1 s.
7. https://interactive-plus.ru/e-articles/epub-20141225/epub-20141225-5731.pdf
8. https://esj.pnzgu.ru/files/esj.pnzgu.ru/sil_chenko_es_17_4_20.pdf
9. Vasilyev, Ye.A. (1983). Pravovoye regulirovaniye nesostoyatel'nosti i bankrotstva v grazhdanskom i torgovom prave kapitalisticheskikh gosudarstv: ucheb. Posobiye. M.: MGIMO, 94 s.
10. Aslanoğlu, S. (2008). İcra və iflasa qarşı kommersiya debitor borcları; onun təbiəti, qanunvericilik ölçüsü və mühasibat təcrübəsi. Afyon Kocatepe Universiteti İqtisadiyyat və İdarəetmə Fakültəsi Jurnalı, Cilt 10, Sayı 2, 203 s.
11. https://cdn.istanbul.edu.tr/FileHandler2.ashx?f=i%CC%87fla%CC%82s-hukuku-son.pdf

DOI: https://doi.org/10.36719/2663-4619/101/149-153

**Nərmin Məhərrəmli**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
magistrant
maharramlinarmin17@gmail.com

# ORTA MƏKTƏBDƏ FUNKSİYA ANLAYIŞININ TƏDRİSİ HAQQINDA

## Xülasə

Funksiya anlayışı orta məktəbin 7-ci sinifindən etibarən tədris edilən ən önəmli bölmələrdən biridir. Elmdə gedən sürətli inteqrasiya prosesi bütün sahələri müəyyən bir platformada birləşdirməyə imkan verən bir müstəvi yaradıb. Bu müstəvi virtual reallığa çevrilmiş avtomatik sistemlər platformasıdır. Elmi biliklərin sürətlə və kumulyativ şəkildə yığılması nəticəsində tədqiqatçılar üçün elmi əsərlərini yazmaq və təhlil etmək ciddi mənada problemə çevrilib. Qeyd olunan boşluğu aradan qaldırmaq üçün daha çox sosial elmlərdə olan kumulyativ biliklərin, arqumentlərin yoxlanılması, həmçinin ədəbiyyat axtarışlarından tutmuş nəticəyə qədərki proses üçün 1833-cü ildən başlayaraq bu proqramlar yaradılmağa başlanıldı və bunun nəticəsində riyazi məsələnin həllində funksiyalarla işləmək daha daha səmərəlidir. Məqalədə orta məktəb 10-cu sinif şagirdlərinə funksiyanın öyrədiləsi metodikasından bəhs edilmişdir. Şagirdlər qruplara bölünmüşdür və onlara verilən müvafiq tapşırıqları həll edib müzakirə etmişlərdir. Bunun sayəsində onlar funksya anlayışı ilə daha dərindən tanış olmuşdurlar.

***Açar sözlər:*** *funksiya, təyin oblastı, qiymətlər çoxluğu, funksiyanın xarakteristikası*

**Narmin Muharramli**
Azerbaijan State Pedagogical University
master student
maharramlinarmin17@gmail.com

## About teaching the concept of function in secondary school

## Abstract

The concept of function is one of the most important sections taught from the 7th grade of secondary school. The rapid integration process in science has created a plane that allows to connect all fields on a certain platform. This plane is a platform of automated systems transformed into virtual reality. As a result of the rapid and cumulative accumulation of scientific knowledge, it has become a serious problem for researchers to write and analyze their scientific works. In order to overcome the mentioned gap, these programs were started to be created starting from 1833 for the verification of cumulative knowledge and arguments in social sciences, as well as for the process from literature searches to the result, and as a result, it is more efficient to work with functions in solving a mathematical problem. The article talks about the methodology of teaching the function to the 10th grade high school students. Students were divided into groups and solved and discussed the respective tasks given to them. Thanks to this, they became more familiar with the concept of function.

***Keywords:*** *function, domain, set of values, characteristic of the function*

## Giriş

**Məqalənin aktuallığı:** Məqalədə elementar funksiyalar, onların növləri, tədris prosesində istifadəsi və təsnifatı haqqında ümumi məlumat verilmişdir. Funksiyalar sinifi geniş olduğundan onların öyrədilməsi zamanı daha ümumi xarakteristikaları və fərqli cəhətləri təhlil edilir, analoji olaraq öyrədilməsinə tövsiyyələr verilir.

**Məqalənin elmi yeniliyi:** Tədris prosesində məsələ və misalların həlli zamanı istifadə etdikləri funksiyaların oxşar və fərqli cəhətləri qabardılır onların hər birinin oxşar cəhətləri ümumiləşdirilir, öyrədilməsində bu xassələrdən istifadəyə nümunələr göstərilir.




**Məqalənin nəzəri əhəmiyyəti:** Funksiyalar bir çox fərqli tipdə olan məsələ və misalların həllində səmərli rol oynayır. Bu tədqiqatın nəzəri əhəmiyyəti funksiyaların həm cəlbedici, həm də effektiv olan innovativ öyrənmə üsulunu təmin etməklə, müəllimin pedaqoji ustalığını necə artıra biləcəyini izah edir (Jacobs, 2009).

**Məqalənin praktiki əhəmiyyəti:**

Orta məktəbdə funksiya anlayışının inkişafı riyaziyyatın ən fundamental və mühüm hissələrindən biridir. Bu kurslar tələbələrə riyazi təfəkkür və problem həll etmə bacarıqlarını öyrədir, onlara analitika, qrafika və cəbr üzrə ümumi perspektiv verir. Keçirilən mövzular çərçivəsində tələbələr funksiyalar haqqında anlayışı, əsas funksiyaların xassələrini, onların qrafiklərini oxumaq və təsvir etmək və bu funksiyaların tətbiqini öyrənirlər.

Orta məktəbdə funksional elmlərin öyrənilməsi ümumiyyətlə aşağıdakı mövzuları əhatə edir:

Funkların təqdimatı: Funkların anlayışı, əsas funksiyaları (xətti, kvadrat, mürəkkəb üsulları, eksponensial, loqarifmik kimi) və onların əsas xüsusiyyətləri (Swokowski, Cole, 2015).

Funksiyaların cəbri təsviri: Funksiyaları, əməliyyatları (tərkibi, çıxış, vurma, paylaşma), funksiyaların dəyişdirilməsi və birləşməsini ifadə etmək üçün cəbri formalar.

Funksiyaların qrafikləri: Funksiyaların qrafik təsviri, xüsusi nöqtələr (mək, kəsişmə, simmetriya, istisnalar) və qrafik dəyişikliklər.

Funksiyaların tətbiqi: Funksiyaların həllinin tapılması, praktiki məsələlər, müsbət və mənfi funksiyaların mənası, prosedur funksiyalar, loqarifmik funksiyalar kimi ən sadə nümunələr.

Funksional alətlər və tətbiqi alətlər: Kalkulyatorlar, qrafik kalkulyatorlar, kompüterlər və proqramlar kimi alətlərdən istifadə (Foerster, 2006).

Bu mövzular tələbələrin güclü təfəkkürünün və funksiyaların problem həll etmə qabiliyyətlərinin inkişafı üçün zəngin baza təşkil edir. Bu kurslar riyaziyyatın daha mərkəzləşdirilmiş və tətbiqi sahələrinə məruz qalmağı, eləcə də təcrübələr və problemlər vasitəsilə praktik təcrübəni təmin edir.

**Alt standart:**

2.2. Funksiya anlayışını bilir, həyati problemlərin riyazi modellərini qurur və funksiyaların xassələrinin köməyi ilə bu problemləri həll edir.

2.2.1.Ədədi funksiyanın tərifini və verilmə üsullarını bilir, onun təyin oblastı, qiymətlər çoxluğu anlayışlarını başa düşür.

2.2.2. Funksiyanın qrafiki anlayışını bilir, funksiyanın dövrülüyünü, təkliyini, cütlüyünü, monotonluğunu araşdırır, qrafikləri çevirməyi bacarır (Qəhrəmanova, Kərimov, Hüseynov, 11).

**İş formaları:** Əməkdaşlıq, kiçik qruplarla və cütlərlə iş.

**Üsul:** Əqli hücum, müşahidə, nümayiş, tədqiqatçılıq.

Dərsin gedişi

**1. Sinfin təşkili - 2dəq**

Sinfə daxil olub, salamlaşdıqdan sonra davamiyyəti yoxlayıb, dərsdə iştirak etməyənləri qeyd edir, sinfi nəzərdənkeçirilir. Daha sonra sinfi kiçik qruplara bölür və qruplar adlandırılır.

**2. Motivasiyanın yaradılması və problemin qoyuluşu - 5 dəq.**

Birinci saatda əsas diqqət iki dəyişən arasındakı asılılığın funksiya olub olmadığını müəyyən etmə bacarığının formalaşdırılmasına verilir. Şagirdlərin funksiya haqqında bilikləri ümumiləşdirilir. Funksya nədir? Verilmiş iki dəyişən arasındakı asılılıqdan hansı funksiyadır? "X çoxluğunun hər bir x elementinə Y çoxluğunun müəyyən bir y elementini qarşı qoyan qaydaya X çoxluğunda təyin olunmuş funksiya deyilir" tərifi müzakirə edilir. D(f) və E(f) işarələmələri daxil edilir. Təsəvvür edin ki, sinifdə 25 stul və 20 şagird var. Hər bir şagird bir yer seçib oturur. Hər

şagirdə qarşı bir yer var. Bir şagird eyni zamanda iki yerdə otura bilməz. Bu nümunə funksiyaya aid ən sadə və real həyati situasiya nümunəsidir. x-in hər bir qiymətinə y-in yeganə qiyməti uyğun gəlir. Şagirdlər X çoxluğunu təşkil edir və bu funksiyanın təyin oblastıdır, Y isə stullar çoxluğu olub funksiyanın qiymətlər çoxluğunu təşkil edir. 4 kateqoriyada qruplaşdırılmış aşağıdakı asılılıqlar nəzərdən keçirilir.

Birə-bir qarşıqoyma. Bu halda x-in hər bir qiymətinə y-in bir qiyməti qarşı qoyulur.




Bir qiymətə bir neçə qiyməti qarşıqoyma. Bu halda x-in bir qiymətinə y-in birdən çox qiyməti qarşı qoyulur (Serra, 2007).




Bir neçə qiymətə bir qiymət qarşıqoylur. Bu halda x-in ən azı iki qiymətinə y-in bir qiyməti qarşı qoyulur.




Bir neçə qiymətə bir neçə qiyməti qarşıqoyma. Bu halda x-in ən azı iki qiymətinə y-in ən azı iki qiyməti qarşı qoyulur (Smith, Dossey, Bittinger, Beecher, 2010).



Tədqiqat sualı: Bu asılılıqlardan hansına funksiya demək olar, hansına funksiya demək olmaz?

**3.Tədqiqatın aparılması-10 dəq.**

Dərsin əvvəlində şagirdlər bölünən qruplar üzrə verilmiş sualların cavablarını qeyd edirlər.

**Funksiya qrupu.**

**1)** y = 2x + b funksiyasının qrafiki A(1; –1) nöqtəsindən keçir. a) b-ni tapın b) Funksiyanın qrafikini qurun.

**2)** g(x) = 4x3 – x funksiyası üçün g(2) + g(–2) cəmini hesablayın (Qəhrəmanova, Kərimov, Hüseynov, 11).

**Təyin oblastı qrupu.**

1) c-nin hansı qiymətində f(x) = x2 + x + c funksiyasının qrafiki A(–1; 2) nöqtəsindən keçir? (Qəhrəmanova, Kərimov, Hüseynov, 16)

2) f(x) = 1 – 2x funksiyası verilmişdir. f(–2), f(0), f(0,5), f(3) qiymətlərini tapın.

**Qiymətlər çoxluğu qrupu.**

**1)** f(x) = x2 – 2x + q funksiyası verilmişdir. f(0) = –3 olarsa, f(–1)i tapın.

**2)** Təyin oblastı (Həsənov, Seyidov, 4) olan hər hansı artan funksiyanı qrafik təsvir edin (Qəhrəmanova, Kərimov, Hüseynov: 14).

**4.Məlumat mübadiləsi-5 dəq.**

Hər qrupdan öz işinin nəticələrini təqdim edilməsi tələb edilir. Təcrübələrdən alınan nəticələri taqdim edilmiş vatman kağızda qeyd edib lövhədən asmaqla təqdimat başlayır. TƏqdimatı digər qruplar dinləyir, lazım gəldikdə əlavə suallar verilir.

**5.Məlumatın müzakirəsi və təşkili-5 dəq.**

Məlumatın müzakirəsi üçün şagirdlərin fiziki düşüncələrini inkişaf etdirmək məqsədi ilə aşağıdakı kimi sinifdə sorğu təşkil edirəm.

M: Funksiya nəyə deyilir?

Ş: X çoxluğunun hər bir x elementinə Y çoxluğunun yeganə y elementini qarşı qoyan qaydaya X çoxluğunda təyin olunmuş funksiya deyilir.

M: Burada x və y nədir və necə adlanır?

Ş: Burada x sərbəst dəyişən və ya arqument, y isə asılı dəyişən və ya funksiya adlanır.

M: Funksiya necə işarə olunur?

Ş: Funksiya adətən f (və ya g, h və s.) ilə, arqumentin verilmiş x qiymətinə funksiyanın uyğun qiyməti isə f(x) (və ya g(x), h(x) və s.) ilə işarə edilir (11; 12).

**6.Müqayisə ümumiləşdirmə və nəticə- 5 dəq.**

M: Funksiya nəyə deyilir?

Ş: X çoxluğunun hər bir x elementinə Y çoxluğunun yeganə y elementini qarşı qoyan qaydaya X çoxluğunda təyin olunmuş funksiya deyilir.

M: Funksiyanın təyin oblastı nədir?

Ş: Arqumentin ala bildiyi bütün qiymətlər çoxluğuna funksiyanın təyin oblastı deyilir.

M: Funksiyanın qiymətlər çoxluğu nədir?

Ş: Arqumentin bu qiymətlərinə uyğun asılı dəyişənin aldığı bütün qiymətlər funksiyanın qiymətlər çoxluğunu əmələ gətirir.

M: Təyin oblastı və qiymətlər çoxluğu necə işarə olunur?

Ş: f funksiyasının təyin oblastı adətən D(f) ilə, qiymətlər çoxluğu isə E(f) ilə işarə edilir.

M: Funksiya hansı üsullarla verilə bilər?

Ş: Cədvəllə, analitik üsulla (düsturla), qrafiklə və s.

**7.Yaradıcı tətbiqetmə- 7 dəq.**

Şagirdlərin mövzuya aid biliklərini möhkəmləndirmək üçün şagirdlərə müstəqil həll etmək üçün çalışmalar verilir. Tapşırıqlar yoxlanılır və qiymətləndirilir.

**8.Qiymətləndirmə-3 dəq.**

İş vərəqlərini təhlil edib qruplari * işarəsi ilə aşağıdakı kimi qiymətləndirirəm. Qiymətləndirmə meyarı aşağıdakılardır: Şərhetmə, müşahidəetmə, ümumiləşdirmə, təqdimetmə.

| **Kiçik qruplar Meyar** | **Funksiya qrupu** | **Təyin oblastı qrupu** | **Qiymətlər çoxluğu qrupu** |
|---|---|---|---|
| **Şərhetmə** | ***** | ***** | **** |
| **Müşahidəetmə** | ***** | ***** | ***** |
| **Ümumiləşdirmə** | ***** | **** | **** |
| **Təqdimetmə** | ***** | **** | **** |

**9. Evə tapşırıq- 3 dəq.**

10-cu sinifləri üçün riyaziyyat fənni üzrə dərslikdən səhifə 16-da olan 9, 10 və 11 nömrəli tapşırıqları həll edin.

## Nəticə

1. Funksiyalar anlayışının köməyi ilə məsələ həlli şagirdlərin fəallığının, motivasiyasının artması ilə nəticələnə bilər.
2. Şagirdlərdə qruplarla işləmə bacarığının inkişafı.

## Ədəbiyyat

1. Jacobs, H.R. (2009). Mathematics: A Human Endeavor. W.H. Freeman and Company.
2. Swokowski, E.W., Cole, J.A. (2015). Precalculus: Functions and Graphs. Cengage Learning.
3. Foerster, P. (2006). Algebra and Trigonometry: Functions and Applications. Prentice Hall.
4. Qəhrəmanova, N., Kərimov, M., Hüseynov, İ. Ümumi təhsil müəssisələrinin 10-cu sinifləri üçün riyaziyyat fənni üzrə dərslik.
5. Serra, M. (2007). Discovering Geometry: An Inductive Approach. Key Curriculum Press.
6. Smith, C.W., Dossey, J.A., Bittinger, M.L., Beecher, J.A. (2010).
7. Həsənov, Ə.S., Seyidov, M.İ. Ali riyaziyyatin xüsusi bölmələri.
8. Qəhrəmanova, N., Kərimov, M., Hüseynov, İ. Ümumtəhsil məktəblərinin 10-cu sinfi üçün riyaziyyat fənni üzrə dərsliyin metodik vəsaiti.
9. Larson, R., Boswell, L., Kanold, T., Stiff, L. (2015). Algebra 1. McDougal Littell.
10. Algebra and Trigonometry. Pearson Education.
11. https://science.gov.az/az/news/open/14915
12. https://anl.az/el/Kitab/2014/Azf-280886.pdf

Göndərilib: 11.01.2024 Qəbul edilib: 23.03.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/154-159

**Jalə Orucova**
Qərb Kaspi Universiteti
magistrant
jorucova35@gmail.com
UOT 39

# CƏNUBİ QAFQAZ TÜRKLƏRİNİN MƏİŞƏT HƏYATINDA XALÇA MƏMULATLARININ YERİ

**Xülasə**

Təbiətimiz kimi rəngarəng olan xalçalarımız Allahın bizə bəxş etdiyi bütün gözəllikləri - səmaya aid maviliyi, təbiətə aid yaşıllığı, çiçəklərə aid rəngarəngliyi, Qafqaz dağlarının zirvəsində yer tutmuş ağ rəngi özündə əks etdirir. Elə buna görə də tarixən qədimdən bu ərazilərdə məskunlaşmış türklərin ənənəvi məişət həyatını xalça məmulatları olmadan təsəvvür etmək mümkün deyil. Azərbaycan xalçaları rənglərin tükənməzliyi, naxışların fərqlililiyi, xalqın yaradıcı təxəyyülü sayəsində dünya mədəniyyəti içərisində özünəməxsusluğu ilə fərqlənir. Bu məqalədə Cənubi Qafqaz türklərinin gündəlik həyatında, yaşam tərzində xalça məmulatlarından istifadə qaydaları, onların tarixi-etnoqrafik ədəbiyyatda verilmiş təsvirləri haqqında məlumat veriləcək.

***Açar sözlər:*** *xalça, keçə, palaz, cecim, həsir*

**Jala Orujova**
Western Caspian University
master student
jorucova35@gmail.com
UOT 39

## The place of carpet products in the household life of the South Caucasus turks

**Abstract**

Although the Turkish villages settled in the foothills of the Caucasus mountains have changed from a nomadic life to a sedentary economy, they continue to keep their historical traditions alive. They have chosen the carpet as their companion in all areas of their lives, wedding customs, holiday celebrations, funerals, and even funerals. This is proven not only by archaeological facts, written sources, illustrated documents but also by blood memory and folklore literature. Carpet patterns, ornaments, and decorations approved by art experts also allow us to study the beliefs, worldviews, and tribal symbols of the ancient Turks. Although the use of carpets has changed its purpose in all periods according to the requirements of the time, it still remains in a superior position in people's life.

***Keywords:*** *carpet, felt, palaz, cecim, mat*

## Giriş

Türk xalqlarının təsərrüfat həyatının çox hissəsi köçəri maldarlıqla keçdiyi üçün onların məişətində yundan istifadə geniş yayılmışdır. Qoyun, dəvə, keçi yunundan müxtəlif növ hörmə, toxuma, sırıma məmulatları hazırlanırdı. Arxeoloji faktlar hələ Qafqazda qədim zamanlardan keçəçilik, toxuculuq, ipəkçilik peşələrinin inkişaf etdiyini göstərir. Eləcə də orta əsrlərdə regiona səfər etmiş Avropalı səyyah, tacir və diplomatların gündəlik qeydlərində evlərin, çadırların, sarayların və məscidlərin divar və döşəməsində xalçaların, kilimlərin istifadəsi göstərilmişdir. Orta əsr şərq mədəniyyətinin gözəlliklərini özündə əks etdirən miniatür əsərlərdə də xalçaların məğrur duruşunu görə bilirik.

Azərbaycan şairi Fikrət Sadiq "Əlifbanı bilməyən nənəmin əlyazması min bir buta" şeirində milli xalçalarımızı təbiətlə müqayisə etmiş və əlifbanı bilməyən nənələrimizin ilmələri möhtəşəm əlyazma hazırladığını vurğulamışdır.

Xalça naxış-naxışdı,
Bu bulud, bu yağışdı.
Yeri canlı bahardı,
Köbəsi qarlı qışdı......
Əlifbanı bilməyən nənəmin əlyazması,
Bir gülünə həkk olub, həm özü, həm dünyası" (Fikrət, 2010: 254-255).

Yüksək sənətkarlıq qabiliyyəti ilə fərqlənən xalçaları həm dekorasiya, həm də evlərdə də istilik yaratmaq məqsədi ilə istifadə edirdilər. Xalqın ailə məişətində istifadə edilən xalça və xalça məmulatlarına nəzər saldıqda onların hər birinin toxuduğu bölgələrə məxsus məhəlli-lokal xüsusiyyətlərini görə bilirik. Qədim dövrdən uzun inkişaf yolu keçən xalçalar azərbaycanlı ailəsinin daima istifadəsində olmuşdur. Hər dövrün tələblərinə uyğun olaraq toxunan xalçalar yaşayış məskənlərinin tipindən asılı olaraq döşəməsini və divarlarını həm bəzəmiş, həm də isti-soyuqdan qorumuşdur.

Cənubi Qafqaz türklərinin bir çox yaşayış evləri olmuşdur ki, daimi və müvəqqəti olmaqla iki yerə bölünmüşdür. Daimi yaşayış evlərindən "qaradam", "qazma ev", "kaha evlər", "möhrə ev", "torpaqlı ev", "seyvanlı ev", "qom-qamış ev", "aradoldurma ev", "kirəmitli ev", "aynabəndli ev", "şirvani ev" və s. adlarını çəkmək olar. Müvəqqəti evlər maldarlıq təsərrüfatı ilə əlaqəli olaraq alaçıq, çadır, muxur, qarakeçə və dəyəni göstərə bilərik. Bu evlərin daxili sahmanı hər dövrün inkişaf səviyyəsindən, ailənin maddi və sosial durumundan, yaşayış evinin tipindən və ailənin xanımının zövqündən asılı olaraq dəyişirdi. Yaşayış evlərinin qədim tarixi kimi xalçalarımızında tarixi qədimdir.

Mezolit dövründə hörmə texnikasının təkmilləşməsi və bəsit əl iyi (teşi) vasitəsi ilə əyriçiliyin meydana gəlməsi sayəsində yun ip, kəndir və bir qədər sonralar isə pambıq lifindən hazırlanan iplik, erkən orta əsrlərdən başlayaraq ipək teli (keçi sap) toxuma məmulatlarının başlıca xammalına çevrilmişdir (Mustafayev, 2010: 66).

Eneolit və tunc dövrü abidələri içərisində sümük və gil tağalaqların (iy başlıqlarının) və parça qalıqlarının tapılması, Mingəçevirdə yerli əhalinin miladdan əvvəl III minillikdən başlıyaraq toxuculuq sənəti ilə müəyyən dərəcədə tanış olduğunu göstərir (Vahidov, 1961: 84).

Görkəmli arxeoloqlarımız S.Qazıyev, R.Vahidov, Q.Aslanov, Q.İone və başqaları 1946-1953-cü illərdə Mingəçevirdə aparılan arxeoloji qazıntılar zamanı əldə etdikləri toxuculuq nümunələri əsasında burada orta əsrlərdə toxuculuq sənətinin bütün mərhələləri ilə məşğul olduqlarını müəyyən etmişlər.

R.Vahidov həmçinin "Mingəçevir III-VIII əsrlərdə" əsərində qeyd etmişdir: "3№ yaşayış yerindəki torpaq döşəmə üzərində kiçik bir sahədə açıq qəhvəyi rəngində xalça vəya palaz qalığı və onun toxunma izləri aşkar olunmuşdur. Bu fakt Mingəçevirdə III-VIII əsrlərdə əhalinin xalçaçılıqla tanış olduğunu söyləməyə müəyyən dərəcədə imkan verir". Mingəçevir katakomba qəbrlərində toxuculuq alətləri, toxuculuq dəzgahı, zinət şeyləri və.s qoymuşlar (Qaziyev, 1952: 52).

Etnoqraf alim H.Həvilov yazırdı: "Qaradam tipli qazma və yarımqazma evlərdə daxili səliqə-sahman o qədər də nəzərə çarpmırdı. Yerüstü evlərin daxili quruluşunda isə tikinti texnikasının təkmilləşməsi və adamların mədəni səviyyəsinin yüksəlməsindən asılı olaraq əhəmiyyətli dəyişiklik baş vermişdi. Belə evlərin divarlarında məişət xidməti vəzifəsi daşıyan rəflər və taxçalar (çamaxadan) qurulur və buraya qab-qacaq və palaz-paltar yığılırdı. Bəzi müstəsna hallar nəzərə alınmazsa, yoxsul kəndli evlərində də demək olar ki, mebel avadanlığı yox idi. Ailənin bütün gündəlik həyatı torpaq döşəmə üzərində cərəyan edirdi. Odur ki, yerə əvvəlcə keçə və ya palaz salır, onun üstündən də gəbə - xalça döşəyirdilər (Həvilov, 1991: 133-134).

Etnoqraf Solmaz Məhərrəmova yazırdı ki, "Qaradamların daxili memarlıq konstruksiyası da maraqlı idi. Belə ki, qaradam bir neçə hissəyə bölünürdü. Bir hissədən tövlə kimi istifadə edərək heyvanları saxlayır, digər hissədə yemək hazırlayır, çörək bişirir və yatırdılar. Başqa bir hissə isə "qonaq otağı" adlanırdı. Bu otaq xalçalarla bəzədilir, qonaq üçün xüsusi yorğan-döşək ayrılırdı" (Məhərrəmova, 2007: 39). Xalqın ənənələri içərisində "qonaq qarşılama", "qonaq saxlama" yüksək

dəyərləndirilən adətlərdən olduğu və xalçalar da ən dəyərli əşya hesab edildiyi üçün qonaq otağında ən gözəl və təzə xalçalar yerləşdirlərdi.

Laçın və Kəlbəcər üçün xarakterik olan kaha evlərin daxili sahmanını təsvir edən Etnoqraf Solmaz Məhərrəmova "XIX əsr və XX əsrin əvvəllərində Kiçik Qafqazın cənub-şərq bölgəsinin maddi mədəniyyəti və təsərrüfatı” adlı etnoqrafik əsərdə yazırdı: “Kahaların içərisi rutubətli olduğuna görə çox zaman otağın bir tərəfində döşəmənin səviyyəsindən azacıq hündürdə taxt düzəldir, üstünü xalça palaz, döşəkcə, kiçik yastıq və mütəkkələrlə bəzəyirdilər”. Şirələnmiş döşəməyə, ev sahibinin maddi imkanından asılı olaraq keçə (garbit), palaz, cecim, həsir (tumu-püzətumu, lığ tumu), kilim, xalça, gəbə və. s salınır, üzərinə aşılanmış qoyun dərisindən ayaqaltılar qoyulur, mütəkkə, balış və döşəkçələr (nalça, nimdər) düzülürdü (Şəkil 1.). Bəzən evin divarlarına da yerdən 50-60 sm hündürlükdə həsir çəkilirdi. Varlı evlərində bu tərtibat daha zəngin olurdu: divarlara xalçalar asılırdı (Fikrət, 2020: 73).



**Şəkil 1. Evin daxili interyeri**

XIX-XX əsr evlərin daxili səliqə-sahmanında xalça və xalça məmulatları daha çox gözə çarpır. Evin divarlarında açırımlar olurdu. Açırımlar müxtəlif məqsədlər üçün düzəldilirdi. Ailənin fərdləri yemək, yatmaq və başqa gündəlik işləri evin döşəməsində edirdilər. Bütün işlər döşəmə üzərində edildiyindən evin döşəməsinin səliqəli düzəldilməsinə diqqət edirdilər. Adətən evin döşəməsi evin qadını tərəfindən şirələnirdi. Yay aylarında tez-tez suvanan evlərin döşəməsini suvamaq üçün saman qatılmış palçıqla suvaq edilir, suvaq quruduqdan sonra onun üzərinə və divarlara ağ gildən şirə çəkilirdi. Şirələnmiş döşəməyə ev sahibinin maddi imkanından asılı olaraq ilk həsir salınır, sonra kilim, xalça, və. s salınaraq evi bəzəyirdilər.

Xalqın folklorunda, dastanlarda, bayatılarda, atalar sözləri və məsəllərdə kök salmış xalçalar onun mənəvi dəyərinin ayrılmaz hissəsi olduğunu bir daha təsdiqləyir.

Xalça – qədim xəritə, hikmətlə dolu şeir,
Burda zərrəcə nöqtə bir kitablıq söz deyir.
Xalça uzaq dünənin bu günə gül xonçası
Min bir əfsanə söylər hər gülü, hər qönçəsi (Vəliyev, 2010: 18).

İstər yaşayış evlərinin, istərsə də ictimai binaların daxili interyerində xalçalardan istifadə olunarkən çox vaxt onun ölçüləri təyinat yerinə görə müəyyən olunurdu. Naxçıvan bölgəsinin varlı evlərində xüsusi sifarişlə Təbriz ustaları tərəfindən toxunmuş xallı-xalça dəstləri ilə evi döşəmək adət halını almışdı. Tavan istisna olmaqla, bütün döşəmə və divar bütöv xalçaya tutulurdu. Sifariş verilərkən evin qapı və pəncərə açırımlarının ölçüləri nəzərə alınırdı. Xalı döşəməni tam tutmayanda ona "kənarə" deyilən ensiz, uzunsov, xalçalar əlavə edilirdi. Giriş qapısının astanasına "payandaz" atılırdı (Azərbaycan etnoqrafiyası, 2007: 68).

Xalçaların toxunması uzun müddətə və zəhmətə başa gəldiyindən onu qorumaq da lazım gəlirdi. Buna görə də palçıq döşəməsi və divarı olan evlərə öncə keçə və ya həsir tutulur, onun üzərindən də xalça sərilirdi. Azərbaycan etnoqrafiyası kitabında da qeyd edildiyi kimi, XIX–XX əsrin əvvəllərində qışda isti saxlayan və yayda sərinlik verən keçələr evlərin bəzədilməsi və döşənməsi üçün istifadə edilirdi. Evlərin bəzədilməsində işlədilən naxışlı keçə "nəmənd" adlanır (Azərbaycan etnoqrafiyası, 2007: 68).

Elatların yaylaqlara köçü zamanı müvəqqəti yaşadığı evlərdən biri də alaçıq olmuşdur. Varlı ailələrdə alaçıqların bəzədilməsinə daha çox diqqət yetirilirdi. Müvəqqəti yaşayış evlərində nəmişliyin qarşısını almaq üçün yerə həsir döşəyir onun üstündən palaz və xalça salırdılar. Xəncər, tüfəng və digər silahları sünəcədən və yaxud dəyə çübuğundan asırdılar (Həvilov, 1993: 67). Alaçıq və dəyələrdə nazik və yüngül toxunması ilə digər kilim növlərindən fərqlənən yun cecimi xatırladan "Vərni"dən divar bəzəyi kimi istifadə edilirdi (Mustafayev, 2009: 83).

Dahi Nizami Gəncəvi "İskəndərnamə" əsərində xalça və xalça məmulatları haqqında bəhs etmişdir:

Biri çox ip əyirmiş toxusun palaz,
Palazın yerini tapmışdır atlas.
Kirmələr, ipəklər, fərşlər, xalçalar,
Nə əldə nizə, nə oxluqda ox var.



**Şəkil 2. "Şeyx Səfi" xalçası**

istifadə etmək və siyasi, iqtisadi, sosial, mədəni, mülki və ya hər hansı digər sahədə bərabər müdafiə altında olmaq hüququna malikdir. 4-cü maddədə deyilir ki, dövlətlər qadınlara qarşı zorakılığı pisləməli və bunun qarşısını almaq üçün öz öhdəliklərindən yayınmaq üçün heç bir adət, ənənə və ya dini inanca istinad etməməlidir (5).

BMT-yə üzv olan dövlətlər tərəfindən gender bərabərliyi və qadınların səlahiyyətləndirilməsi məsələləri ilə bağlı da bir çox tədbirlər həyata keçirilmişdir. 1975-ci ildə Meksikada keçirilən Birinci Ümumdünya Qadın Konfransı (Dinçer, 2014: 18-19) dünya dövlətlərinin yalnız qadın problemlərini müzakirə etmək üçün toplaşdığı ilk beynəlxalq toplantı idi. Bu konfransı 1980-ci ildə Kopenhagen konfransı, 1985-ci ildə Nayrobi konfransı və 1995-ci ildə Pekin konfransı izlədi. Bu konfranslar arasında 4-15 sentyabr 1995-ci ildə Pekində keçirilmiş IV Ümumdünya Qadın Konfransı ən geniş iştiraklı konfrans olub və dünyanın 189 ölkəsindən hökumət nümayəndələri ilə yanaşı, dünyanın hər yerindən qadın təşkilatlarının da iştirak etdiyi konfransdır. Konfransda Pekin Bəyannaməsi və Fəaliyyət Platformasının qəbul edilməsi ilə qadın və qızların hüquqlarının fundamental və universal insan hüquqlarının tərkib hissəsi olduğu qəbul edilmiş, həmçinin qadınlara qarşı zorakılığın və qadın-kişi bərabərsizliyinin inkişafın və sülhün qarşısındakı ən böyük maneələrdən biri olduğu vurğulanmışdır. Qərarın mətnində bu fikir "Qadınların səlahiyyətlərinin artırılması və qərarların qəbul edilməsində iştirakı, o cümlədən bərabərlik anlayışına əsasən cəmiyyətin bütün sahələrində tam iştirakı bərabərliyə, inkişafa və sülhə nail olmaq üçün əsas şərtdir" kimi qeyd olunub.

Pekində keçirilən konfransdan 5 il sonra BMT Baş Assambleyası tərəfindən 05-09 iyun 2000-ci il tarixlərində Nyu Yorkda Qadınlar 2000: 21-ci əsr üçün gender bərabərliyi, inkişaf və sülh (PEKİN+5) adlı sessiya keçirilmişdir. Sessiyanın məqsədi 1995-ci ildə keçirilən konfransdan sonra baş vermiş hadisələri qiymətləndirmək, yeni fəaliyyət və təşəbbüsləri müəyyən etmək olub. Sessiyada 188 ölkədən ümumilikdə 1500 qeyri-hökumət təşkilatı iştirak edib. Burada qadınlara qarşı zorakılığın mənasının genişləndirildiyi və tərifinə namus cinayətləri və məcburi nikaha daxil olan "Yekun Aktı" qəbul edilib. Sessiyada Siyasi Bəyannamə və Yekun Aktının qəbulu ilə dövlətlər Pekin Fəaliyyət Platformasında göstərilən 12 kritik məsələ ilə bağlı öhdəliklərinin arxasında olduqlarını da göstərdilər.

Qadınlara qarşı zorakılığın qarşısının alınması ilə bağlı qəbul edilmiş ən mühüm konvensiyalardan biri Qadınlara qarşı ayrı-seçkiliyin bütün formalarının ləğv edilməsi haqqında Konvensiyadır (CEDAW). Konvensiya Birləşmiş Millətlər Təşkilatının Baş Assambleyası tərəfindən 18 dekabr 1979-cu ildə qəbul edilmiş və 3 sentyabr 1981-ci ildə qüvvəyə minmişdir. Qadınlara qarşı ayrı-seçkiliyin tərifi Konvensiyanın 1-ci maddəsində verilmişdir. Bu tərifə əsasən, Bu Konvensiyanın məqsədləri üçün qadınlar barəsində ayrı-seçkilik anlayışı qadınların ailə vəziyyətlərindən asılı olmayaraq, kişi və qadınların hüquq bərabərliyi əsasında insan hüquqlarının və siyasi, iqtisadi, sosial, mədəni, mülki və hər hansı digər sahələrdə əsas azadlıqların zəiflədilməsini yaxud tanınmamasını, qadınların onlardan istifadə etməsini yaxud onları həyata keçirməsini heçə endirməyə yönəlmiş cinsi əlamətə görə hər hansı fərqləndirmə, istisna yaxud məhdudiyyət deməkdir (Qadınlara qarşı ayrı-seçkiliyin bütün formalarının ləğvi haqqında Konvensiya, 1981).

Bununla belə, CEDAW-da qadınlara qarşı zorakılığa birbaşa toxunan heç bir maddə olmadığı üçün 1992-ci ildə 19-cu Tövsiyə qəbul edilmişdir. Qərarda gender əsaslı zorakılıq qadınların kişilərlə bərabər hüquq və azadlıqlarından istifadə etmələrinə ciddi əngəl törədən ayrı-seçkilik forması kimi göstərilir. Digər tərəfdən, Qadınlara Qarşı Ayrı-seçkiliyin Aradan Qaldırılması üzrə Komitə bu Qərarın işığında, iştirakçı dövlətlərə zorakılığın miqyası, onun səbəbləri və nəticələri, habelə zorakılığın qarşısının alınması və zorakılıqla mübarizə üçün görülən tədbirlərin effektivliyi ilə bağlı statistik məlumatların və tədqiqatların məcmuələrini təqdim etmələri; öz hesabatlarında qadınlara qarşı zorakılığı davam etdirən davranışların, adətlərin və təcrübələrin xarakterini və miqyasını və bunun nəticəsində yaranan zorakılığın formalarını müəyyən etmələri; zorakılıqla mübarizə üçün gördükləri tədbirlər və bu tədbirlərin nəticələri haqqında hesabatlar hazırlamaları; qadınların kişilərlə bərabərliyinə mane olan qərəzləri aradan qaldırmağa kömək edəcək təhsil və

ictimai məlumat proqramlarına başlamaları; namus naminə qadın ailə üzvlərinə qarşı hücumlara və ya qətllərə haqq qazandıran qanunların ləğvi kimi məsələlərlə bağlı konkret tövsiyələr verdi (Qadınlara qarşı ayrı-seçkiliyin qarşısının alınması Komitəsi Ümumi Tövsiyələr, 1986-2013: 21).

**Avropada hüquqi tənzimləmələr.**

Avropa Şurası 3 avqust 1949-cu ildə yaradılıb və yarandığı gündən insan hüquqlarının müdafiəsi və inkişafı istiqamətində fəaliyyətə başlayıb. Nəticədə 04 noyabr 1950-ci ildə Romada İnsan Hüquqlarının və Əsas Azadlıqların Müdafiəsi üzrə Avropa Konvensiyası imzalanmış və bu Konvensiya 03 sentyabr 1953-cü ildə qüvvəyə minmişdir. Konvensiyaya əlavə olaraq qəbul edilmiş Protokollarla (9) yekunlaşan Avropa İnsan Hüquqları Konvensiyasında qadınlara qarşı zorakılıqla bağlı birbaşa maddə olmasa da, yaşamaq hüququnu, işgəncənin qadağan edilməsini, köləliyin və məcburi əməyin qadağan edilməsini, nikah hüququ, ayrı-seçkiliyin qadağan edilməsi, 7-ci Əlavə Protokolda müəyyən edilmiş ər-arvad arasında bərabərlik hüququ nəzərə alınmalı olan məsələlərdir. Konvensiyanın ən mühüm xüsusiyyəti hüquq və azadlıqların 33-cü maddəsində nəzərdə tutulmuş dövlətlərarası müraciətlər və 34-ci maddəsində nəzərdə tutulmuş fərdi müraciətlər vasitəsilə müdafiə mexanizminin yaradılmasıdır (10).

Qadınlara qarşı zorakılıqla bağlı mühüm beynəlxalq sənədlərdən biri Avropa Şurasının Qadınlara qarşı zorakılığın və məişət zorakılığının qarşısının alınması və onunla mübarizə haqqında Konvensiyasıdır5. Müqavilə İstanbulda imzalanmağa açıldığı üçün ona İstanbul Konvensiyası da deyilir. Konvensiya 11 may 2011-ci ildə qəbul edilmiş və 12 ölkənin imzası ilə 2014-cü il avqustun 1-də qüvvəyə minmişdir. İstanbul Konvensiyası beynəlxalq hüquqda qadınlara qarşı zorakılıq və məişət zorakılığına qarşı sanksiyaları nəzərdə tutan, məcburi və müstəqil nəzarət mexanizminin yaradılmasını ehtiva edən və zorakılığın kişi və qadınlar arasında bərabərsizliyin nəticəsi olduğunu vurğulayan ilk konvensiyadır (Moroğlu, 2012: 366). Digər tərəfdən, İstanbul Konvensiyasının ən mühüm xüsusiyyəti bioloji, hüquqi və ya ailə bağı olmasından asılı olmayaraq məişət zorakılığının, məsələn, keçmiş və ya indiki həyat yoldaşları, nikahdankənar tərəfdaşlar, birgə yaşayan ailə üzvləri, qohumlar və ya birlikdə yaşayan digər şəxslər tərəfindən istiqamətləndirilən zorakılığın və qadına qarşı hər cür zorakılığın qarşısının alınması və onunla mübarizə üçün standartları nəzərdə tutan və Avropa ölkələri üçün hüquqi cəhətdən məcburi olan ilk sənəd olmasıdır (Kadriye, 2015: 134).

Konvensiya zorakılığın qarşısının alınması üçün yol xəritəsini tərtib etmişdir; Konvensiyada maarifləndirmə, ekspertlərin təlimi, profilaktik müdaxilə, müalicə proqramları, özəl sektor və media dəstəyinin alınması, psixoloji və hüquqi dəstək xidmətləri, sığınacaqların yaradılması, təcili yardım xətlərinin açılması, fiziki ziyana məruz qalanlara kompensasiya ödənilməsi və hüquqi yardım xidmətləri müfəssəl şəkildə tənzimlənir. Bununla belə, qeyd etmək lazımdır ki, razılığa gələn dövlətlərin üzərinə qoyulan öhdəliklərə əməl edilmədikdə/pozulduqda, sanksiya kimi heç bir tənzimləmə tətbiq edilməmiş və Konvensiyada monitorinq mexanizmi adı altında qadınlara qarşı zorakılıq və məişət zorakılığına qarşı fəaliyyət üzrə ekspert qrupu (GREVIO) yaradılacağını və bu qrupun Konvensiyanın icrasına nəzarət edəcəyi bildirilmişdir.

## Nəticə

Məişət zorakılığı qurbanlarına yardım zamanı konfidensiallığın təmin edilməsi dedikdə, əldə olunması məhdudlaşdırılmış informasiyanın hüquqi rejiminə riayət olunması başa düşülür.

Məişət zorakılığı qurbanlarına yardım göstərildikdə konfidensiallığın təminatı şəxsi və ailə həyatı ilə bağlılıq və ictimailəşmə baxımdan zəruri sayılır. Belə ki, məişət zorakılığı şəxsi və ailə həyatı ilə sıx bağlı olduğu üçün qurbanlar demək olar ki, əksər hallarda zorakılıq faktının ictimailəşməsindən və bununla da cəmiyyətdə biabır olmaqdan qorxurlar.

İstanbul Konvensiyası məlumatların qorunması dedikdə, fərdi (şəxsi) məlumatların qorunmasını nəzərdə tutur:

Birincisi, Konvensiya konfidensiallıq terminindən deyil, «privacy» terminindən istifadə edir ki, bu termin bilavasitə şəxsi və ailə həyatına hörmət hüququ ilə əlaqədardır.

İkincisi, Konvensiyada istintaq, məhkəmə və xidməti fəaliyyətlə bağlı sirrlərə toxunulmur.

Üçüncüsü, Konvensiya konfidensiallıq qaydalarından istisna qayda müəyyənləşdirir ki, bu da Konvensiyanın əhatə dairəsinə daxil olan ciddi zorakılıq aktının törədildiyinə və gələcəkdə də törədilməsinin gözlənildiyinə inanmaq üçün əsaslı səbəblərin olması ilə bağlı mümkündür.

Dördüncüsü, Konvensiya məzmun etibarilə açıq və qapalı informasiyaya bölgünü aparsa da, fərdi məlumatları hər bir halda konfidensial xarakterlə müəyyənləşdirir.

İstanbul Konvensiyasından fərqli olaraq, milli-hüquqi yanaşmada məişət zorakılığının formaları sadalansa belə, leqal anlayışda yalnız fiziki və mənəvi zərərin vurulması təsbit olunmuşdur. Mahiyyət etibarilə, iqtisadi xarakterli məhdudiyyətlərin maddi ziyan vurmasını nəzərə alsaq, qanunda verilən leqal anlayışın redaktə olunmasını daha məqsədəuyğun hesab edirik. Milli-hüquqi aspektdən yanaşma konfidensial informasiyanı isə daha geniş məzmunda şərh edir, lakin çatışmazlıqlar ailə həyatına dair məlumatlarla bağlı özünü büruzə verir. Milli qanunvericilikdə ailə həyatına daxil olan məlumatlar İnsan Hüquqları üzrə Avropa Məhkəməsindən fərqli olaraq, bir qədər ümumi formada müəyyən olunmuşdur. Belə ki, cinsi həyat haqqında məlumatları, vətəndaşlıq vəziyyəti aktlarının qeydiyyatı haqqında məlumatları, ailə həyatının ayrı-ayrı məqamları haqqında məlumatları və övladlığa götürmə ilə bağlı məlumatları sadalayan qanunverici ailə həyatının ayrı-ayrı məqamlarına daxil olan ünsürləri açıqlamır. Hesab edirik ki, Məhkəmə tərəfindən müəyyən olunan "ailə həyatı" ilə əhatə olunan bütün münasibətləri məhz həmin məqamlara aid etmək olar.

## Ədəbiyyat

1. Əliyev, Ə., Rzayeva, G., İbrahimova, A., Məhərrəmov, B., Məmmədrzalı, Ş. (2019). İnformasiya hüququ. Bakı: Nurlar, 448 s.
2. https://treaties.un.org/doc/publication/ctc/uncharter.pdf
3. Aydın, F.Ç. (2017). Birləşmiş Millətlər Təşkilatının qadınların vəziyyəti üzrə komisiyasının təlimatları və 60-cı sessiya üçün qeydlər. Ankara: Qadın namizədlərə dəstək assosiasiyası, 84 s.
4. The United Nations General Assembly. (1993). Declaration on the Elimination of Violence against Women, http://www.un.org/documents/ga/res/48/a48r104.htm
5. https://www.tbmm.gov.tr/komisyon/kefe/belge/uluslararasi_belgeler/kadina_karsi_siddet/BM%20Kad%C4%B1na%20Kar%C5%9F%C4%B1%20%C5%9Eiddetin%20Ortadan%20Kald%C4%B1r%C4%B1lmas%C4%B1na%20Dair%20Bildirgesi%2020.12.1993.pdf
6. Dinçer, O. (2014). Bərabərlik təsəvvürünün ümumi quruluşu: Birləşmiş Millətlər Təşkilatının Qadınların Vəziyyəti Komissiyasının iş prioritetlərinin və siyasət mətnlərinin təhlili. Ankara, Türkiyə Respublikası Ailə və Sosial Siyasətlər Nazirliyi Qadının Statusu Baş İdarəsi, 124 s. https://www.tbmm.gov.tr/komisyon/kefe/belge/uluslararasi_belgeler/pekin-5%20Kad%C4%B1n%202000%2021.Y%C3%BCzy%C4%B1l%20%C4%B0%C3%A7in%20Toplumsal%20Cinsiyet%20E%C5%9Fitli%C4%9Fi,%20Kalk%C4%B1nma%20ve%20Bar%C4%B1%C5%9 F.pdf
7. Qadınlara qarşı ayrı-seçkiliyin bütün formalarının ləğvi haqqında Konvensiya. (1981). İnsan Hüquqları Jurnalı, 14 s. https://www.ihd.org.tr/kadinlara-kar-hertlayrimcilin-lenensuluslararasi-slees/
8. Qadınlara Qarşı Ayrı-seçkiliyin Ləğv Edilməsi üzrə Komitənin Ümumi Tövsiyələri. (1986-2013). 117 s. https://www.tbmm.gov.tr/komsyon/kefe/belge/uluslararasi_belgeler/ayrimcilik/CEDAW/tavsiye_kararlari/CEDAW%20Komitesi%20Tavsiye%20Kararlar%C4%B1_(1-29).pdf
9. 06.01.2016 tarixli yanvar ayı keçirilmiş Şura İclası Qərarlarının Xülasəsi.
10. https://www.echr.coe.int/Documents/Convention_ENG.pdf
11. Moroğlu, N. (2012). Qadınlara qarşı şiddətin qarşısının alınması, 6284 saylı Qanun və İstanbul Kovensiyası, Türkiye Barolar Birligi Dergis, s.357-380.
12. Kadriye, B. (2015). İstanbul Konvensiyası. Ankara Barosu Dergisi, s.133-204.

Göndərilib: 20.01.2024 Qəbul edilib: 23.03.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/212-219

**Ayxan Abbaslı**
Qərbi Kaspi Universiteti
magistrant
abbasli.2001@icloud.com

# DAXİLİ TURİZM BAZARININ TƏKMİLLƏŞDİRİLMƏSİ İSTİQAMƏTİNDƏ GÖRÜLƏN DÖVLƏT TƏDBİRLƏRİ VƏ PROQRAMLARI

**Xülasə**

**Tədqiqatın məqsədi:** Məqsəd, axili turizm bazarını gücləndirmək üçün dövlət tərəfindən həyata keçirilən müxtəlif tədbirləri və proqramları qiymətləndirmək və təhlil etməkdir. Yerli turizmin təşviqinə yönəlmiş marketinq kampaniyalarının, infrastrukturun inkişafının, siyasət təşəbbüslərinin və maliyyə stimullarının effektivliyinin araşdırılmasını əhatə edir.

**Elmi Yenilik:** Tədqiqatın yeni aspekti daxili turizmi inkişaf etdirmək üçün yeni fikirlərin üzə çıxarılması və ya innovativ strategiyaların təklif edilməsini əhatə edir. Buraya az öyrənilmiş turizm istiqamətlərinin müəyyən edilməsi, turizmin təşviqi üçün inkişaf etməkdə olan texnologiyalardan istifadə edilməsi və ya hələ geniş şəkildə qəbul edilməmiş unikal siyasət yanaşmalarının təklif edilməsi daxil ola bilər.

**Tədqiqatın Nəticələri:** Nəticələrə təfərrüatlandıracaq, artan turizm axını, iqtisadi təsirlərin qiymətləndirilməsi və ya xüsusi proqram və təşəbbüslərin effektivliyi haqqında məlumatlar daxildir. Nəticələr dövlət tədbirlərinin daxili turizmə necə təsir etdiyini aydın şəkildə göstərir.

**Tədqiqatın Məhdudiyyətləri:** Məlumatların mövcudluğu, coğrafi əhatə dairəsi və ya tədqiqatın vaxt çərçivəsi ilə bağlı məhdudiyyətlər daxil ola bilər. Məhdudiyyətlərin tanınması tədqiqat nəticələrinin kontekstini və tətbiqini başa düşmək üçün çox vacibdir.

**Praktik əhəmiyyəti:** Tədqiqatın real dünya nəticələrini müzakirə edəcək. Turizm orqanları, siyasətçilər və ya turizm sənayesində özəl sektorun maraqlı tərəfləri üçün praktiki tövsiyələr təklif edə bilər. Əsas diqqət tapıntıların daxili turizmi yaxşılaşdırmaq üçün necə tətbiq oluna biləcəyinə yönəldiləcək.

**Tədqiqatın orijinallığı:** Mövcud tədqiqat, əvvəlki boşluqları necə aradan qaldırdığını, yeni metodologiyalar təklif etdiyini və daxili turizmin təkmilləşdirilməsi üzrə yeni perspektivləri necə təmin etdiyini vurğulayır.

***Açar sözlər:*** *daxili turizm, turizm siyasəti, Turizm üzrə Dövlət Proqramları, turizmin inkişafi strategiyaları, yerli turizmin təşviqi, turizm infrastrukturu*

**Aykhan Abbasli**
Western Caspian University
master student
abbasli.2001@icloud.com

## State measures and programs to improve the domestic tourism market

**Abstract**

**Objective of the study:** The objective of the study is to evaluate and analyze the various measures and programs implemented by the government to strengthen the domestic tourism market. It includes examining the effectiveness of marketing campaigns, infrastructure development, policy initiatives and financial incentives aimed at promoting local tourism.

**Scientific Innovation:** The novel aspect of research involves uncovering new ideas or proposing innovative strategies to develop domestic tourism. This may include identifying understudied tourism destinations, using emerging technologies to promote tourism, or proposing unique policy approaches that have not yet been widely adopted.

**Research Findings:** This may include information on increased tourism flows, economic impact assessments, or the effectiveness of specific programs and initiatives, which will detail the results of the research. The results clearly show how government measures affect domestic tourism.

**Limitations of the Study:** Limitations may include data availability, geographic scope, or time frame of the study. Recognizing limitations is critical to understanding the context and application of research findings.

**Practical Importance:** Will discuss the real-world implications of the research. Tourism authorities can offer practical advice for policy makers or private sector stakeholders in the tourism industry. The focus will be on how the findings can be applied to improve domestic tourism.

**Research originality:** The current research highlights how it addresses previous gaps, suggests new methodologies, and provides new perspectives on improving domestic tourism.

***Keywords:*** *domestic tourism, tourism policy, State Tourism Programs, tourism development strategies, promotion of local tourism, tourism infrastructure, economic ipact of tourism*

## Giriş

Son illərdə daxili turizm bazarı ölkələr arasında iqtisadi artım və mədəni mübadilə üçün katalizator kimi mühüm əhəmiyyət qazanmışdır. Araşdırmada dövlət orqanları tərəfindən daxili turizmin inkişaf etdirilməsi istiqamətində həyata keçirilən müxtəlif tədbirlər və proqramlar yerini tapır. Tədqiqatın əhəmiyyəti onun nəinki iqtisadiyyata verdiyi töhfə, həm də mədəni irsin, yerli adət-ənənələrin və milli birliyin təbliğində həlledici rol oynayan sektora vaxtında diqqət yetirməsindədir. Təbii olaraq dinamik və qlobal tendensiyalara və yerli ehtiyaclara cavab verən turizm sənayesi davamlı problemlər və imkanlarla üzləşir. Mövcud kontekstdə dövlətin rəhbərlik etdiyi təşəbbüslər və siyasətlər daxili turizm mənzərəsinin formalaşmasında böyük əhəmiyyətə malikdir. İnfrastrukturun inkişafı və marketinq strategiyalarından tutmuş dayanıqlı təcrübələrə və icmanın cəlb edilməsinə qədər dövlətin rolu çoxşaxəli və təsirlidir (Anderson, Chen, 2021: 97).

Qlobal səyahət dinamikası dəyişdikcə, yerli və davamlı təcrübələrə artan vurğu ilə dövlət tədbirlərinin effektivliyini anlamaq həyati əhəmiyyət kəsb edir. Məqsəd bu tədbirləri təkcə onların dərhal iqtisadi faydaları baxımından deyil, həm də daxili turizm sektorunda uzunmüddətli, davamlı artımı dəstəkləmək qabiliyyəti baxımından təhlil etməkdir. Məqalə, texnoloji irəliləyişlər, dəyişən istehlakçı seçimləri və sosial-iqtisadi dəyişikliklər kimi amillərdən təsirlənən daxili turizmin inkişaf edən təbiətini qəbul edir. Dəyişikliklər qarşısında dövlət tədbirlərinin uyğunlaşması və operativliyi həlledici əhəmiyyət kəsb edir (Beyker, 2022: 84).

**Qrafik 1. Dövlət tədbirləri və yerli turizm bararlarının inkişafı**




**Mənbə: http://www.anl.az/down/meqale/azerbaycan/azerbaycan_may2009/77832.htm.**

Qrafik 1-də qırmızı xətt dövlət proqramlarının sayını (illər üzrə), mavi xətt isə turizm gəlirlərini (milyonlarla ABŞ dolları ilə) əks etdirir. Qrafikdən dövlətin turizm sektoruna artan proqramları və investisiyaları turizm gəlirlərinin artmasına səbəb olduğu görünür.

Daxili turizm və yerli icmalar arasında qarşılıqlı əlaqə bu tədqiqatın mühüm komponentini təşkil edir. Dövlət tədbirləri çox vaxt təkcə turistləri cəlb etmək üçün deyil, həm də yerli əhaliyə fayda vermək, mədəni irsi təbii sərvətləri qorumaq üçün nəzərdə tutulub. Turizmin və davamlı icmanın inkişafına bu ikili diqqət sosial və ekoloji məsuliyyətlə iqtisadi qazancları tarazlaşdıran innovativ yanaşmaları araşdırmaq üçün zəmin yaradır. Turizmin təşviqi və idarə edilməsində rəqəmsal texnologiyaların tətbiqi bu araşdırmaya başqa ölçü təklif edir. Turist təcrübələrini və əməliyyat səmərəliliyini artırmaq üçün rəqəmsal platformalardan, sosial mediadan və məlumat analitikasından istifadə üzrə dövlət təşəbbüsləri onların təsirini və potensialını anlamaq üçün araşdırılır. Tədqiqat qlobal səyahət modellərində dəyişikliklərin daxili turizmə əhəmiyyətli təsir göstərə biləcəyi beynəlxalq konteksti nəzərdən keçirir (Collins, 2020: 41).

**Cədvəl 1. 2018-2023-cü illər üçün turistlərin sayını (milyonlarla) və dövlət xərcləri (milyonlarla ABŞ dolları ilə).**

| l | Turistlərin Sayı (Milyon) | Dövlət Xərcləri (Milyon USD) |
|---|---|---|
| 2018 | 1.2 | 200 |
| 2019 | 1.5 | 250 |
| 2020 | 1.0 | 180 |
| 2021 | 1.3 | 300 |
| 2022 | 1.7 | 350 |
| 2023 | 2.0 | 400 |

**Mənbə:https://tourism.gov.az/uploads/documents/sa%C4%9Flaml%C4%B1q_turizmi_haqq%C4%B1nda.**

Cədvəl 1-də, hökumət tədbirləri və turizm sektorundakı inkişaflar arasında mümkün əlaqəni göstərmək üçün statistik məlumatlarından istifadə etməklə yaradılmışdır.

Tədqiq edilən digər ölçü ictimai-siyasi amillərin daxili turizmə təsiridir. Sosial məsələlərin və siyasi dinamikanın ictimai qavrayış və davranışları sürətlə dəyişdirə bildiyi bir dövrdə dövlətin bu mürəkkəblikləri idarə etməkdə rolunu anlamaq həyati əhəmiyyət kəsb edir. Məqalə, dövlət tədbirlərinin yerli turistlər üçün sabit və qonaqpərvər mühiti təmin etməklə bu problemləri necə həll etdiyini araşdırır. Sürətlə dəyişən dünyada daxili turizmdə dövlət tədbirlərinin uğuru təkcə onların dərhal təsiri ilə deyil, həm də onların zamanla uyğunlaşma və təkamül qabiliyyəti ilə ölçülür. Tədqiqat həm də dövlət tədbirlərində innovasiya və kreativliyin roluna mühüm diqqət yetirir. Daxili turizm getdikcə rəqabətli və doymuş bazara çevrildikcə, unikal və ixtiraçılıq strategiyalarına ehtiyac hər şeydən üstündür (Davis, Kumar, 2019: 76).

Nəzərdə tutulan digər mühüm aspekt dövlət tədbirlərinin daha geniş iqtisadi və sosial məqsədlərə uyğunlaşdırılmasıdır. Buraya turizm təşəbbüslərinin nəqliyyat, qonaqpərvərlik və əyləncə kimi digər sektorlarla necə inteqrasiya olunduğunu və bu sinerjilərin daha böyük iqtisadi və sosial təsir üçün necə optimallaşdırıla biləcəyini başa düşmək daxildir. Tədqiqat dövlət tədbirlərinin turizmdə inklüzivliyi və əlçatanlığı həll etmə yollarını araşdırır, daxili səyahətin faydalarının geniş şəkildə yayılmasını və müxtəlif əhali üçün əlçatan olmasını təmin edir. Dövlət tədbirlərinin işlənib hazırlanması və həyata keçirilməsində maraqlı tərəflərin cəlb edilməsinin və əməkdaşlığın vacibliyi də diqqət mərkəzindədir. Dövlət qurumları, özəl sektor oyunçuları, yerli icmalar və beynəlxalq təşkilatlar arasında tərəfdaşlıqların təhlilini əhatə edir. Mövcud əməkdaşlıqlar turizm sektorunun hərtərəfli inkişafı üçün vacibdir, siyasətlərin təkcə effektiv deyil, həm də əhatəli olmasını və müxtəlif maraqları və perspektivləri təmsil etməsini təmin edir (Johnson, Garcia, 2023: 78).

Daim dəyişən qlobal mənzərədə gələcək tendensiyaları və çağırışları qabaqcadan görmək çox vacibdir. Məqsəd, gələcək illərdə güclü və möhkəm daxili turizm bazarını inkişaf etdirməyə davam etmək üçün dövlət tədbirlərinin necə uyğunlaşdırıla və inkişaf etdirilə biləcəyinə dair strateji proqnoz verməkdir. Həmçinin cari reallıqların, innovativ təcrübələrin və gələcəyə baxan perspektivlərin qarışığını təklif edərək daxili turizm bazarında dövlət tədbirlərinin hərtərəfli və dərin təhlilini təqdim etməyə çalışır. Daxili turizmin inkişafı ilə bağlı müzakirələrə mənalı töhfə vermək, bu mühüm sektorda gələcək tədqiqatlar və siyasətin qurulması üçün zəmin yaratmaq məqsədi daşıyır.

**Qrafik 2. İllər üzrə turistlərin sayı və dövlət xərclərinin iqtisadi təsirləri.**




**Mənbə: http://anl.az/el/h/hi_te.pdf.**

Qrafik-"Daxili turizm bazarının inkişafı üçün dövlət tərəfindən həyata keçirilən tədbirlər və proqramlar" mövzusundadır. Diaqramda turistlərin sayı və dövlət xərclərinin iqtisadi təsirləri illər üzrə göstərilir. Turistlərin sayı milyonlarla, hökumət xərclər milyon ABŞ dolları ilə göstərilir. Qrafikdən göründüyü kimi, dövlət xərclərinin artması ilə yanaşı turistlərin sayında da artım tendensiyası müşahidə olunur. Bu onu göstərir ki, hökumətin turizm sektoruna yatırdığı investisiyalar turistlərin sayına müsbət təsir göstərir (Martin, 2018: 56).

**Şəkil 1. Daxili Turizmin İnkişaf obyektləri**



**Mənbə:https://azertag.az/xeber/olke_turizminin_inkisafinda_dovlet_desteyi_daim_hiss_olunur-1268274**

**Cədvəl 2.Daxili turizm bazarının inkişafı üçün dövlət tərəfindən həyata keçirilən tədbirlər və proqramlar.**

| İl | Dövlət Proqramlarının Sayı | Turizm Gəliri (Milyon USD) |
|---|---|---|
| 2018 | 10 | 500 |
| 2019 | 12 | 550 |
| 2020 | 15 | 450 |
| 2021 | 18 | 600 |
| 2022 | 20 | 650 |
| 2023 | 22 | 700 |

**Mənbə: http://anl.az/down/meqale/ses/2010/iyul/127204.htm.**

Cədvəl 2-də, dövlət tədbirləri ilə daxili turizm gəlirləri arasındakı əlaqəni göstərmək üçün məlumatlarından istifadə etməklə yaradılmışdır. “Daxili turizm bazarının inkişafı üçün dövlət tərəfindən həyata keçirilən tədbirlər və proqramlar” mövzusunda statistik cədvəl. Cədvəldə 2018-ci ildən 2023-cü ilə qədər dövlət proqramlarının və turizm gəlirlərinin sayı (milyon ABŞ dolları ilə) göstərilir (Patel, 2022: 67).

Daxili turizm bazarının təkmilləşdirilməsi üzrə dövlət tədbirlərinin və proqramlarının araşdırılmasının aktuallığı iqtisadi, sosial və ekoloji ölçülərə toxunmaqla çoxşaxəlidir. Mövzu hər biri turizm sektoru və bütövlükdə milli iqtisadiyyat daxilində daha geniş məqsədləri və problemləri əks etdirən bir neçə səbəbə görə böyük əhəmiyyət kəsb edir.

**İqtisadiyyatın bərpası və diversifikasiyası:** Turizm sektoru çox vaxt milli iqtisadiyyatların əhəmiyyətli bir hissəsini təmsil edir, xüsusən də zəngin mədəni irsə, təbii gözəlliyə və ya hər ikisinə malik ölkələrdə. Daxili turizmin inkişafı və gücləndirilməsi təbii fəlakətlər və ya COVID-19 kimi pandemiyalar kimi böhranlardan sonra iqtisadi bərpa üçün həyati strategiya ola bilər. Ölkələr daxili bazara diqqət yetirməklə, azalmış beynəlxalq turist axınının təsirini azalda, yerli biznesi və məşğulluğu dəstəkləyə bilər (Tompson, Robertson, 2020: 78).

ELMİ İŞ Beynəlxalq elmi jurnal. İmpakt Faktor: 2.717. 2024 / Cild: 18 Sayı: 4 / 212-219 ISSN: 2663-4619
SCIENTIFIC WORK International scientific journal. Impact Factor: 2.717. 2024 / Volume: 18 Issue: 4 / 212-219 e-ISSN: 2708-986X

**Davamlılıq və Ətraf Mühitin Mühafizəsi:** Daxili turizmin gücləndirilməsi davamlılıq istiqamətində qlobal səylərlə uzlaşır. Yerli səyahətləri həvəsləndirmək beynəlxalq uçuşlarla bağlı karbon izlərini azalda, təbii ehtiyatların qorunmasını təşviq edə və yerli təbii və mədəni irs haqqında məlumatlılığı və qiymətləndirməni artıra bilər. Ekoloji təmiz təcrübələrə və məsuliyyətli turizmə üstünlük verən dövlət tədbirləri beləliklə, geniş ekoloji məqsədlərə töhfə verə bilər (Williams, 2021: 33).

**Qrafik 3. Daxili turizmin üzərindəki təsirləri**




**Mənbə: https://www.kitabxana.net/files/books/file/1534170921.pdf.**

Qrafik 3-də, daxili turizmin müxtəlif təsir sahələri üzərindəki diqqət faizlərini vizual şəkildə təqdim edir. Qrafik, davamlılıq, ətraf mühitin mühafizəsi, sosial birlik və milli kimlik kimi dörd əsas təsir sahəsinə dövlət tədbirlərinin və proqramlarının nə dərəcədə önəm verdiyini göstərir. Hər bir sahə üzrə diqqət faizi aşağıdakı kimi təyin edilmişdir (Zhang, Nguyen, 2024: 31):

- Davamlılıq: %85
- Ətraf Mühitin Mühafizəsi: %80
- Sosial Birlik: %90
- Milli Kimlik: %95

Bu göstəricilər, daxili turizm proqramlarının və tədbirlərinin həm ekoloji məsuliyyət və davamlılıq, həm də sosial birlik və milli kimlik qurmaq məqsədlərinə necə yönəldiyini simvolizə edir. Milli Kimlik sahəsi ən yüksək diqqət faizilə təmsil olunur, bu da dövlət proqramlarının vətəndaşları öz ölkələrini kəşf etməyə və milli mədəniyyət və irsləri ilə daha dərin əlaqə qurmağa təşviq etmək məqsədini gücləndirdiyini göstərir. Sosial Birlik, insanların bir-birləri ilə və ölkənin müxtəlif mədəni və təbii xüsusiyyətləri ilə əlaqə qurmasını dəstəkləyərək, cəmiyyətdə bütövlük hissini artırmaq məqsədini əks etdirir (Brown, Smith, 2020: 76).

Qrafikdə Davamlılıq və Ətraf Mühitin Mühafizəsi sahələri də yüksək faizlərlə təmsil olunur, bu da daxili turizmin təbii ehtiyatların qorunması, ekoloji təmiz təcrübələrin təşviq edilməsi və karbon izlərinin azaldılması kimi davamlılıq məqsədlərinə necə xidmət etdiyini vurğulayır. Bu göstəricilər, daxili turizmin həm yerli iqtisadiyyata, həm də ətraf mühitə məsuliyyətli yanaşma çərçivəsində necə töhfə verə biləcəyini göstərir (Chen, 2019: 94).

Ümumilikdə, bu qrafik daxili turizmin gücləndirilməsinin həm ictimai, həm də ekoloji baxımdan davamlı inkişaf üçün necə mühüm olduğunu vizual şəkildə təsdiqləyir. Bu, dövlət tədbirləri və proqramlarının müxtəlif aspektlərə necə yönəldiyini və bu sahələrdə müsbət dəyişikliklərə necə töhfə verə biləcəyini aydınlaşdırır.

**Sosial Birlik və Milli Kimlik:** Daxili turizmin təşviqi sosial birliyi və milli kimliyi gücləndirmək üçün unikal imkan təqdim edir. Vətəndaşları öz ölkələrini kəşf etməyə təşviq edən dövlət tərəfindən maliyyələşdirilən proqramlar vasitəsilə fərdlər öz milli irslərini, müxtəlif mədəniyyətlərini və təbiət mənzərələrini daha dərindən dərk edə və qiymətləndirə bilərlər. Bu, əhali arasında qürur, birlik və aidiyyət hissini gücləndirə bilər (Davis, Hernandez, 2021: 56).

**Uyğunlaşma və Davamlılıq**: COVID-19 pandemiyası turizm sektorunda uyğunlaşma və dayanıqlılığın vacibliyini vurğuladı. Daxili turizmə diqqət yetirmək qlobal səyahət məhdudiyyətlərinə və dəyişən istehlakçı seçimlərinə cavab olaraq daha çox çevikliyə imkan verir. Dövlət tədbirləri infrastrukturun, rəqəmsal platformaların və yerli səyahətçilər üçün uyğunlaşdırılmış marketinq kampaniyalarının inkişaf etdirilməsi və bununla da sektorun xarici şoklara qarşı dayanıqlığının artırılmasını əhatə edə bilər (Evans, Patel, 2018: 66).

**Uzunmüddətli Böyümə və İnkişaf:** Daxili turizmə sərmayə yatırmaq sadəcə ani çağırışlara qısamüddətli cavab deyil, uzunmüddətli böyümə və inkişaf strategiyasıdır. Turizm təkliflərini şaxələndirmək, əlçatanlığı yaxşılaşdırmaq və attraksionların davamlılığını təmin etməklə dövlətlər daha möhkəm turizm bazarı yarada bilərlər. Bu, təkcə yerli iqtisadiyyatlara fayda vermir, həm də ölkələri gələcək beynəlxalq ziyarətçilər üçün daha cəlbedici istiqamətlər kimi mövqeləndirir.

Daxili turizm bazarının təkmilləşdirilməsi üzrə dövlət tədbirlərinin və proqramlarının aktuallığı onun iqtisadi sabitliyə, ekoloji dayanıqlığa, sosial birliyə, sektorun dayanıqlığına və uzunmüddətli artıma töhfə vermək potensialında özünü göstərir. Təqdim edilən mövzu, siyasətçilər, sənaye maraqlı tərəfləri və eyni zamanda icmalar tərəfindən hərtərəfli araşdırma və strateji həyata keçirilməsini təmin edir (Garcia, Liu, 2022: 67).

## Nəticə

Tədqiqat daxili turizm bazarının genişləndirilməsi və dəstəklənməsi istiqamətində dövlət tədbirlərinin və proqramlarının saysız-hesabsız ölçülərini hərtərəfli araşdırıb. Siyasət çərçivələrinin, infrastrukturun inkişafının, iqtisadi təsirlərin, marketinq strategiyalarının, davamlılıq təcrübələrinin və ictimaiyyətin cəlb edilməsinin araşdırılması nəticəsində aydın olur ki, dövlətin rolu güclü daxili turizm sektorunun inkişaf etdirilməsində həm əsas, həm də çoxşaxəlidir. Daxili turizmin iqtisadi əhəmiyyəti, xüsusilə ÜDM-ə və məşğulluğun yaradılmasına verdiyi töhfə onun iqtisadi inkişafın əsas hərəkətverici qüvvəsi rolunu vurğulayır.

Bununla belə, bu tədqiqat həm də iqtisadi məqsədlərin ətraf mühitin davamlılığı və mədəni mühafizə ilə balanslaşdırılmasının vacibliyini vurğulayır. Dövlətin ekoloji təmiz turizm təcrübələrinin təşviqi və mədəni irsin qorunması sahəsində səyləri təkcə təqdirəlayiq deyil, həm də turizm sənayesinin uzunmüddətli həyat qabiliyyəti üçün vacibdir.

Marketinq və tanıtım strategiyalarının təhlili yerli turistlərin cəlb edilməsində rəqəmsal platformaların və innovativ brendinqin artan əhəmiyyətini ortaya qoyur. Uğurlu daxili turizmin əsl mahiyyəti həm yerli əhali, həm də ziyarətçilər arasında rezonans doğuran orijinal, əhatəli və müxtəlif təcrübələrin yaradılmasındadır. İcmanın iştirakı daxili turizm təşəbbüslərinin uğurunda mühüm amil kimi ortaya çıxdı. Yerli icmaların cəlb edilməsi təkcə turizm faydalarının ədalətli bölüşdürülməsini təmin etmir, həm də orijinal mədəniyyət mübadiləsi vasitəsilə turizm təcrübəsini zənginləşdirir.

Tədqiqat bazarın doyması, ətraf mühitlə bağlı narahatlıqlar və qlobal böhranlar qarşısında adaptiv strategiyalara ehtiyac da daxil olmaqla bir neçə problemi müəyyən edir. Problemlərin həlli davamlı innovasiya, strateji planlaşdırma və yaranan tendensiyaları və imkanları qəbul etmək istəyi tələb edir. Tədqiqat daxili turizmin mürəkkəbliyi və dinamikası və onun formalaşmasında dövlət tədbirlərinin həlledici rolu haqqında dəyərli fikirlər verir. Təklif olunan tövsiyələr davamlı, inklüziv və dinamik daxili turizm bazarını təşviq etmək istiqamətində siyasətçiləri, sənayedə maraqlı

tərəfləri və icmaları istiqamətləndirmək məqsədi daşıyır. Daxili turizmin gələcəyi təkcə iqtisadiyyata deyil, həm də ölkənin sosial və ekoloji quruluşuna fayda verən əməkdaşlıq, innovativ və məsuliyyətli yanaşmadadır.

## Ədəbiyyat

1. Anderson, J., Chen, L. (2021). Daxili Turizmin İqtisadi Təsiri. New York: Tourism Insights Publishing.
2. Beyker, M. (2022). Turizmdə Rəqəmsal Marketinq Strategiyaları. London: Travel Industry Press.
3. Collins, R. (2020). Davamlı Turizm: Təcrübələr və Perspektivlər. Oksford: Yaşıl Səyahət Mətbuatı.
4. Davis, E., Kumar, S. (2019). Turizmin İnkişafında İcmanın İştirakı. Sidney: Qlobal Turizm Araşdırması.
5. Johnson, P., Garcia, T. (2023). Turizm Siyasəti və Planlaşdırılması. Boston: Akademik Səyahət Mətbuatı.
6. Martin, S. (2018). Mədəni Qoruma və Turizm. Barselona: İrs Turizm Nəşrləri.
7. Patel, R. (2022). Turizm İnfrastrukturu: Çətinliklər və İmkanlar. Sinqapur: Asiya Sakit Okean Turizm Mətbuatı.
8. Tompson, A., Robertson, D. (2020). Böhran Zamanlarında Turizm: Adaptiv Strategiyalar. Dublin: Turizm Serialında Böhranların İdarə Edilməsi.
9. Williams, H. (2021). İnklüziv Turizm: Qlobal Perspektiv. Toronto: Səyahət Mətbuatında Müxtəliflik.
10. Zhang, Y., Nguyen, L. (2024). Daxili Turizmdə Yaranan Trendlər. Şanxay: Şərq-Qərb Səyahət Araşdırmaları.
11. Brown, J., Smith, A. (2020). Economic Impacts of Domestic Tourism: A Comparative Analysis. New York: Springer Nature.
12. Chen, L. (2019). Sustainable Practices in Domestic Tourism. London: Routledge.
13. Davis, R., Hernandez, K. (2021). Digital Innovation in Tourism: Enhancing Domestic Travel. Amsterdam: Elsevier.
14. Evans, M., Patel, D. (2018). Tourism Policy and Planning for Economic Recovery. Oxford: Oxford University Press.
15. Garcia, S., Liu, C. (2022). Health and Safety Protocols in Tourism: Lessons from the COVID-19 Pandemic. Cambridge: Cambridge University Press.

Göndərilib: 04.01.2024 Qəbul edilib: 18.03.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/220-226

**Gülsu Əsədli**
Milli Aviasiya Akademiyası
magistrant
gasadli2001@gmail.com

# KONSTİTUSİYAYA DÜZƏLİŞLƏR EDİLMƏSİNDƏ REFERENDUMUN ROLU

**Xülasə**

Xalqın suveren hüququnun həyata keçirilməsinin üsullarından biri kimi referendum institutu həmişə hüquqi tədqiqatların obyekti olmuşdur. Bu institutun konstitusiyaya düzəlişlərin edilməsində əhəmiyyətinin tədqiq edilməsinə hər zaman ehtiyac duyulur.

Hazırkı məqalədə referendumun anlayışı verilmiş, bu anlayışın etimoloji təhlili verilmiş, inkişaf tarixi nəzərdən keçirilmiş, bu institutun konstitusiyalara düzəlişlərin edilməsində rolu araşdırılmış və müxtəlif qanunvericilik aktları əsasında təhlil edilmişdir.

***Açar sözlər:*** *referendum, konstitusiya, ümumxalq səsverməsi, demokratiya, xalqın iradəsi*

**Gulsu Asadli**
National Aviation Academy
master student
gasadli2001@gmail.com

## Role of referendum in constitutional amendments

**Abstract**

As one of the methods of exercising the sovereign right of the people, the institution of referendum has always been the object of legal studies. There is always a need to study the importance of this institution in constitutional amendments.

In this article, the concept of referendum is given, etymological analysis of this concept is given, the history of development is reviewed, the role of this institution in making amendments to the constitutions is investigated and it is analyzed on the basis of various legislative acts.

***Keywords:*** *referendum, constitution, popular vote, democracy, will of the people*

## Giriş

Referendum latınca “referee” sözündən götürülüb, mənası “xəbər verilməli olan” deməkdir (Straşun, 2007: 493). Hüquq ensiklopediyasında referenduma “ən mühüm dövlət məsələlərinin ümumxalq səsverməsinə çıxarılması” kimi anlayış verilir (Quliyev, 2007: 881).

Bəzi ədəbiyyatlarda referendumun “öz suveren hüququnu həyata keçirən xalqın səsverməyə qoyulan məsələlər haqqında qəbul etmək və ya rədd etmək barədə münasibətlərini bildirməsini təmin edən birbaşa demokratiyanın təzahür forması” kimi tərifinə rast gəlinir (Solak, 2013: 58). Referendumda xalqın iradəsi birbaşa təzahür edir. Burada artıq xalqın seçdiyi və onun iradəsini təhrif edə biləcək şəxslər yoxdur (Əsgərov, 2011: 342).

Seçkili orqanların formalaşdırılması yolu ilə xalqa dövlət hakimiyyətinin həyata keçirilməsində iştirak etmək imkanı verən nümayəndəli demokratiyadan fərqli olaraq, birbaşa demokratiya bilavasitə xalq hakimiyyəti kimi çıxış edir və dövlətin idarə olunmasında xalqın təşəbbüsünü, özfəaliyyətini, dövlət qərarlarının qəbul edilməsində onun birbaşa iradəsini ifadə edir. Referendum institutu da xalqın öz iradəsini ifadə etmə forması olaraq birbaşa demokratiyanın təzahürüdür.

Hüquq ədəbiyyatlarında referendumla yanaşı plebisit anlayışından da istifadə edilir. Plebisit, latınca “plebiscitum” sözündən olub, mənası xalqın, plebisin qərarı olmaqla seçicilərin səsverməsidir (Çirkin, 2007: 289). Straşuna görə, hüquqi nöqteyi-nəzərdən referendum ilə plebisit arasında fərq yoxdur-onlar sinonimdirlər. Ancaq stilistik fərqlər var, plebisit o məsələlər üzrə

referenduma deyilir ki, onlar region və ölkə üçün taleyüklü əhəmiyyət daşıyır. Məsələn, seçicilərin səsverməsi ilə idarəetmə forması haqqında, mövcud rejimin davam etməsi haqqında, ölkə liderinə etimad haqqında məsələlər həll olunursa, bir çox hallarda referendum rəsmi və ya qeyri-rəsmi olaraq plebisit adlandırılır (Straşun, 2007: 493). Bəzi ölkələrin qanunvericiliyində plebisit referendumla eyni mənaya gələn termin kimi istifadə edilir.

Bəlli bir müddətdə faktiki olaraq iqtidarı əlində saxlayan şəxslərin hazırladıqları konstitusiya layihəsini müzakirə edilməsi üçün heç bir imkan yaratmadan "bəli" və ya "xeyr" ilə nəticələnə biləcək bir xalq səsverməsinə təqdim etmələri plebisitdir. Referendumda mətnə, plebisitdə isə şəxs və həmin şəxsin siyasətinə səs verilir (Solak, 2013: 66). Hazırlanan konstitusiya layihəsi "məhdud azadlıq şəraitində" səsverməyə çıxarılır, layihə üzərində hər hansı, xüsusilə də tənqidi müzakirələrə yol verilmir, xalq təzyiq altında saxlanılır. Plebisitə misal olaraq, 1799-cu ildə Napaleon Bonapartın xalqa qəbul etdirdiyi konstitusiyanı göstərmək olar. Bonapart özünə qarşı olduqca "hörmətli və sadiq" davranan bir komissiya tərəfindən hazırlanan konstitusiyanı, onunla bağlı hər hansı mübahisə və müzakirə aparılmasına imkan yaratmadan xalq səsverməsinə çıxarmışdı. Bu səbəbdən bu tip konstitusiya quruluşuna "Bonapartist Konstitusiyaçılıq" deyilir (Gözlər, 2017). Bu mənada plebisit totalitar və avtoritarların əllərində vasitəyə çevirdikləri antidemokratik ümumxalq səsverməsidir.

Həmçinin, ədəbiyyatlarda referendumla yanaşı bəzən "ümumxalq rəy sorğusu" ifadəsindən də istifadə edilir. Sovet konstitusiyalarında bu anlayışlar bərabərləşdirilirdi. Belə ki, 1937-ci il Azərbaycan SSR Konstitusiyasının 33-cü maddəsinin "г" bəndində yazılmışdır ki, Azərbaycan SSR Ali Sovetinin Rəyasət Heyəti "ümumxalq sorğusunu (referendumu) keçirir" Azərbaycan Sovet Sosialist Respublikasının Konstitusiyası (əsas qanunu), 1965: 10). Konstitusiyanın mətnindən göründüyü kimi, burada referendum tamamilə ümumxalq sorğusuna bərabər tutulur. Lakin belə bərabərləşdirməylə bir çox nüfuzlu alimlər razılaşmırlar. Çirkin qeyd edir ki, ümumxalq sorğusu bütün ölkə əhalisinin rəyini aşkara çıxarmağı nəzərdə tutur. Lakin bu həmişə səsvermə yolu ilə həyata keçirilmir. Sorğu bu və ya digər ictimai təşkilat və ya mətbuat tərəfindən də keçirilə bilər. Əgər belə sorğu dövlət orqanları tərəfindən keçirilirsə, o hüquqla təzim olunur və konstitusiya-hüquq institutu sayılır (Çirkin, 2007: 290). Ümumxalq sorğusunun ümumxalq səsverməsi deyil, seçicilərin baxışlarının aşkar edilməsi, onlarla məsləhətləşmə olması kimi xüsusiyyətlər onu referendumdan fərqləndirir.

Referendumlar müxtəlif məqsədlərlə keçirilir ki, bunlardan biri də konstitusiyalara düzəliş edilməsidir. İctimai həyatda baş verən dəyişikliklərlə, siyasi qüvvələr nisbətinin dəyişməsi ilə əlaqədar hər bir Konstitusiya dəyişdirilə bilər, bəzən isə mütləq dəyişdirilməlidir (Straşun, 2001: 76). İnsan hüquq və azadlıqlarının təminatını, vətəndaş cəmiyyətinin təkamülünü, habelə dövlətin idarəçilik mexanizmlərinin səmərəli fəaliyyətini tənzimləyən qanunların dövrün tələblərinə uyğun müasirləşdirilməsi inkişaf etmiş ölkələrdə zəruri səciyyə daşıyır. Konstitusiyaların, xüsusən uzun müddətdir fəaliyyət göstərən konstitusiyaların dəyişməsinə səbəb bəzən onların xeyli dəyişdirilmiş tarixi şəraitə uyğunlaşmasına olan ehtiyacdır. Belə dəyişikliklərin məqsədi isə bir qayda olaraq, mövcud hüquq qaydasının əsaslı şəkildə pozulması deyil, daha çox konstitusiya aktının cari vəziyyətin tələbatlarına uyğunlaşdırılmasıdır. Konstitusiya ilə tənzimlənən münasibətlərin nisbi sabitliyinə baxmayaraq, konstitusiya dəyişdirilə bilməzsə, daima dəyişən və inkişaf edən cəmiyyətin arzu və istəklərinə cavab verməsi mümkün deyildir.

Konstitusiyaya düzəlişlər müxtəlif qanunvericiliklərdə fərqli terminlə ifadə olunur və bu terminlərin ifadə etdiyin mənanın "əhatə dairəsi" ilə bağlı fikirlər ədəbiyyatlarda mübahisəli məsələlərdən biridir. Məsələn, Fransa Konstitusiyasında bu "revision", İspaniya Konstitusiyasında "reforma", Almaniyanın Konstitusiyasında "anderug" terminləri ilə ifadə edilir. Bəzi ölkələrdə bu terminlər təkcə konstitusiyanın bir neçə müddəasında düzəliş edilməsini deyil, həm də konstitusiyanın bütünlükdə dəyişdirilməsi mənasını verir (Roznai, 2014: 129).

Konstitusiyalar tam və qismən dəyişdirilə, yəni onlara tam və qismən yenidən baxıla bilər. Tam yenidən baxılma konstitusiyanın tamamilə yeni redaksiyada qəbulunu nəzərdə tutur ki, bu cür yenidən baxma yalnız siyasi qüvvələr nisbətində dövlətin yeniləşməsini tələb edən əhəmiyyətli dəyişikliklər baş verməsi halında məqbul sayıla bilər. Buna görə də, konstitusiyaya tamamilə

yenidən baxılması üçün ayrı-ayrı düzəlişlərlə müqayisədə daha sərt şərtlər tələb olunur (Straşun, 2007: 79). Avropa ölkələrinə nəzər saldıqda, konstitusiyaya tamamilə yenidən baxılmasının qayda və şərtlərini nəzərdə tutan konstitusiyalara rast gəlmək mümkündür. İsveçrə və İspaniyanın konstitusiyalarını buna misal göstərmək olar. İsveçrə Konstitusiyasında konstitusiyaya tam yenidən baxılması məsələsi müfəssəl tənzimlənmişdir. Konstitusiyaya əsasən, İsveçrə Konstitusiyasına tam və ya qismən yenidən baxıla bilər. Federal Parlamentin palatalarından biri tam yenidən baxış barədə təklif irəli sürərsə, digər palata isə onunla razılaşmazsa və ya tam yenidən baxışıla bağlı təklifi 100 000 seçici irəli sürərsə, bu halda yenidən baxışın olub-olmaması barədə məsələ İsveçrə xalqının səsverməsinə çıxarılır. Səs verən seçicilərin əksəriyyətinin müsbət cavab verdiyi halda, konstitusiyaya tam şəkildə yenidən baxış keçirilməsi üçün Parlamentin hər iki palatası yenidən seçilməlidir. Konstitusiyaya həm tam, həm də qismən yenidən baxılması – yəni, düzəlişlərin həyata keçirilməsi yalnız referendum vasitəsilə mümkündür (Straşun, 2007: 496).

Konstitusiyaya qismən yenidən baxılması dedikdə isə konstitusiyanın konseptual əsasını təşkil edən müddəalar məcmusuna toxunmadan, ona bu və ya digər maddənin əlavə edilməsi, onların çıxarılması və ya mövcud müddəaların dəyişdirilməsi başa düşülür.

Schaffner də daxil olmaqla bir qrup müəlliflər isə hesab edir ki, ümumiyyətlə düzəliş termini konstitusiyanın dəyişdirilməsini nəzərdə tutur, lakin o özündə yeni bir konstitusiya kimi qəbul ediləcək dərəcədə radikal bir dəyişkliyi ehtiva etməməlidir. Çünki “düzəliş” termini özü müəyyən məhdudiyyətlərlə çərçivələnir, o nəyisə “məhv etmək” deyil, “dəyişdirmək” gücünə malikdir (Schaffner, 2005: 1494). Bu müəlliflər düzəliş mənasını ifadə edən terminlərin geniş deyil, dar mənada başa düşülməli olduğu və konstitusiyaya tam şəkildə deyil, yalnız qismən yenidən baxılmasını ehtiva etdiyi qənaətindədirlər. Hesab edirik ki, düzəliş terminin leksik şərhindən hüquqi nəticələr çıxarmaq çətindir. Buna görə də, bu terminə hər bir ölkənin öz qanunvericiliyi və onun praktiki tətbiqi aspektindən yanaşılmalıdır.

Konstitusiyalar onların dəyişdirilməsinin mürəkkəblik dərəcəsindən asılı olaraq çevik və sərt konstitusiyalara bölünür. Çevik konstitusiyalara dəyişikliklər adi qanunların qəbul edilməsi yolu ilə edilsə də, sərt konstitusiyalara düzəlişlər edilməsi daha mürəkkəb qaydada həyata keçirilir. Konstitusiyanın sərt olması onun sabitliyini qorumaq məqsədi daşıyır. Bu isə öz növbəsində konstitusiyanın nüfuzunun güclənməsinə və konstitusiya quruluşunun nisbi sabitliyinə şərait yaradır. Straşun sərt konstitusiyaları sərt və xüsusilə sərt olmaqla iki hissəyə ayırır ki, düzəlişlərin referendumla edildiyi konstitusiyaları xüsusilə sərt konstitusiyalara aid edir (Straşun, 2007: 109).

Demək olar ki, əksər dövlətlərin konstitusiyalarında ona bu və ya digər formada düzəlişlər edilməsi imkanı nəzərdə tutulmuşdur. Təbii ki, referendum konstitusiyaya düzəlişlər edilməsinin yeganə vasitəsi deyil və müxtəlif ölkələrdə konstitusiyaya düzəlişlər üçün fərqli mexanizmlər tətbiq edilir. Məsələn, geniş tətbiq edilən formalardan biri konstitusion düzəlişlərin parlament tərəfindən həyata keçirilməsidir. Konstitusion düzəlişlərə dair təşəbbüsün həyata keçirilməsi ilə düzəlişlərə dair layihənin parlamentdə ilk oxunuşu arasındakı müddətlərdən, düzəlişlərin bir neçə dəfə oxunuşdan keçirilməsi, parlamentdə konstitusion düzəlişlərin edilməsi üçün tələb olunan səs çoxluğu və s. hallardan asılı olaraq ayrı-ayrı ölkələrdə fərqli qaydalar tətbiq edilir (European Commission For Democracy Through Law (Venice Commission), 2018: 8). Bir qayda olaraq konstitusion düzəlişlər üçün parlamentdə adi qanunların qəbuluna nisbətdə daha yüksək səs çoxluğu tələb olunur. Parlamentdə konstitusion düzəlişlərin edilməsi üçün mütləq səs çoxluğundan (50%+1) tutmuş parlament üzvlərinin 3/5-nə qədər dəyişən müxtəlif tələblərə rast gəlmək mümkündür. Səs çoxluğunun yuxarı hədlərdə müəyyən edilməsində əsas prinsip ondan ibarətdir ki, bu asanlıqla düzəliş edilməsinin qarşısını almaqla yanaşı mövcud hökuməti düzəlişlərin edilməsi üçün müxalifət və digər partiyalarla danışıqlar aparmaq məcburiyyətində qoyur (Bockenforde, 2017: 6).

İkipalatalı parlamentlərin mövcud olduğu ölkələrdə müəyyən istisnaları nəzərə alınmaqla, bir qayda olaraq hər iki palatanın təsdiqi tələb olunur. İkipalatalı parlamentlərdə konstitusion düzəlişlərin səsə qoyulması zamanı tələb olunan səs çoxluğu dəyişir. Hər iki palatanın üzvlərinin mütləq səs çoxluğu (məsələn, İsveçrə), parlamentin hər iki palatasında 2/3 səs çoxluğu (məsələn, İtaliya), yuxarı palatada mütləq səs çoxluğu, aşağı palatada 2/3 səs çoxluğu (məsələn, İspaniya) və

s. buna misal göstərmək olar (European Commission For Democracy Through Law (Venice Commission), 2009: 10).

Federativ, həmçinin mərkəzləşdirilməmiş quruluşa malik olan bir çox ölkələrdə dövlətlərin siyasi-ərazi quruluş forması konstitusiyaya dəyişikliklərə təsir etməklə federasiya subyektlərinin, həmçinin nisbi müstəqilliyə malik subyektlərin bu prosesdə iştirakı ilə nəticələnir. Belə hallarda ştatların və ya əyalətlərin qanunverici orqanları tərəfindən təsdiq edilmə, federasiya subyektlərinin hər birində referendumun keçirilməsi kimi yollarla onların razılığı ifadə olunur. Məsələn, Amerika Birləşmiş Ştatlarının Kontitusiyasına dəyişikliklərin təsdiq edilməsi Konqresin seçimi ilə ştatların qanunverici orqanlarının 2/3-si tərəfindən və ya ştatların konstitusiya qurultaylarının 2/3 –si tərəfindən həyata keçirilir. İndiyə qədər ABŞ konstitusiyasına Konqres tərəfindən təklif edilən düzəlişlərdən yalnız biri, 21-ci düzəliş təsdiqlənməsi üçün ştat qurultaylarına yönəldilmiş, digərləri isə hər bir ştatın qanunverici orqanı tərəfindən təsdiq olunması üçün təqdim edilmişdir (Gehring, 2016: 9).

Həm parlament tərəfindən, həm də referendum vasitəsilə düzəlişlər edilməsinin mümkünlüyünü nəzədə tutan forma da konstitusiyaya dəyişiliklərin üsullarından biridir. Bəzi ölkələrdə isə konstitusiyaya referendum yolu ilə dəyişiklik qadağan edilmişdir. Məsələn, Portuqaliya Respublikasının qüvvədə olan konstitusiyasının 115-ci maddəsinin 4-cü hissəsinin a) bəndinə əsasən, konstitusiyaya düzəlişlər barəsində referendum keçirilməsi istisna olunan hallar sırasındadır (16).

Bundan başqa konstitusiyaya düzəlişlərin rəsmi vasitələrindən başqa, “qeyri-rəsmi” vasitələri də mövcuddur. Konstitusiya nəzarəti sisteminin mövcud olduğu ölkələrdə konstitusiya müddəalarının və konepsiyalarının məzmun və mənasının konstitusiyanın şərhi yolu ilə dəyişdirilməsini buna misal göstərmək olar. Bu qeyri-rəsmi dəyişiklik üsulu konstitusiyaya rəsmi dəyişiklik edilməsi prosedrunun xüsusilə mürəkkəb olduğu ölkələr üçün xarakterikdir. Məsələn, dəyişiklik prosedurunun olduqca sərt olması səbəbindən ABŞ Konstitusiyasına 232 il ərzində cəmi 27 düzəliş edilə bilmişdir. Bununla yanaşı konstitusiyanın dəyişən sosial, mədəni və siyasi tendensiyalara uyğunlaşdırılması məqsədilə ABŞ Ali Məhkəməsi tərəfindən konstitusiyanın və onun müddəalarının təfsiri nəticəsində konstitusiyanın əsas mətni dəyişdirilmiş və ya mövcud vəziyyətə uyğunlaşdırılmışdır (17).

Göründüyü kimi konstitusiyaya düzəlişlər edilməsi üçün kifayət qədər rəngarəng və müxtəlif mürəkkəbliyə malik mexanizmlər mövcuddur. Digər mexanizmlərin təfərrüatına varmadan konstitusiyaya düzəlişlər edilməsinin vasitələrindən biri kimi referendumla bağlı məsələlərə qayıtmağı məqsədəmüvafiq hesab edirik.

Konstitusiyaya düzəlişlərin referendum yolu ilə edilməsi bir sıra dövlətlərin qanunvericiliyində öz əksini tapmışdır. Konstitusiyanın qəbul edilməsi, həmçinin ona dəyişiklik və əlavələr edilməsi haqqında məsələlərin həll olunduğu referenduma **konstitusion referendum** deyilir (Solak, 2011: 5).

Referendumun keçirilməsi hər bir dövlətdə dəqiq tənzimlənir. Çünki referendum xalqın iradəsini aşkarlamağa imkan verən bir mexanizmdir və xalqın iradəsinin təhrif edilməsi, yaxud ondan sui-istifadə edilməsi cəmiyyət və dövlət üçün ağır nəticələr verə bilər (Əsgərov, 2011: 342).

Referendum xalqın iradəsinin aşkarlanmağına xidmət etdiyindən, referendumda iştirak etmək hüququ olan şəxslərin konstitusiya düzəlişləri ilə bağlı referendumda hansı nisbətdə iştirakı da önəmli məsələlərdən biridir. Çünki referendum vasitəsilə bəzən çoxluğun deyil, azlığın iradəsi müəyyən oluna bilər. Məsələn, 2001-ci ildə Botsvanada səsvermə hüququ olan şəxslərin 5%-dən daha azının iştirak etdiyi referendumla bir neçə konstitusiya dəyişikliyi təsdiq edilmişdir Əsgərov, 2011: 9). Bunun qarşısını almaq üçün bəzi ölkələrin referenduma dair qanunvericiliyində seçici fəallığı ilə bağlı xüsusi tələblər müəyyən edilir. Sloveniya Konstitusiyasının 170-ci maddəsinə əsasən, konstitusiya düzəlişləri yalnız seçicilərin mütləq əksəriyyətinin (yəni, 50%-dən çoxunun) iştirak etməsi halında mütləq səs çoxluğu (50%+1) ilə həyata keçirilə bilər (Solak, 2011: 42). Həmçinin, Koreya Respublikası Konstitusiyasının 130-cu maddəsinin 2-ci hissəsinə görə referenduma təqdim olunmuş konstitusiyaya dəyişikliklər edilməsi ilə bağlı təkliflər yalnız

səsvermə hüququ olan seçicilərin yarısından çoxu səs verdikdə-yəni, səsvermədə iştirak etdikdə və verilmiş səslərin yarısından çoxunun təkliflərin leyhinə olduğu halda dəiyşikliklər təsdiqlənir (European Commission For Democracy Through Law (Venice Commission), 2008: 7).

Konstitusiyaya düzəlişlərin edilməsi vasitəsi kimi referendum xüsusilə konstitusiyanın özünün referendumla qəbul edildiyi ölkələr üçün xarakterikdir. Xalqın qəbul etdiyi konstitusiya dövlətin hüquqi və siyasi təməli hesab edilərək, öz legitimliyini xalqdan alır. Xalq yalnız dövri seçkilər yolu ilə öz suveren hüququnu həyata keçirirsə və öz qəbul etdiyi konstitusiyaya düzəliş edə bilmirsə, bu zaman demokratiya natamam qalır.

Bəzi müəlliflər referendumun əhəmiyyətini həddən artıq qabardırlar. E.Olivierə görə, "ümumxalq səsverməsi olmadan xalqın suverenliyi uydurmadan başqa bir şey deyil... Suverenlik yalnızca dörd beş ildən bir sandığa atılan bir seçki bülleteni ilə həyata keçirilə bilməz...Bir seçki günündən digər seçki gününə qədər xalq suverenliyi yuxuda olur. Referendum isə onu həmişə oyaq saxlayır" (Gözlər, 1988: 100). Referendum da daxil olmaqla birbaşa demokratiyanın əsas üstünlükləri kimi bir qayda olaraq aşağıdaki arqumentlər irəli sürülür: xalqın dövlətin və cəmiyyətin taleyini həll etdiyini hiss etməsi və onun bu istiqamətdə məsuliyyətinin artırılması; vətəndaşların daha çox siyasətə cəlb edilməsinə və iştirakına imkan yaratması; (Svensson, 2007: 4) xalqın ictimai əhəmiyyətli məsələlər barədə düşünməyə vadar edilməsi; onların vətənpərvərlik duyğularının inkişaf etdirilməsi (Gözlər, 1988: 100) və s.

Referendumun üstün cəhətlərindən biri də ondan ibarətdir ki, düzəlişin, yəni hər hansı əlavə və dəyişikliyin edilməsinin mürəkkəb mexanizmləri sırasına daxil olan referendum konstitusiyanı elastiklikdən-asanlıqla dəyişdiriləbilmə imkanından məhrum edir. Məhz konstitusiya ölkənin əsas və ali hüquqi qüvvəyə malik aktı olduğundan, onu hakimiyyətə gələn siyasi qüvvələrin sui-istifadəsindən qorumaq üçün konstitusiyaya düzəlişlər edilməsinin xüsusi mürəkkəb prosedurları müəyyənləşdirilir.

Referendumun əleyhdarları isə əks arqumentlər irəli sürərək qeyd edirlər ki, referendumlarda adi vətəndaşlar mürəkkəb münasibətləri tənzimləyən qanunları və ya normaları düzgün qiymətləndirə bilmir, onlar barəsində lazımi bilgiyə və məlumata sahib olmurlar. Buna görə də onların qənaətləri çox zaman obyektiv deyil, subyektiv və birtərəfli mühakimələrə əsaslanır (Bulmer, 2017: 10). M.V.Balqay qeyd edir ki, referendumun keçirilməsinin səbəblərindən biri dövlət hakimiyyət orqanlarının məsuliyyətini daşımağa cəsarət etmədiklərin bəzi məsələləri xalqın təsdiqinə buraxmaqdır (Baglay, 2007: 435).

Nəzərə alınmalıdır ki, referendum hər nə qədər hüquqi institut olsa da, referendumla həll edilən məsələlər və qəbul edilən qərarlar bir çox hallarda siyasi qərarlar olur. Konstitusiyaya düzəlişin üsulu kimi sərtlik və çeviklik arasında tarazlığı təmin edəcək bir formul irəli sürmək çətindir. Çünki, seçki sistemindən və əhəmiyyətli siyasi partiyaların sayından asılı olaraq, müəyyən bir üstünlük və ya səsçoxluğu ilə bağlı tələbi ödəmək bir dövlətdə xeyli çətin olduğu halda, eyni tələblər başqa bir dövlətdə konstitusiyaya düzəliş etmək üçün maneə yaratmaya bilər. Buna görə də, konstitusiyanın həqiqi sərtliyini və çevikliyini müəyyən edən əsas amil onu əhatə edən siysi mədəniyyətdir (Bockenforde, 2017: 21).

Hesab edirik ki, konstitusiyaya düzəlişlərin üsulu kimi referendum və ayrı-ayrı ölkələrin qanunvericiliyi ilə müəyənləşdirilən dəyişiklik edilməsinin başqa üsullarının birinin digərinə münasibətdə əhəmiyyətinin şişirdilməsi, onların sırf nəzəri baxımdan demokratik və anti-demokratik olaraq qruplaşdırılması düzgün olmazdı. Belə ki, hər bir dövlətin öz qanunvericiliyi ilə tənzimlənən konstitusiya düzəlişlərinin həyata keçirilmə formaları həmin dövlətin siyasi sistemindən, ərazi quruluşundan, idarəetmə formasından, siyasi mədəniyyətindən, siyasi şəraitdən, ölkənin tarixindən və s. amillərdən asılı olaraq müəyyən edilmişdir. Məsələn, federativ dövlət quruluşuna malik bir çox ölkələrdə - Amerika Birləşmiş Ştatları, Almaniya kimi dövlətlərin konstitusiyasında konstitusiyaya dəyişiklik edilməsi zamanı referendumun tətbiqi nəzərdə tutulmamışdır (Solak, 2011: 7). Əlbəttə ki, bu həmin ölkələrdə baş vermiş konstitusion düzəlişlərin qeyri-demokratik yolla həyata keçirilməsi demək deyil.

## Nəticə

Beləliklə, konstitusiya düzəlişlərinin referendumla yanaşı alternativ vasitələrinin olması və ya konstitusiyanın qəbulu və düzəlişi zamanı referendum keçirilməməsi həmin dövlətin anti-demokratik olması anlamına gəlmir. Eyni zamanda bunun əksi də doğrudur, yəni bir dövlətdə konstitusiya düzəlişlərinin referendum yolu ilə edilməsi öz-özlüyündə həmin dövlətin demokratik hesab edilməsinə əsas vermir. Çünki, bəzi hallarda referendum yalnız bu və ya digər dövlətin totalitar cizgilərini gizlətmək üçün pərdədir. Buna görə də, hesab edirik ki, hər bir dövlətdə özünəməxsus amillərdən asılı olaraq konstitusiyaya düzəlişlərin bu və ya digər üsulunun tətbiqi məqbul hesab oluna bilər.

## Ədəbiyyat

1. Straşun, B.A. (2007). Xarici ölkələrin konstitusiya (dövlət) hüququ. 4 cilddə, I-II cildlər. Bakı: Qanun, 728 s.
2. Quliyev, A.İ. (2007). Hüquq ensiklopediyası. Bakı: Qanun, 1108 s.
3. Solak, M. (2013). TBMM Araşdırma: Birbaşa Demokratiya Aləti kimi Referendum. Demokratiya və Siyasi İştirak üzrə Beynəlxalq Konfransın Materialları. İstanbul, s.58-67.
4. Əsgərov, Z.A. (2011). Konstitusiya hüququ. Dərslik. Bakı: Bakı Universiteti, 760 s.
5. Çirkin, V.Y. (2007). Xarici ölkələrin konstitusiya hüququ (ruscadan tərcümə). Bakı: Digesta, 720 s.
6. Straşun, B.A. (2007). Xarici ölkələrin konstitusiya (dövlət) hüququ. Dərslik, 4 cilddə, III cild, Xüsusi hissə. Bakı: Qanun, 883 s.
7. Gözlər, K. (2017). "Referendum, yoxsa Plebissit?", 19 s. URL: http://www.anayasa.gen.tr/plebisit.pdf
8. Azərbaycan Sovet Sosialist Respublikasının Konstitusiyası (əsas qanunu). (1965). Bakı: Azərbaycan Dövlət Nəşriyyatı, 29 s.
9. Straşun, B.A. (2001). Xarici ölkələrin konstitusiya (dövlət) hüququ. Ümumi hissə: Konstitusiya (dövlət) hüququ və onun əsas institutları. I cild. Bakı: ABU, 383 s.
10. Roznai, Y. (2014). Unconstitutional Constitutional Amendments: A Study of the Nature and Limits of Constitutional Amendment Powers: for the degree of Doctor of Philosophy. London, 363 p.
11. Schaffner, J. (2005). "The Federal Marriage Amendment: To Protect the Sanctity of Marriage or Destroy Constitutional Democracy?" American University Law Review 54, № 5, pp.1487-1536. URL: http://digitalcommons.wcl.american.edu/aulr/vol54/iss6/1
12. European Commission For Democracy Through Law (Venice Commission). (2018). Code of Good Practice on Referendums. Contributions by Mr Pieter van DİJK,Mr François Luchaire , Mr Giorgio Malinverni. Strasbourg, 24 p.
13. Bockenforde, M. (2017). Constitutional Amendment Procedures (International IDEA Constitution-Building Primer 10), Sweden, 32 p. URL:https://www.idea.int/sites/default/files/publications/constitutional-amendment-procedures-primer.pdf
14. European Commission For Democracy Through Law (Venice Commission). (2009). Final Draft Report on Constitutional Amendment Procedures. Strasbourg, 47 p.
15. Gehring, M. (2016). United States Constitutional Amendment Process, Legal Principles for State Legislators. Research Department Minnesota House of Representatives, 57 p.
16. Constitutional Changes by other means. URL: http://www.milforded.org/uploaded/faculty/aiacono/civics/chapter_3_l2/text_3.3.pdf
17. Portugal's Constitution of 1976 with Amendments through 2005. URL: https://www.constituteproject.org/constitution/Portugal_2005.pdf
18. Solak, M. (2011). Ölkə Konstitusiyalarında Referendum.TBMM Araşdırma Mərkəzi, 43 s.
19. European Commission For Democracy Through Law (Venice Commission). (2008). Constitutional Provisions for Amending the Constitution. Strasbourg, 19 p.

20. Gözlər, K. (1988). “Referendumun dəyəri”. Ankara Universiteti Hüquq Fakültəsi Jurnalı, Cild XL, Sayı 1-4, s.97-113.
21. Svensson, P. (2007). Direct and Representative Democracy - Supplementing, not Excluding Each Other. Paper to be presented at the ECPR Joint Sessions. Helsinki, 7-12 May, Workshop, № 18, 31 p.
22. Bulmer, E. (2017). Direct Democracy. International IDEA Constitution-Building Primer 3, Sweden, 33 p.
23. Baglay, M.V. (2007). Konstitutsionnoye pravo Rossiyskoy Federatsii : ucheb. B14 dlya vuzov /6-ye izd., izm. i dop. M.: Norma, 784 s.

Göndərilib: 09.02.2024 Qəbul edilib: 31.03.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/227-233

**Səmənnaz Yusifli**
Milli Aviasiya Akademiyası
magistrant
semennazyusifli2000@gmail.com

# BƏLƏDİYYƏLƏRİN YERLİ ƏHALİYƏ GÖSTƏRDİYİ XİDMƏTLƏRİN ƏHƏMİYYƏTİ

**Xülasə**

Bu məqalədə bələdiyyənin anlayışı və əsas xüsusiyyətləri, yerli əhaliyə göstərdiyi xidmətlər və onların keyfiyyət səviyyəsi araşdırılmışdır. Araşdırmada əhalinin bələdiyyələr tərəfindən təklif olunan yerli özünüidarəetmə xidmətlərini necə qəbul etdiyini və xidmət keyfiyyətindən məmnunluq səviyyəsini müəyyən edən əsas amillər tədqiq olunmuşdur.

Həmçinin yerli özünüidarəetmə orqanlarının göstərdiyi xidmətlərlə əlaqədar ədəbiyyatda ən çox istifadə olunan xidmət keyfiyyəti ölçüləri barədə məlumat verilmişdir. Bu məqalədə Azərbaycan Respublikasında yerli özünüidarəetmənin inkişafı üçün görlə biləcək işlər haqqında təkliflər irəli sürülmüşdür. Əsərdə, həmçinin yerli özünüidarəetmənin Türkiyə təcrübəsi barədə də məlumat verilmişdir. Eyni zamanda bu institut barədə müqayisəli təhlil aparılmışdır. Məqalədə mövzuya uyğun olaraq qanunvericilik materiallarından da istifadə edilmişdir.

***Açar sözlər:*** *bələdiyyə, demokratiya, xidmət, əhali, yerli, özünüidarəetmə, idarəçilik, qanun*

**Semennaz Yusifli**
National Aviation Academy
master student
semennazyusfili2000@gmail.com

## The importance of services provided by municipalities to the local population

**Abstract**

In this article, the definition and main characteristics of the municipality, the services it provides to the local population and their quality level are examined. In the research, the main factors determining how the population accepts the local self-government services offered by the municipalities and the level of satisfaction with the service quality were studied. Also, information on the most commonly used service quality measures in the literature related to the services provided by local self-government bodies is provided. In the research work, the attitude was also expressed by referring to the studies in a number of research works related to the mentioned topic. In this article, suggestions are put forward about what can be done for the development of local self-government in the Republic of Azerbaijan. The work also provides information on the Turkish experience of local self-government. At the same time, a comparative analysis of this institute was conducted. In accordance with the topic, legislative materials were also used in the article.

***Keywords:*** *municipality, democracy, service, population, local, self-government, management, law*

## Giriş

"Dəyişməyən tək şey dəyişimin özüdür" şüarının hakim olduğu müasir dövrdə, insanların həyat tərzi, gözləntiləri və ehtiyaclarını ödəmək üsulları keçmişlə müqayisədə çox dəyişib. Daim dəyişən mühitin təsirinə məruz qalan insanlar da ətraf mühitə təsir etməyə çalışırlar. Bu gün dövlət və biznes idarəçiliyi dəyişir və bu dəyişikliklərdən ən mühümü fərdlərin gündəlik həyatında özünü göstərir. Gözləntilər və gözləntilərə cavab vermə üsulları dəyişir. Bu baxımdan qiymətləndirildikdə insanların sonsuz tələbatlarının ödənilməsində ictimai xidmət təminatçılarının, xüsusən də yerli

özünüidarəetmə orqanlarının funksionallığı və əhəmiyyəti danılmaz bir fenomendir. Bələdiyyələrin göstərdiyi xidmətlər insan həyatının əvəzedilməz hissəsi olan çörək, su və hava qədər önəmlidir. Bələdiyyə xidmətlərindən həyatın hər bir mərhələsində birbaşa istifadə olunur və bu xidmətlərin olmaması və ya lazımi səviyyədə olmaması səbəbindən insanların həyatı üçün düzəlməz təhlükələr yarana bilər.

Azərbaycan Respublikasının Konstitusiyasına əsasən yerli öznüidarəetməni bələdiyyələ həyata keçirir (1).

Yerli özünüidarəetmə orqanları bütün ölkələrdə dövlət idarəçiliyinin mühüm və əvəzedilməz elementini təşkil edən qurumlardır. Bir ölkədə yerli özünüidarəetmə orqanlarının gücü və effektivliyi həmin ölkədəki demokratiyanın səviyyəsi ilə sıx bağlıdır (Əsgərov, 2010). Yerli hökumətlər demokratiya üçün vacib olmaqla yanaşı, həm də yerli xidmətlərin icrasında səmərəliliyin və effektivliyin təmin edilməsində əvəzedilməz qurumlar hesab olunurlar. Hesabatlı, demokratik, şəffaf, proqnozlaşdırıla bilən və yaxşı idarəetmə prinsiplərinin üstünlük təşkil etdiyi yerli idarəetmə strukturunun yaradılması üçün yerli idarələrdə restrukturizasiya işləri daim diqqət mərkəzindədir. Azərbaycan Respublikasının Konstitusiyası, qəbul olunmuş mühüm qanunlar, hüquqi-normativ aktlar, beynəlxalq normalar bələdiyyələrin hüquqi bazasını formalaşdırıb və yerli özünüidarəetmə orqanlarının səmərəli fəaliyyəti üçün hərtərəfli şərait yaradır. Bu sənədlərdə demokratik prinsiplərin, insan hüquq və azadlıqlarının geniş əks olunması ölkədə yerli demokratiyanın genişlənməsinə, əhalinin özünüidarəetmənin mütərəqqi formalarından hərtərəfli istifadə etməsinə, yerli əhəmiyyətli məsələlərin həllində hər bir insanın iştirakına imkan verir. Bu kontekstdə yerli özünüidarəetmələri tənzimləyən əsas qanunlara yenidən baxılaraq, daha da inkişaf etdirilərək, bugünkü şəraitə uyğun, müasir idarəetmə prinsiplərinə əsaslanan, inzibati proseslərdə vətəndaş iştirakına önəm verən yerli idarəetmə yanaşmasının həyata keçirilməsi mühüm məqamlardandır. Bu məqsədə nail olmaq üçün əhəmiyyətli addımlar atılmağa cəhd edilsə də tam nəticəyə hələ ki, nail olmaq mümkün olmamışdır. Arzuolunan nəticələrin əldə edilməsində isə yerli özünüidarətemə orqanlarının yerli əhali ilə sıx təmasda olması, onlarla əlaqəli şəkildə fəaliyyət göstərməsi, problemləri ilə daimi olaraq maraqlanması, yerli əhalinin görülmüş tədbirlərdən məmnun qalması vacib nüansdır. Bu baxımdan deyə bilərik ki, cəmiyyətin demokratik əsaslarla idarə edilməsində ən vacib göstəricilərdən biri də yerli özünü idarəetmə orqanlarının fəaliyyətinin şəffaflığı, operativliyi və düzgün qurulmasıdır.

Azərbaycan Respublikasında bu institutun fəaliyyəti ilə bağlı 1999-cu ildə qəbul edilən "Bələdiyyələrin statusu haqqında" Azərbaycan Respublikasının Qanunu bu sahədə ən əhəmiyyətli aktlardandır. Bu qanunu tələblərinə riayət edilməsi və son illərdə bələdiyyələrlə əlaqədar yaranan problemlərin həlli üçün görülən tədbirlərin icrasını təmin etmək məqsədi ilə həyat keyfiyyəti, xidmət keyfiyyəti və vətəndaş məmnunluğu anlayışları son illərdə bələdiyyələr üçün daha vacib anlayışlara çevrilməkdədir (Seyidov, 2003).

Yerli özünüidarəetmə orqanlarının üzərində məsul olduqları vətəndaşların ehtiyaclarını, gözləntilərini və tələblərini nə dərəcədə ödəyə bilməsinin qiymətləndirilməsi də bələdiyyələrin gələcək planlaşdırılmasında böyük əhəmiyyət kəsb edir. Çünki bələdiyyələr vətəndaşlara keyfiyyətli xidmət göstərə bildikcə uğurlu sayılırlar. Bələdiyyələrin təklif etdiyi xidmətin keyfiyyətini ölçən xidmətdən yararlanan vətəndaşlardır. Gözləntilərə uyğun olaraq xidmət keyfiyyəti vətəndaşdan vətəndaşa dəyişir. Gözləntilər insanın təhsil səviyyəsi, gəlir səviyyəsi və sosial səviyyəsindən asılı olaraq dəyişir.

Bələdiyyə Fransada "municipalite", İngiltərədə "municipality", köhnə termin olaraq isə "şeşemaneti" olaraq istifadə edilən bir anlayışdır (Straşun, Abdullayev, 2001). Müasir mənada bələdiyyə "müəyyən ərazidə - kənddə, şəhərdə yaşayan əhalinin ümumi yerli ehtiyaclarını ödəməkdən məsul olan, qanunla müəyyən edilən səlahiyyətlərə malik olan və qərar qəbuledici orqanları ictimaiyyət tərəfindən seçilən yerli idarəetmə vahidi" kimi müəyyən edilir.

"Bələdiyyələrin statusu haqqında" Azərbaycan Respublikasının Qanununda təsbit olunmuş tərifə görə bələdiyyə; qanunla müəyyən edilmiş ərazi hüdudları daxilində yerli özünüidarəetmə formasıdır. Bələdiyyənin öz mülkiyyəti və yerli büdcəsi olur və o, Azərbaycan Respublikasının

Konstitusiyası ilə və bu qanunla səlahiyyətlərinə aid edilmiş yerli əhəmiyyətli məsələləri müstəqil surətdə həll edir. Bələdiyyələr bərabərlik əsasında qurulur və fəaliyyət göstərirlər («Bələdiyyələrin statusu haqqında» Qanun, 1999).

Dünya təcrübəsində belə qeyd olunur ki, müasir bələdiyyə baxımından bələdiyyənin mövcud olması üçün o, əhali məskunlaşmış icma, şəhər, şəhər icması (ən azı qəsəbə) olmalıdır və bələdiyyə mərkəzi idarəetmədən müstəqil idarəetmə təşkilatı kimi qəbul edilməlidir. Bələdiyyələrə, bələdiyyə sədrlərinə və bələdiyyə üzvlərinə müxtəlif qanun və qaydalarla müəyyən vəzifə və səlahiyyətlər verilir. Bələdiyyələr həm ictimai hüquqa, həm də xüsusi hüquqa əsaslanan əməliyyatlar həyata keçirdikləri üçün hər iki qanunun qaydalarına tabe olaraq hərəkət edirlər. Bir tərəfdən xüsusi hüquqla əlaqədar hüquqi şəxs kimi alqı-satqı, icarəyə götürmə, müqavilələr bağlamaq və vergi ödəyicisi olmaq kimi hüquq və öhdəliklərə malik olmaqla yanaşı, digər tərəfdən də müsadirə etmək kimi ictimai hüquq hüquqlarına malikdir.

Bələdiyyələr onlara qanunla verilmiş səlahiyyətlər baxımından müəyən xidmətləri göstərməklə yüklüdürlər. Dövlət, bələdiyyələr və digər publik hüquqi şəxslər və ya onların nəzarəti altında olan digər şəxslər və ya təşkilatlar tərəfindən vətəndaşların ümumi ehtiyaclarını ödəmək və ictimai rifahı təmin etmək məqsədi ilə həyata keçirilən davamlı və müntəzəm fəaliyyətlər kimi ifadə olunan "dövlət xidmətlərinin" ölçüləri, dövlət idarəçiliyi sahəsində dəyişikliklər, urbanizasiya və əhalinin artımı kimi səbəblərə görə zamanla dəyişir (ADİU "Dövlət və bələdiyyə idarəçiliyi", 2010: 276).

Yerli özünüidarə orqanları dövlət idarəçiliyində ictimaiyyətə ən yaxın qurumdur. Buna görə də yerli idarəetmələrdə yerli özünüidarəetmə orqanları əhaliyə təklif etdikləri xidmətləri təkmilləşdirmək üçün strategiyalar hazırlamalı, bunda isə məqsəd cəmiyyətin tələblərinə həssas, iştirakçı, şəffaf, hesabatlı, ictimaiyyətə yaxın, effektiv, səmərəli və keyfiyyətli bələdiyyə sistemi yaratmaq olmalıdır.

Yerli özünüidarəetmə orqanları yerli əhalinin istək və ehtiyaclarını yerinə yetirmək üçün yaradılmış qurumlardır. Bu qurumlar, qeyri-hökumət təşkilatları və özəl sektorlar müəyyən bir bölgədə yaşayan insanların ümumi ehtiyaclarını ödəmək və ictimai fayda təmin etmək üçün müvafiq tədbirlər görür.

Yerli idarəetmə orqanının nəzarəti altında davamlı və müntəzəm işlər görülməsi yerli xidmətlər adlanır. Bələdiyyə təşkilatları, könüllü təşkilatlar və ya özəl sektor təşkilatları tərəfindən şəhərdə ümumi ehtiyacları ödəmək, ictimai faydanı təmin etmək məqsədilə həyata keçirilən, müvafiq bələdiyyənin məsuliyyəti və nəzarəti altında olan davamlı və müntəzəm fəaliyyətlərə də bələdiyyə xidmətləri deyilir. Yerli özünüidarəetmə orqanı olan bələdiyyələr əhalinin yerli ehtiyaclarını müəyyən etmək və yerli ictimai xidmətlərin bütün növ nəzarət funksiyalarını planlaşdırmaq, təşkil etmək, icra etmək, əlaqələndirmək və yerinə yetirmək üçün məsuliyyət daşıyır. Ənənəvi anlayışa görə, bələdiyyələr onlara tapşırılan vəzifə və xidmətləri özorqanlarından, avadanlıqlarından və kadrlarından istifadə etməklə yerinə yetirirlər. Yəni onun xidmətlərini tənzimləyən, təşkil edən, icra edən və nəzarət edən bələdiyyənin elə özüdür. Xidmətlərin göstərilməsində bələdiyyə üzvləri və bələdiyyə təşkilatında çalışan işçilər mühüm rol oynayır və xidmətlərin hər bir mərhələsində demək olar ki, söz sahibidirlər. Ona görə də vətəndaşların gözləntilərinə cavab verən xidmətlərin səviyyəsi bələdiyyə işçilərinin fəaliyyətindən asılı olaraq arta və ya azala bilər (Şahin, 2011: 212).

Azərbaycan Respublikasında bələdiyyələr tərəfindən göstərilən xidmətlər "Bələdiyyələrin statusu haqında" Azərbaycan Respublikasının Qanununda öz əksini tapmışdır. Qanunda yerli sosial müdafiə və sosial inkişaf proqramları bələdiyyə tərəfindən müəyyən edilən vətəndaşlar kateqoriyasına dövlət sosial təminatından əlavə sosial təminatların müəyyən edilməsini ehtiva edir. Həmin təminatlar mütəmadi və birdəfəlik ola bilər. Yerli sosial müdafiə və sosial inkişaf proqramlarında məqsəd dövlətin həyata keçirdiyi sosial inkişaf proqramlarında nəzərdə tutulmayan və ya onlara əlavə olaraq yerli əhəmiyyətli sosial inkişaf məsələlərini həll etməkdir. Həmin proqramlar təhsil, səhiyyə, mədəniyyət, yaşayış və qeyri-yaşayış binalarının saxlanılması və istifadə edilməsi, sanitariya müəssisələrinin təşkili, saxlanılması və inkişafı, mənzil tikintisi, yerli əhəmiyyətli su mənbələrindən istifadə, su təchizatının və kanalizasiya təsərrüfatının təşkili,

saxlanılması və inkişafı, yanacaq təchizinin və satışının təşkili, bələdiyyə yollarının tikilməsi və saxlanılması, yerli nəqliyyat və rabitə xidmətinin təşkili, ticarət, ictimai iaşə və məişət xidmətinin təşkilinə şərait yaradılması, mədəniyyət müəssisələrinin inkişafına yardım göstərilməsi, tarix və mədəniyyət abidələrinin saxlanılması, informasiya xidmətinin təşkili, media subyektlərinin fəaliyyəti üçün şərait yaradılması, kimsəsizlərə, xəstələrə, qocalara, maddi imkansızlara, valideyn himayəsindən məhrum olmuş, həmçinin istedadlı uşaqlara əlavə yardım, fiziki tərbiyə və idmanın inkişafına yardım göstərilməsi, əhalinin məşğulluğuna, adamların peşələri üzrə işlə təmin olunmasına gənclərin sosial hüquqi müdafiəsinə, ailə kəndli təsərrüfatının inkişafına kömək göstərilməsi və yerli infrastrukturun digər sahələrini əhatə edə bilər (8). Qeyd olunan bir qisim xidmətlərin keyfiyyətinin ölçülməsi, vətəndaşların bu xidmətlərdən məmnunluğunun müəyyən olunması mühüm məqamdır.

Ədəbiyyatda xidmət keyfiyyətinin ölçüləri müxtəlif yollarla müəyyən edilmişdir. Bunlar bəzən kadr səviyyəsi, obyekt səviyyəsi və maddi səviyyə kimi müəyyən edilsə də, bəzən texniki keyfiyyət və funksional keyfiyyətə olaraq da təsnif olunur (Ərtoğrul, 2001: 46-59). Bəzi tədqiqatçılar xidmət keyfiyyətini proses və nəticənin keyfiyyəti kimi qəbul edərkən, digərləri onu fiziki keyfiyyət, şirkət keyfiyyəti və qarşılıqlı əlaqə keyfiyyəti kimi müəyyən edirlər. Ədəbiyyatda ən çox istifadə olunan xidmət keyfiyyəti ölçüləri aşağıdakı kimi müəyyən edilir:

Maddi xüsusiyyətlər: Binaların, istifadə olunan avadanlıqların, kommunikasiya materiallarının və personalın görünüşü,

Etibarlılıq: Vəd edilmiş xidməti dəqiq yerinə yetirmək bacarığı,

Cavablılıq: Yerli əhaliyə kömək etmək və operativ xidmət göstərmək istəyi,

Nəzakət: Əhali ilə birbaşa münasibətdə olan işçilər nəzakətli, hörmətli, diqqətli və səmimi olmalıdırlar.

İnandırıcılıq: Xidməti təqdim edən şəxs etibarlı və dürüst olmalıdır,

Giriş: Əlaqə asanlığı və lazım olduqda əlçatanlıq,

Ünsiyyət: Əhalinin başa düşə biləcəyi dildə məlumatlandırılması və problemlərinizi dinləmək,

Empatiya: Özlərini yerli əhalinin yerinə qoyan işçilər və əhaliyə fərdi diqqət yetirmək.

Yuxarıda qeyd olunan bu ölçüləri bilmək və xidmətdən yararlanan əhalinin narazılıqlarının səbəblərini öyrənmək onların ehtiyac və istəklərinə uyğun olaraq xidmətlərin icrası ilə bağlı lazımi tənzimləmələri etməyə imkan verir və xidmətin effektivliyini artırır. Bu kontekstdə xidmət keyfiyyəti vətəndaşların xidməti aldıqdan sonra yaratdığı hissdir və onların sözügedən xidmətdən nə dərəcədə razı və ya narazı olduqlarını ifadə edir. Buna görə də xidmət keyfiyyəti anlayışı; Xidmət alanın ehtiyac və gözləntiləri, xidmətin bunlara uyğun olması lazım olan xüsusiyyətlər və xidmətin bu xüsusiyyət və keyfiyyətlərə nə dərəcədə malik olması kimi ifadə edilə bilər.

Baxmayaraq ki, bələdiyyələr yerlərdə seçki ilə formalaşan yeganə təşkilatlardır və sakinlər onlardan təkmilləşdirilmiş və öz imkanları daxilində əsas ictimai xidmətlərin təmin olunmasını gözləyirlər, hazırda, bələdiyyələr əhalinin onlardan gözlədiyi vəzifələri həyata keçirmək üçün zəruri maliyyə imkanlarına malik deyillər (10).

Demokratik cəmiyyətlərin qurulmasını dəstəkləyən, gəlir əldə etməyi nəzərdə tutmayan və beynəlxalq təşkilat olan İFES və Alman Texniki Əməkdaşlıq Agentliyinin (GTZ) texniki yardımıyla Avropa Təhlükəsizlik və Əməkdaşlıq Təşkilatı (ATƏT) və Avrasiya Fondu (AF) tərəfindən birgə maliyyələşdirilən və Weitz İnkişaf Araşdırmaları Mərkəzi tərəfindən 2000-ci illərin əvvəlində Azərbaycan Respublikasının bəzi rayonlarında bəldiyyələrin göstərdiyi xidmətlərlə əlaqədar tədqiqat aparılmış və hesabat hazırlanmışdır. Hesabatın əsas məqsədi Azərbaycanın seçilmiş bələdiyyələrində bələdiyyə xidmətlərinin göstərilməsində ehtiyacların qiymətləndirilməsi və bələdiyyələrin maliyyə, texniki, inzibati və sosial imkanlarına uyğun olaraq əlavə xidmətlərin və pilot layihələrin təmin edilməsi olmuşdur. Analiz edilən xidmətlər təhsil, səhiyyə, yerli infrastruktur olmuşdur. Heyətin tədqiqatları göstərir ki xidmətlərin göstərilmə səviyyəsi xidmətin göstərilməsi, xidmət vahidlərinin əlverişliliyi, təchizat və avadanliq baxımından ümumən zəif olduğu qənaətinə gəlinmişdir. Xidmətlərin çoxu hakimiyyət tərəfindən İcra hakimiyyəti orqanları tərəfindən göstərilir. Hesabatın əsas nəticəsi kimi bələdiyyələrin ən birinci problemi maliyyə çatışmazlığı

olaraq göstərilirdi. Həmin dövr ilə müqayisədə müasir zamanda bu gün ölkə bələdiyyələri dövlət siyasətini dərindən başa düşən, qiymətləndirən və ona dəstək verən bir orqana çevriliblər. Bələdiyyələr reallıqları görür və öz fəaliyyətlərini bu zəmin üzərində qururlar (Gorelik, Sofer, 2004: 82).

Vergi sisteminin təkmilləşdirilməsində, mülkiyyətin müəyyən edilməsində, bələdiyyə-vətəndaş münasibətlərinin qurulmasında da irəliləyiş hiss olunmaqdadır. Bu gün Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev dövlət bələdiyyələrinin inkişafında maraqlıdır və bu sahəyə lazımi diqqət yetirilir. Yerli özünüidarəyə həsr olunmuş 30-a yaxın qanun, bələdiyyələrin fəaliyyətinin istiqamətlərini tənzimləyən 200-dən çox qərar, fərman, sərəncam və əsasnamənin qəbul edilməsi bunu deməyə əsas verir. Əlbəttə, bu gün bələdiyyələrin fəaliyyətində bir çox nöqsanlar, çatışmazlıqlar, həllini gözləyən problemlər mövcuddur. Ancaq bəzi insanların səsləndirdiyi kimi, bələdiyyələr tam səlahiyyətsiz, fəaliyyəti nəzərə çarpmayan, kimdənsə asılı orqanlar deyildir. Əgər yerli özünüidarəetmə orqanları əsaslı qanunlarla tənzimlənən səlahiyyətlərə və imkanlara malikdirlərsə, onların səmərəli işləməsi üçün ölkədə lazımi şərait yaradılıbsa, mövcud nöqsanları tamamilə dövlətin adına yazmaq olmaz. Bu problemlər əsas etibarı ilə yerli əhalinin məlumatsızlığı, bəzi məqamlarda məsuliyyətsizliyi ilə də əlaqədardır. Belə ki, bələdiyyələrin üzləşdiyi ən çətin problemlərdən biri bələdiyyə büdcələrinin formalaşmasının əsas mənbələrindən hesab olunan yerli vergi və ödənişlərinin əhali tərəfindən vaxtında ödənilməməsi və ya heç ödənilməməsidir. Bu halda müəyyən ərazidə məskunlaşmış əhali öz üzərinə düşən məsuliyyəti dərk etməməklə, vergilərdən yayınmaqla bələdiyyələrin işinin çətinləşdirilməsində əsas rol oynayır və buna görə də bələdiyyələrin öz üzərinə düşən xidmətlərini yerinə yetirməsinə müəyyən mənada təsir etmiş olur. Yerli ödənişlərin hesablanması və yerli verginin alınması üçün təkmil təsir mexanizminin yaradılması çox əhəmiyyətlidir.

Yerli əhalidən yerli vergi və ödənişlərin toplanması ilə bağlı bələdiyyələrlə aralarında yaranan problemlərin həlli üsullarının da təcrübədə geniş istifadə olunduğunun şahidi ola bilmirik. Əgər hər hansı bir sakin vergilər ödəməkdən boyun qaçırırsa, onu müəyyən formalarla gecikdirirsə bu zaman bələdiyyələr ilk növbədə həmin sakini bu problemlə əlaqədar xəbərdar edir, onun ünvanına məktublar göndərirlər. Lakin bu xəbərdarlıqların bir nəticə verməməsi mövcud problemli situasiyanın daha da uzanmasına səbəb olur. Bu baxımdan bələdiyyələrin problemləri ilə bağlı məhkəməyə müraciət etməsi, tərəflərin məhkəməyə dəvət olunaraq yaranan problemə məhkəmə posesinin çəkişmə prinsipi əsasında baxılmasını, bununla bağlı qanunvericilikdə əlavələrin edilməsini məqsədəmüvafiq hesab edirik.

Belə ki, AR Vergi Məcəlləsinə və digər qanunlarına əsasən müvafiq yerli (bələdiyyə) vergilər və ödənişlər ödənilmədikdə, bələdiyyənin vergi xidməti orqanlarının vəzifəli şəxsləri tərəfindən müvafiq akt tərtib edilir. Həmin aktda onun tərtib edildiyi tarix və yer, aktı tərtib etmiş şəxslərin vəzifəsi, soyadı, adı, atasının adı, yerli (bələdiyyə) verginin və (və ya) ödənişin ödəyicisi barədə məlumat, müvafiq verginin və (və ya) ödənişin növü (adı), AR Vergi Məcəlləsinin və digər qanunların pozulmasını təşkil edən konkret hal (hallar) və həmin pozuntulara görə məsuliyyəti nəzərdə tutan AR Vergi Məcəlləsinin və digər qanunların konkret maddələri göstərilməli, ödəyiciyə müvafiq vergini və (və ya) ödənişi ödəmək təklif edilməlidir. Tərtib edilmiş akt bələdiyyənin sədrinə (yaxud onun müavininə), surəti isə ödəyiciyə təqdim edilir.

Ödəyici bələdiyyə vergi xidməti orqanının aktı ilə razılaşmadıqda, aktın alındığı gündən 30 gün müddətində akta və ya onun ayrı-ayrı hissələrinə öz etirazını yazılı surətdə bildirə bilər.

Ödəyici tərəfindən bələdiyyə vergi xidməti orqanının aktı üzrə yazılı izahat və ya etiraz təqdim edildikdə, həmin akta ödəyicinin və ya (və) onun nümayəndəsinin iştirakı ilə baxılır. Akta baxılmanın yeri və vaxtı haqqında ödəyiciyə vergi xidməti orqanı tərəfindən ən azı 3 iş günü əvvəl məlumat verilməlidir. Ödəyici (onun nümayəndəsi) üzrlü səbəb olmadan müzakirəyə gəlmədikdə, məsələyə onun iştirakı olmadan baxılır.

Yuxarıda qeyd edilmiş müddət bitdikdən sonra 15 gün ərzində bələdiyyə öz vergi xidməti orqanının aktına baxır və ödəyiciyə münasibətdə qanunla müəyyən edilmiş hallarda yerli (bələdiyyə) vergi və ödənişlər barədə qanunvericiliyin pozulmasına görə məsuliyyət tədbirlərinin

tətbiqi üçün məhkəməyə müraciət edilməsi barədə qərar çıxarır, yaxud belə qərarın çıxarılmasından imtina edir (12). Belə bir nəticə əldə edirik ki, yerli (bələdiyyə) vergilər və ödənişlər üzrə vaxtı keçmiş borcların, hesablanmış faizlərin məcburi qaydada alınması və maliyyə sanksiyalarının tətbiq edilməsi üçün bələdiyyələr öz vergi xidməti orqanının təqdimatı əsasında (könüllü ödəniş halları istisna olmaqla) məhkəmələrə müraciət edirlər.

Göründüyü kimi qanunvericilikdə öz əksini tapmış, tətbiq edilməli olan bu prosedur təcrübədə geniş istifadə olunarsa bələdiyyələrin sakinlərlə olan maliyyə problemləri aradan qalxa bilər, vergilərin vaxtında ödənilməsi təmin olunar, beləliklə, bələdiyyələr tərəfindən də göstərilən xidmətlərin keyfiyyəti artar. Bu həm əhalinin məmnunluğunu təmin edəcək, həm də bələdiyyələrin işinin düzgün qurulmasına dəstək olmaqla, nümunəvi yerli özünüidarəetmə sisteminin qurulmasına təkan verəcəkdir.

Bələdiyyələrin yerli əhaliyə olan xidmətlərinin əhəmiyyətini qiymələndirərkən bələdiyyə sisteminin inkişaf etdiyi ölkələrin təcrübəsindən yararlanmaq mümkündür. Bu zaman qardaş ölkə - Türkiyənin təcrübəsinə nəzər yetirməyi zəruri sayırıq. Türkiyədə bələdiyə mənsub olduğu bölgənin bütün yerli problemləri ilə məşğul olur, bölgəni tanıtdırmaq, yeni iş yerləri açmaq üçün potensialını artırmağa çalışır. “Selçuk” bələdiyyə sədri Dahi Zeynel Bakıcı Türkiyədəki bələdiyyələr ilə bağlı “bizdə bələdiyyəçilik beşikdən məzara qədərdi. Yəni, yeni doğulan bir körpənin ehtiyaclarını qarşılamaqdan tutmuş vəfat edən bir adamın ailəsinin duya biləcəyi bütün ehtiyaclar qarşılanır” deyə qeyd edir. Türkiyədə yerli qurumlar bələdiyyə yerli və ərazi yollarını düzəldir, ona nəzarət edir, küçələrin təmiz saxlanmasına, o cümlədən, məişət tullantılarının daşınmasına məsuliyyət daşıyır, parklar salır, ətrafın göz oxşayan olması üçün işlər görür (çiçəklər, ağaclar əkir, ona qulluq edir), mədəniyyət və idman sahələrini diqqətdən kənara buraxmır. Bu xidmətlərin göstərilməsi Azərbaycan Respublikasında “Bələdiyyələrin statusu haqında” qanunda da öz əksini tapmışdır. Lakin müəyyən maliyyə problemləri ilə əlaqədar bunların tam tətbiq edildiyinin şahidi ola bilmirik. Hesab edirik ki, aktuallığını qoruyan maliyyə məsələləri öz həllini taparsa, bələdiyyələrin səlahiyyətləri digər qurumların səlahiyyətlərindən tam şəkildə fərqləndirilib dəqiq müəyyən olunarsa, bələdiyyələrin fəaliyyətinə nəzarət daha da sərtləşdirilərək sui-istifadə hallarının qarşısı alınarsa Azərbaycan Respublikasında da nümunəvi yerli özünüidarəetmə sisteminin yaradılmasına nail olmaq mümkündür.

Nəticə etibarı ilə, bələdiyyələr həm yerli ictimai ehtiyaclara cavab verən xidmətlər təqdim edirlər, həm də ictimaiyyətə ən yaxın idarəçilik qurumları olduğundan mühüm rol oynayırlar. Xüsusilə son illərdə mərkəzi dövlət xidmətlərinin bir hissəsinin yerli özünüidarəetmə orqanlarına - bələdiyyələrə verilməsi ilə əlaqədar təkliflər və fikirlər olduğundan bələdiyyələr üçün xidmət keyfiyyəti və vətəndaş məmnunluğu anlayışları daha çox məna kəsb edir.

## Nəticə

Etibarlı gələcək yerli özünüidarəetmə orqanlarından ümumi qəbul edilmiş beynəlxalq təcrübəyə və obyektiv gerçəkliklərə əsaslanaraq formalaşmanı labüd edir (Mavili, Ünlü, 1995: 42-50). Ona görə ki, bələdiyyələr respublikamızın dayanıqlı və sürətli inkişafı və əhalinin daha yaxşı yaşamaq zərurəti şəraitində öz fəaliyyət istiqamətlərini düzgün formalaşdırmaq və bu zaman yaranan problemləri həll etmək baxımından operativ bir orqana çevrilməklə yanaşı, həm də öz strukturlarını daima təkmilləşdirməlidirlər. Xırda, maliyyə imkanları məhdud olan orqanların fəal, yaxşı iş təcürbəsinə və bacarığa malik, daha da böyük bələdiyyələrlə birləşməsi yerli özünüidarəetmə orqanlarının fəaliyyətində əsaslı dönüş yaratmaqla dahada böyük inkişafa nail ola bilər. Bələdiyyələrin gələcəkdə birləşməsi inzibati və digər xərclərin azalmasına, mülkiyyətin genişlənməsinə, kadr çatışmazlığının aradan qaldırılmasına və görülən işlərə nəzarətin daha yaxşı həyata keçirilməsinə təkan yaradar.

Digər tərəfdən, bələdiyyələrə öhdəsindən gələ biləcək əlavə səlahiyyətlərin verilməsi də vacibdir. Bu, kommunal xidmət, yaşıllaşdırma, təmizlik-abadlıq, suvarma və sair sahələr ola bilər. Bələdiyyə büdcəsinin artırılmasından və formalaşdırılmasından ötrü vergidən yayınanlara qarşı, eləcə də mədən və əmlak vergilərinin, küçə reklamları üzrə ödənişlərin hesablanması və yerli

verginin alınması üçün təkmil təsir mexanizminin yaradılması çox əhəmiyyətlidir. Bəzi bələdiyyələrə öz əmlaklarına mülkiyyət hüququnu təsdiq edən sənədlərin verilməməsi də narahatlıq doğuran haldır.

Azərbaycan bələdiyyələri öz fəaliyyətlərini Azərbaycan Respublikasının Konstitusiyasının, mövcud qanunlarımızın, "Yerli özünüidarəetmə" haqqında Avropa Xartiyasının tələblərinə uyğun qurmağa və ölkənin sosial-iqtisadi inkişafına öz töhfələrini verməyə qadirdirlər. Yerli özünüidarəetmə orqanlarının gələcək səmərəli fəaliyyəti, əhali ilə sağlam, işgüzar münasibətlərin yaradılması, faydalı işin təşkili, seçicilərin etimadının qazanılması bələdiyyələrin özündən çox asılıdır. Bunun üçün hər bir bələdiyyə üzvündən təşkilatçılıq bacarığı, işə doğma münasibət, operativlik və prinsipiallıq tələb olunur. Hesab edirik ki, bələdiyyələrimiz onlara yaradılan imkan və şəraiti düzgün qiymətləndirəcək, gələcəkdə də seçicilərin onlara göstərdiyi etimadı doğruldacaqlar.

## Ədəbiyyat

1. Azərbaycan Respublikasının Konstitusiyası https://e-qanun.az/framework/897
2. Əsgərov, Z. (2010). Konstitusiya hüququ (dərslik). Bakı.
3. Seyidov, N. (2003). "Bələdiyyələr, beynəlxalq təcrübə və yerli qanunvericilik". Bakı.
4. Straşun, B.A., Abdullayev, E. (2001). Xarici ölkələrin konstitusiya hüququ. Dərslik. Ümumi hissə. I cild, ABU.
5. «Bələdiyyələrin statusu haqqında» Qanun. (1999). Bakı.
6. ADİU "Dövlət və bələdiyyə idarəçiliyi". (2010). Bakı, 278 s.
7. Şahin, Z. (2011). "Bələdiyyə xidmətləri və xidmət keyfiyyətindən vətəndaş məmnunluğunun ölçülməsi" (Konya il mərkəzi nümunəsi) (Dövlət İdarəetmə Bölməsi İdarəetmə Elmləri Magistrlik dissertasiyası). Karaman, 212 s.
8. https://www.azerbaijan-news.az/posts/detail/belediyyeler-inkisaf-problemler-ve-vezifeler-41774
9. Ərtoğrul. (2001). "Yerli Hökumətlərin Xidmət Təminatında Alternativ Metodlar", Balıkesir Universiteti Sosial Elmlər Jurnalı, Sayı: 6, s.46-59.
10. http://seyyah.az/news/3006?country=0&city=0&minprice=200&maxprice=550&t=1
11. Gorelik, M., Sofer, R. (2004). "Bələdiyyə Xidmətlərinin İnkişafı üçün Ehtiyacların Dəyərləndirilməsi" (hesabat)-Weitz İnkişaf Araşdırmaları Mərkəzinin hesabatı, 82 s.
12. AR Vergi Məcəlləsi https://e-qanun.az/framework/46948
13. Mavili, A., Ünlü, E. (1995). "Xidmətin Keyfiyyətinin və Effektivliyinin Ölçülməsində Qiymətləndirmə Araşdırmalarının Rolü", 1. Sistem Mühəndisliyi və Müdafiə Tətbiqləri Simpoziumu, Hərbi Akademiya. Ankara, s.42-50.

Göndərilib: 16.01.2024 Qəbul edilib: 21.03.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/234-240

**Aysel Mürşüdlü**
Bakı Dövlət Universiteti
magistrant
ayselmurshudlu@gmail.com

# İNTERNET PROVAYDERLƏRİNİN YERLƏŞDİRİLƏN MƏZMUNA NƏZARƏTLƏ BAĞLI ƏSAS HÜQUQ VƏ AZADLIQLARLA ƏLAQƏSİ

**Xülasə**

Təqdim edilmiş məqalədə sosial şəbəkə provayderlərinin məzmun baxımından nəzarəti ilə əsas hüquq və azadlıqlar arasındakı əlaqə araşdırılaraq beynəlxalq aspektdə qiymətləndirilmiş, Azərbaycan qanunvericiliyindəki tənzimləmələr müzakirə edilmişdir. Burada bəhs edilən əsas hüquq və azadlıqlarla sosial şəbəkə istifadəsində paylaşılan məzmuna nəzarət arasındakı əlaqə müzakirə olunmuşdur. Əsas hüquq və azadlıqlar haqqında 1950-ci il Avropa Konvensiyası və Azərbaycan Respublikasının Konstitusiyasında təminat verilmiş sözügedən hüquqlar təhlil edilmiş, əsas hüquq və azadlıqların məzmun baxımından təsnifatı təhlil olunaraq, milli-hüquqi tənzimləmə üçün vacib olan redaktələrin məzmunu müəyyən olunmuş, normalarda olan çatışmazlıqlar aşkar edilmiş, onların aradan qaldırılmasına dair təkliflər təqdim olunmuşdur. Müdaxiləni tələb edən əsas hüquq və azadlıqlar qismində yaşamaq hüququ, şəxsi və ailə həyatına hörmət hüququ, ayrı-seçkiliyin qadağan edilməsi nəzərdən keçirilmişdir. Hüquq və azadlıqların məhdudlaşdırılmasını tələb edən əsas hüquq və azadlıqlar kimi isə fikir, vicdan və din azadlığı, toplaşmaq və birləşmək azadlığı, ifadə azadlığı təhlil edilmişdir. Sözügedən məqalədə sosial şəbəkə provayderlərinin istifadəçilər tərəfindən yerləşdirilən məzmunla bağlı məsuliyyət məsələsinə dair Avropa İnsan Hüquqları Məhkəməsinin bir sıra qərarları məlumat və ifadə azadlığı konteksində qiymətləndirilmişdir.

***Açar sözlər:*** *internet provayderi, əsas hüquq və azadlıqlar, məzmun, sosial şəbəkə, nəzarət, Konvensiya*

**Aysel Murshudlu**
Baku State University
master student
ayselmurshudlu@gmail.com

# The relationship of Internet providers to fundamental rights and freedoms related to the control of posted content

**Abstract**

In the presented article, the relationship between content control of social network providers and basic rights and freedoms was examined and evaluated in an international aspect, and regulations in Azerbaijani legislation were discussed. The relationship between the basic rights and freedoms mentioned here and the control of the content shared in the use of social networks has been discussed. The aforementioned rights guaranteed by the 1950 European Convention on Fundamental Rights and Freedoms and the Constitution of the Republic of Azerbaijan were analyzed, the classification of fundamental rights and freedoms in terms of content was analyzed, the content of the amendments important for national-legal regulation was determined, and deficiencies in the norms were discovered. proposals for their elimination have been presented. The right to life, the right to respect for private and family life, and the prohibition of discrimination were considered as basic rights and freedoms that require intervention. Freedom of thought, conscience and religion, freedom of assembly and association, and freedom of expression were analyzed as the main rights and freedoms that require restriction of rights and freedoms. In the

mentioned article, a number of decisions of the European Court of Human Rights on the responsibility of social network providers regarding the content posted by users were evaluated in the context of freedom of information and expression.

***Keywords:*** *internet provider, fundamental rights and freedoms, content, social network, control, Convention*

## Giriş

1.1 Məzmun baxımından internet provayderlərinin əsas hüquq və azadlıqlarla əlaqəsi.

Sosial şəbəkələrin ümumi məqsədi istehsal olunan məzmunu qarşılıqlı əlaqədə olan istifadəçilərlə bölüşməkdir. Bu məzmunların hazırlanması zamanı digər istifadəçilərin şəxsi hüquqları və məxfiliyi pozula, ictimai asayiş və ictimai təhlükəsizlik təhdid edilə bilər. Sosial şəbəkələrin bu xüsusiyyəti bu medianın qanuni qaydalarla idarə olunmasını tələb edir. Sosial şəbəkə provayderləri isə öz daxilində yaradılan məzmunun qanunsuzluğunu aradan qaldırmaq baxımından məsuliyyət daşıyırlar. Dövlətlər sosial şəbəkələrdə baş verən qanunsuzluqları aradan qaldırmaq üçün bu media ilə bağlı qaydalar hazırlayır.

Sosial şəbəkələrdən istifadədə həm azadlıqların, həm də məhdudiyyətlərin əsasını əsas hüquq və azadlıqlar təşkil edir. Məsələn, sosial şəbəkələrdən istifadə ifadə azadlığı çərçivəsində icazə verilən bir hüquq olsa da, şəxsi və ailə həyatını qorumaq üçün bu istifadəyə müəyyən məhdudiyyətlər qoyula bilər. Burada bəhs edilən əsas hüquq və azadlıqlarla sosial şəbəkə istifadəsində paylaşılan məzmuna nəzarət arasındakı əlaqə nöqteti-nəzərindən baxdıqda onları şərti olaraq iki yerə bölmək olar: a) Müdaxiləni tələb edən hüquq və azadlıqlar və 2) Müdaxilənin məhdudlaşdırılmasını tələb edən hüquq və azadlıqlar.

İstifadəçilər tərəfindən yaradılan məzmuna görə sosial şəbəkə provayderlərinin öhdəliklərindən bəhs edərkən diqqət çəkən məqamlardan bir də əsas hüquq və azadlıqlar əsasında qiymətləndirmə aparılarkən qeyri-qanuni məzmuna girişin məhdudlaşdırılması, məzmunun silinməsi kimi müdaxilələrin, şəxsi hüquqların qorunması, ictimai asayişin və ictimai təhlükəsizliyin təmin edilməsi baxımından əhəmiyyətidir. Bu proqramların başqa bir cəhəti internetdən istifadə azadlığına, xüsusən ifadə azadlığına yönəlmiş qeyri-mütənasib və ya həddindən artıq müdaxilə təşkil etməmələridir.

Ona görə də əsas hüquq və azadlıqlar sosial şəbəkə provayderlərinə nəzarət üçün hüquqi əsas yaratsa da, bu nəzarətin müəyyən çərçivələrdə həyata keçirilməlidir. Bu nöqtədə müdaxiləni zəruri edən əsas hüquqlar yaşamaq hüququ, şəxsi və ailə həyatına hörmət hüququ, ayrı-seçkiliyin qadağan edilməsi ikən müdaxilənin məhdudlaşdırılmasını tələb edən əsas hüquqlar isə fikir, vicdan və din azadlığı, toplaşmaq və birləşmək azadlığı, ifadə azadlığıdır.

### 1.2. Müdaxiləni tələb edən əsas hüquq və azadlıqlar.

Müdaxiləni tələb edən əsas hüquq və azadlıqlar dedikdə 1950-ci il Avropa Konvensiyası və AR Konstitusiyasında hər kəsin yaşamaq hüququna, maddi və mənəvi varlığını qorumaq hüququna malik olduğu ifadələri ilə təminat verilmiş hüquqlar nəzərdə tutulur. Məsələn, toxunulmaz hüquqlardan sayılan yaşamaq hüququ, şəxslərin bədən bütövlüyü və sağlamlıq hüququ fövqəladə hallarda belə məhdudlaşdırıla bilməz.

Doktrinada bu hüquq çərçivəsində dövlətin öhdəliyinin yalnız insan həyatına hörmət göstərməkdə ifadə olunan passiv öhdəliklə məhdudlaşmadığı, eyni zamanda insan həyatının effektiv şəkildə qorunması və hüquqların pozunması ehtimalına qarşı cəza tədbirlərinə yer vermək kimi müsbət və prosessual öhdəlikləri də əhatə etdiyi ifadə edilir (Çiftçioğlu, 2012: 143). Sosial şəbəkələrdə insanların həyatı üçün təhlükə yaradan və onların həyat və sağlamlığını təhdid edən məzmunlar yerləşdirilməsi mümkündür. Məsələn, bir istifadəçinin başqa bir istifadəçini hədəf alaraq yaratdığı məzmunda onun həyatını təhdid edən ifadələr, planlaşdırılan və ya törədilmiş cinayətlə bağlı açıqlamalarla, istifadəçiləri intihara təşviq edə biləcək məzmun vasitəsilə onların yaşamaq hüququ təhlükə altına düşə bilər. Yaşamaq hüququnun üçüncü şəxslər tərəfindən pozulmasının qarşısının alınması ilə bağlı dövlətin müsbət öhdəliyinə həm də şəxslərin həyatı üçün

təhlükə yaradan hərəkətlərdən qorunması üçün zəruri tədbirlərin görülməsi və bu hərəkətlərə qarşı effektiv sanksiya mexanizminin işlənib hazırlanması daxildir (Duvan, 2018: 670).

Şəxsin yaşamaq hüququna yönələn bu təhdid və təhlükələrə qarşı sosial şəbəkə provayderlərinin könüllü olaraq məzmuna nəzarət müdaxilələri vasitəsilə həyata keçirildikləri qeyri-qanuni məzmunun silinməsi və ya təqsirli şəxslə bağlı səlahiyyətli orqanların zəruri məlumatlara əlyetərliliyin təmin edilməsi ilə əməkdaşlığın təmin edilməsi məsələsində onların üzərinə müəyyən öhdəliklər qoyula biləcək.

Yaşamaq hüququ çərçivəsində xüsusilə nəzərə alınmalı olan məsələ uşaqların yaşamaq hüququdur. 1989-cu ildə BMT Baş Assambleyası tərəfindən qəbul edilmiş Uşaq Hüquqları Konvensiyasında hər bir uşağın yaşamaq hüququna malik olduğu və dövlətlərin yetkinlik yaşına çatmayanların yaşaması və inkişafı üçün mümkün olan hər növ tədbiri görməli olduqları ifadə edilmişdir. Azərbaycan isə həmin Konvensiya və ona əlavə edilmiş iki protokola qoşulmuş və 1998-ci ildə ölkəmizdə Konvensiyasının müddəalarını özündə əks etdirən "Uşaq Hüquqları haqqında" Qanun qəbul edilmişdir. Bu baxımdan dövlətlərin sosial şəbəkələrdə uşaqların yaşamaq hüquqlarını qorumaq üçün əlavə qaydalar tətbiq etməsi məqsədəuyğundur.

AİHM-in 8-ci maddəsi və AR Konstitusiyanın 32-ci maddəsin çərçivəsində tənzimlənən şəxsi və ailə həyatının toxunulmazlığı hüququ internet mühitinin tənzimlənməsində və sosial şəbəkə provayderlərinin üzərinə öhdəliklərin qoyulmasında təsirli olan əsas hüquqlardan biridir. İnternetdən istifadə hüququna və ifadə azadlığına qoyulan məhdudiyyətlərin əsas səbəblərindən biri də məhz budur. Şəxsi məlumatların qorunması məsələsində yaranan və nəzərdən keçirilməli olan yeni nəsil hüquqlarından biri kimi qəbul edilən unudulma hüququ, Aİ Ümumi Məlumatların Qorunması Qaydasında (GDPR) məlumat sahiblərinin onlara aid şəxsi məlumatların təxirə salınmadan aradan qaldırılmasını tələb etmə hüququ olaraq da ifadə edilir. Unudulmaq hüququ çərçivəsində fərdlər qanun pozuntusu hesab etdikləri məzmunu sosial şəbəkə provayderləri tərəfindən müəyyən edilmiş mexanizmlər və milli qanunvericilik normaları vasitəsilə tənzimləyə, həmçinin müvafiq məzmunun silinməsini tələb edə bilər (Kent, Kulular, 2021: 196).

AİHM-nin unudulma hüququ ilə bağlı ilk qərarı 1991-ci ildə iki Almaniya vətəndaşının törətdiyi qətllə bağlı idi. Belə ki, 2000-ci ildə bir nəşriyyatda bu şəxslərdən cinayət törətməkdə şübhəli sayılan şəxslər kimi bəhs edildiyi bir xəbər yayımlanmış və 2007-ci ilə qədər nəşriyyatın arxiv bölməsində saxlanılmışdır. 2007-ci ildə ərizəçilər müvafiq xəbərlərdə adlarının anonimləşdirilməsini tələb etmək üçün məhkəməyə müraciət ediblər. Rayon (şəhər) məhkəməsi və apellyasiya məhkəməsi ərizəçilərin tələbini əsaslı hesab etsə də, yuxarı instansiya məhkəməsi olan Federal Məhkəmə bu qərarları ləğv etdi. Məhkəmə ərizəçilərin şəxsi hüquqlarına və şəxsi həyatlarının müdafiəsi hüququna müdaxilənin olduğu qənaətinə gələrək, mübahisənin AİHK-nın 8-ci maddəsinin əhatə dairəsinə daxil olduğu qənaətinə gəldi. Məhkəmə həmçinin həmin maddə çərçivəsində tənzimlənən şəxsi həyatla bağlı hüquqların 10-cu maddədə nəzərdə tutulmuş ifadə və mətbuat azadlığı ilə qarşılıqlı əlaqədə nəzərdən keçirilməli olduğunu bildirərək, ərizəçilərin tələbində məzmunun təqdim edilməsinin şəxsi hüquqların ciddi pozuntusuna yol vermədiyini qeyd etmişdir. Eyni hadisə ilə bağlı müxtəlif nəşrlərə qarşı qaldırılan iddialar da Federal Məhkəmə tərəfindən eyni şəkildə rədd edildi. AİHM bu məsələnin ərizəçilərin Konvensiyada təsbit edilən şəxsi və ailə həyatına hörmət hüququ ilə media orqanlarının və ictimaiyyətin ifadə azadlığının balanslı şəkildə qiymətləndirməsinin aparılıb-aparılmamasından asılı olduğunu bildirmişdir. Qərarda diqqət çəkən məqamlardan birini də əsas hüquq və azadlıqların, xüsusilə də şəxsi həyatın toxunulmazlığı hüququnun internetdə ənənəvi mətbuata nisbətən daha çox zərər riski altında olması və bunda ən mühüm faktorun axtarış sistemləri olması təşkil etmişdir. Məhkəmə axtarış sistemlərinin məsuliyyətinin məzmun yayımlayanların məsuliyyətindən fərqli ola biləcəyi nəticəsinə gəlmişdir.

Məhkəmə rəqabət aparan hüquqların tarazlaşdırılması üzrə dövlətlərin öhdəliklərinin müəyyən edilməsi ilə bağlı ümumi qaydalara istinad edərək ictimai maraqları, şəxslərin nüfuzunu, yayımlanmış məlumatların məzmununu, aidiyyəti şəxslərin əvvəlki davranış və hərəkətləri, hazırlanan nəşrlərin forma və nəticələri, fotoşəkillərlə bağlı halları da nəzərə alaraq Almaniya

Federal Məhkəməsinin qərarını qanuni hesab etmişdir. Məhkəmə Almaniya dövlətinin ərizəçilərin AİHK-nın 8-ci maddəsi ilə qorunan şəxsi həyatlarına hörmət hüququnu pozmadığına qərar vermişdir (4). Doktrinada AİHM-nin qərarı unudulmaq hüququnu institutsionallaşdırmaq və şəxsi həyata hörmət və ifadə azadlığı hüquqlarını təfərrüatlı yanaşma ilə balanslaşdırmağa imkan verəcək bir qiymətləndirmə aparmaq fürsətini itirməyə səbəb olduğuna görə tənqid edilib (Kaya, 2021: 357). Bu tənqidlərdən biri də sözügedən qərarın unudulma hüququnun dar çərçivədə qiymətləndirilməsinə səbəb olduğu ilə bağlıdır. Bunun qarşısının alınması üçün də bu çərçivədə ediləcək qiymətləndirmələrdə məlumat əldə etmək hüququnun da nəzərə alınaraq balanslı bir yanaşmanın tətbiq edilməli olduğu bildirilmişdir.

Ayrı-seçkiliyin qadağan edilməsi müddəası isə Konvensiyada təsbit edilmiş hüquq və azadlıqların həyata keçirilməsində heç bir ayrı-seçkiliyə yol verilməməsini ifadə edir. AR Konstitusiyasında ayrı-seçkiliyin qadağan edilməsi adlı ayrıca müddəa nəzərdə tutulmasa da, bunun qanun qarşısında bərabərlik prinsipinə əsasən qadağan edilməsi təsbit edilmişdir. Belə ki, Konstitusiyada dövlətin irqindən, etnik mənsubiyyətindən, dinindən, dilindən, cinsindən, mənşəyindən, əmlak vəziyyətindən, qulluq mövqeyindən, əqidəsindən, siyasi partiyalara, həmkarlar ittifaqlarına və digər ictimai birliklərə mənsubiyyətindən asılı olmayaraq, hər kəsin hüquq və azadlıqlarının bərabərliyinə təminat verdiyi qeyd edilmişdir. Eyni zamanda insan və vətəndaş hüquqlarını və azadlıqlarını irqi, etnik, dini, dil, cinsi, mənşəyi, əqidə, siyasi və sosial mənsubiyyətə görə məhdudlaşdırmaq qadağan edilir (6).

Sosial şəbəkə provayderləri üçün ayrı-seçkiliyin qadağan edilməsi qlobal miqyasda heç bir qrupa, irqə və ya milliyyətə qarşı ayrı-seçkiliyə yol verilmədən və ölkə üzrə hər hansı istifadəçi haqqında ayrı-seçkilik edilmədən fəaliyyət göstərilməsi kimi başa düşülür. Bu baxımdan sosial şəbəkə provayderləri öz siyasətlərində və fəaliyyətlərində istifadə etdikləri avtomatlaşdırılmış maşınlarla bağlı ayrı-seçkiliyə səbəb ola biləcək hərəkətlərə görə məsuliyyət daşıya bilərlər. Bununla belə, sosial şəbəkə provayderlərindən istifadəçilərin paylaşdığı məzmunla bağlı proaktiv fəaliyyətləri çərçivəsində görülən məhdudlaşdırıcı tədbirlərlə bağlı ayrı-seçkiliyə yol verilməmələri tələb edilir. Məsələn, sosial şəbəkələrdə kiberbullinqi təsbit etmək, qarşısını almaq, təsnif etmək, risk faktorlarını müəyyən etmək üçün nəzərdə tutulmuş, süni intellekt tərəfindən dəstəklənən proqram təminatları və alqoritmlər ayrı-seçkilik yaradan amillərdən asılı olmayaraq tətbiq edilməlidir (Kavici, 2023: 6). Əks halda sosial şəbəkə provayderləri məsuliyyətə cəlb olunacaqlar.

**1.3. Müdaxilənin məhdudlaşdırılmasını tələb edən əsas hüquq və azadlıqlar.**

Müdaxilənin məhdudlaşdırılmasını tələb edən əsas hüquq və azadlıqlar dedikdə isə nəzərdə tutulan əsas hüquqlar və azadlıqlar fikir, vicdan və din azadlığı, sərbəst toplaşmaq və cəmiyyət qurmaq azadlığı, ifadə azadlığından ibarətdir. Sözügedən azadlıqlar Avropa İnsan Hüquqları Konvensiyasının və AR Konstitusiyasının müvafiq müddəalarında da təsbit edilmişdir. Bu anlayışlar çox geniş məzmunlu olsa da, AİHM təcrübəsinə baxdıqda bəhs edilən azadlıqlara münasibətdə daha çox dini inancların mərkəzə alındığı müşahidə edilir. Bu perspektivdən baxdıqda, sosial şəbəkələr vasitəsilə istifadəçiləri bəlli istiqamətdə düşünməyə vadar edən fəaliyyətlərin göstərilməsi istifadəçilərin fikir azadlıqlarına zərər vura biləcəyindən dövlətlərin müdaxiləsini tələb edir. Buna görə də bu azadlıq iki yönlü nəzərdən keçirilməlidir.

Sosial şəbəkələr istifadəçilərin fikirlərini açıqlamağa icazə verən, interaktiv bir kommunikasiya imkanı təklif edərək digər istifadəçilərlə ünsiyyət qurmağa imkan verən və bu çərçivədə demokratiyanın inkişafına töhfə verən platformalardır. Vətəndaşların, fikir, vicdan və din azadlığı çərçivəsində qorunan mənfəətləri sosial şəbəkə platformalarında da qorunmalıdır. Bu azadlıqlara zərər verəcək proqram təminatı tətbiqlərinə və istifadəçilərin bu istiqamətdə məzmun hazırlamalarına icazə verilməməlidir. Sosial şəbəkə təminatçıları tərəfindən tətbiq olunan siyasətlərdə də vətəndaşların bu azadlığına müdaxilələrdən çəkinmək lazımdır. Dövlətlər tərəfindən aparılacaq məzmuna nəzarət fəaliyyətlərində vətəndaşların sözügedən azadlığı nəzərə alınaraq ölçülü, mütənasib qərarlar verilməsi tələb olunur.

Sosial şəbəkə platformaları, ictimai hərəkatlar üçün üzv toplamaq və təşkilatlanmaq üçün üstünlüklərə sahibdir. Avropa Şurası Nazirlər Komitəsi toplaşma və cəmiyyət qurma azadlığının

onlayn-offlayn olaraq fərqləndirmədən təmin edilməsinin vacib olduğunu bildirmiş və sosial şəbəkələrin sahib olduğu asanlaşdırıcı təsiri vurğulamışdır (Brown, 2013: 16). Sosial şəbəkələrə nəzarət məsələsində şəxslərin toplanma və cəmiyyət qurma azadlıqlarını pozacaq qərarlara və bu hüquqları məhdudlaşdıracaq siyasətlərə əl atılmaması lazımdır.

İfadə azadlığı sosial şəbəkələrə nəzarət zamanı istifadəçilərin məzmununa məhdud müdaxiləni tələb edən ən mühüm azadlıqlardan biridir və tez-tez AİHM hüquqşünaslığının müzakirə mövzusu olmuşdur. Bu hüquqa sosial şəbəkə istifadəsi çərçivəsindən baxıldığında dövlətlər tərəfindən sosial şəbəkə provayderləri üçün öhdəlik müəyyən edilərkən, bu platformaların istifadəçilərinin ifadə azadlıqlarını pozmadan ölçülü şəkildə davranmalı olduğu müəyyən edilir. Eyni şəkildə, provayderlər də öz siyasətləri daxilində tətbiq edəcəkləri məhdudlaşdırmalarda istifadəçilərin ifadə azadlığını qorumalıdır.

Konvensiyaya əsasən qanunda nəzərdə tutulduğu halda və demokratik cəmiyyət qaydaları tələb etdikdə ifadə azadlığı müəyyən qədər məhdudlaşdırıla bilər. Ədəbiyyatda platformların məzmunu saxlamaq və əlyetərliliyini təmin etmək məqsədi ilə vasitəçi kimi istifadə olunduğu və bu səbəbdən məzmunun özü ilə eyniləşdirməməli olduğunun AİHM tərəfindən qəbul edildiyi göstərilmişdir. Doktrinada yer alan digər bir fikirdə qeyd edilir ki, AİHK-nın 8 və 11-ci maddələri arasında tənzimlənən azadlıqların məhdudlaşdırmasının əsası olaraq göstərilən "demokratik cəmiyyətdə zəruri olan qaydalar" anlayışı qeyri-müəyyəndir və bu da AİHM-ə gözlənilməz qərarlar qəbul etmək imkanı verir (Çatlı, 2018: 54).

AİHM istifadəçilər tərəfindən yaradılan məzmunlara dair məsuliyyətlə bağlı paylaşılan məzmunun xarakterinə görə platformların məsuliyyəti ilə bağlı müxtəlif qərarlar qəbul etmişdir. Məsələn, Delfi A.Ş. adlı ticari xəbər portalı üçün, onlayn şəkildə yayımlanmış xəbərə edilən bir şərhin aqressiv xarakter daşıdığı, müraciət edən hesab sahibinin müvafiq şərhləri altı həftə sonra silməsinin kifayət etmədiyi və Estoniya məhkəmələri tərəfindən müraciət edənin təqsirli hesab edilərək ona verilmiş cərimənin ifrat olmadığı və bu səbəblərə görə ifadə azadlığının pozulmadığı qərarı verilmişdir (10). AİHM mühim bir argument olaraq, əlaqəli platformun kommersiya məqsədləri üçün işlədilməsi və bu fəaliyyətlərindən gəlir əldə etməsi məsələlərinə də toxunaraq onlara hüquqi qiymət vermişdir. Qərara etiraz edən fikirdə, vasitəçi platformanın sahib olduğu məlumat almaq və yaymaq hüququ çərçivəsində mətbuat azadlığının pozulduğu bildirilmişdir. Platformaya verilən məsuliyyətin 7/24 nəzarət etmə öhdəliyi daşıdığı, daimi və nəzəri xarakterli olduğu və bu cür geniş məsuliyyətin qoyulmasına niyə ehtiyac duyulduğuna dair səbəb göstərilməməsi tənqid olunmuşdur. Doktrinada AİHM tərəfindən ətraflı bir araşdırma aparrmadan, fərziyyələrə əsaslanaraq, mütənasibliyi gözləmədən və texniki bir yoxlama aparmadan qərar verdiyinə görə onun yerində bir qərar olmadığı düşünülür. Vasitəçi platformaların şərhlərin məzmunu ilə qarşılıqlı əlaqəsi ilə bağlı normativ qayda qoymadan, vasitəçilər tərəfindən seçilən siyasət və tətbiq edilən prosedurlara əsasən qiymətləndirmə aparılaraq məsuliyyətin müəyyən edilməsinin hüquqi cəhətdən daha doğru olacağı düşünülür.

Sosial şəbəkələrdə ifadə azadlığı kontenti ilə bağlı bəhs edilə biləcək daha bir AİHM qərarı 2023-cü ildə qəbul edilmiş Sançes Fransaya qarşı işinin qərarıdır. Müraciət Konvensiyanın 10-cu maddəsi çərçivəsində ərizəçi müvafiq tarixdə Fransa Parlamentinə seçkilərdə namizəd olmuş yerli məclis üzvünün facebook hesabında üçüncü şəxslər tərəfindən səsləndirimiş şərhləri dərhal silmədiyinə görə dini əsaslarla bir qrupa və ya ayrı-ayrı şəxslərə qarşı din əsasında nifrət və ya zorakılığa təşviq etməkdən dolayı məsuliyyətə cəlb olunduqdan sonra, ərizəçinin ifadə azadlığının pozulub-pozulmaması ilə əlaqədardır (11). Birinci instansiya məhkəməsi ərizəçini şərhlərin məzmununu təsdiqlədiyi və həmin məlumatlaırn yayılmalarının qarşısını almaq üçün dərhal tədbir görmədiyi üçün təqsirli hesab etmişdir. Yuxarı instansiya məhkəməsi də ərizəçinin məhkumluğuna dair qərarı qüvvədə saxlamışdır. Apellyasiya şikayəti zamanı irəli sürülən ifadə azadlığı barəsində isə Konvensiyanın müvafiq maddəsində göstərilən məhdudiyyətlər çərçivəsində ifadə azadlığına əsaslanıla bilinməyəcəyi şəklində şərh verilmişdir.

Əvvəlcə Palatada, sonra isə Böyük Palatada müzakirə olunan müraciətdə qərara alınmışdır ki, ərizəçinin ifadə azadlığına edilən müdaxilə AİHK-nın 10.2-ci maddəsində bəhs edilən

məhdudiyyətlərin səbəblərinə uyğun həyata keçirilmiş və ərizəçinin ifadə azadlığı pozulmamışdır. Qərardan belə bir nəticə çıxarmaq olar ki, nifrət nitqi ehtiva edən, müəyyən qrupa və ya ayrı-ayrı şəxslərə yönəldilən təhrikedici ifadələr ifadə azadlığı çərçivəsində nəzərdən keçirilə bilinməz.

Böyük Palata bu qərarı on üç səs lehinə, dörd səs əleyhinə olmaqla qəbul etdi. Qərarın əleyhinə verilmiş bir səsdə AİHM-nın hüquq təcrübəsində sabitliyin olmadığı və Məhkəmənin təhrikedici nitqlə bağlı digər məhkəmə işlərində də daha sərt hərəkət etməli olduğu bildirilmişdir. Digər bir əleyhinə səsdə isə eyni şəkildə AİHM-nin siyasətçilər üçün ifadə azadlığı ilə bağlı qərarlarının çoxşaxəli və mürəkkəb olduğu bildirilmişdir. Hakimlər Türkiyə ilə bağlı verilmiş qərarlara istinad edərək, sözügedən qərarlarda ifadə azadlığının konkret iş çərçivəsində daha çox qorunmalı olduğunu bildirərək bu qərarlarda ifadə azadlığının siyasi partiyalar və onların üzvləri üçün xüsusilə vacib olduğunu və müxalifət partiyasının üzvünün ifadə azadlığına edilən müdaxilənin məhkəmə tərəfindən diqqətlə araşdırılmalı olduğu vurğulanmışdır (12).

Bu izahlardan görünür ki, ifadə azadlığı və şəxsi və ailə həyatına hörmət hüququ çərçivəsində AİHM-nin hüquq təcrübəsi konkret bir əsasa söykənmir və ayrı-ayrı konkret hadisələrdə müxtəlif nəticələrə gəlmək mümkündür. Qərarın yekununa çatarkən azadlıqlar arasında tarazlığın bərqərar edilməsinə çalışılır, lakin demokratik cəmiyyətdə zəuri olan tələblər çərçivəsində müxtəlif qiymətləndirmələrlə müxtəlif nəticələrə gəlmək mümkündür. Sançes qərarında sosial şəbəkə platformasında üçüncü şəxslərin nifrət nitqini ehtiva edən təhrikedici şərhlərin silinməməsi ifadə azadlığı çərçivəsində qiymətləndirilməyərək Konvensiyanın əsasını təşkil edən dəyərlərin qorunmasının vacibliyini vurğulanmışdır. Burada sadəcə ifadə azadlığı ilə şəxsi və ailə həyatına hörmət etmək hüququ arasında balans yaradılmalı olduğu bildirilmişdir. AİHM ifadə azadlığının həyata keçirilməsi zamanı internetdən əhəmiyyətli fayda əldə edilə biləcəyi fikrini qəbul etməklə bərabər, həmçinin qeyd edir ki, təhqiredici və ya digər qeyri-qanuni nitq formalarına görə məsuliyyətin qoyulması imkanı prinsipcə, müdafiə olunmalıdır. AİHM-nin bu şərhi məqsədəmüvafiq hesab edilir və internetin vacib komponentlərindən olan sosial şəbəkələr üçün də əsas götürülməlidir (13).

## Nəticə

Tədqiqat nəticəsində belə bir nəticəyə gəlinmişdir ki, sosial şəbəkə provayderləri yaradılan məzmunun qanunsuzluğunu aradan qaldırmaq baxımından məsuliyyət daşıyırlar. Dövlətlər isə sosial şəbəkələrdə baş verən qanunsuzluqları aradan qaldırmaq üçün bununla bağlı normalar hazırlayırlar.

Sosial şəbəkələrdən istifadədə həm azadlıqların, həm də məhdudiyyətlərin əsasını əsas hüquq və azadlıqlar təşkil edir. Onlar isə məzmun baxımından müdaxiləni tələb edən və müdaxilənin məhdudlaşdırılmasını tələb edən hüquq və azadlıqlar olaraq bölünür. Müdaxiləni zəruri edən əsas hüquqlara yaşamaq hüququ, şəxsi və ailə həyatına hörmət hüququ, ayrı-seçkiliyin qadağan edilməsi, müdaxilənin məhdudlaşdırılmasını tələb edən əsas hüquqlara isə fikir, vicdan və din azadlığı, toplaşmaq və birləşmək azadlığı, ifadə azadlığı daxil edilir. Bu hüquq və azadlıqlar həm Avropa konvensiyasında, həm də Azərbaycan qanunvericiliyində təsbit edilmişdir.

## Ədəbiyyat

1. Çiftçioğlu, C.T. (2012). Yaşama hüququ. Ankara: Türkiyə Vəkillər Kollegiyası Jurnalı, s.137-168.
2. Duvan, Ö.A. (2018). Avropa İnsan Hüquqları Konvensiyasının 2-ci maddəsi çərçivəsində dövlətin yaşamaq hüququnu qorumaq öhdəliyi. Mərmərə: Hüquq Araşdırmaları Jurnalı, s.660-678
3. Kent, B., Kulular, M.A. (2021). Trending Topics on Social Media Researches, The Right to be Forgotten for Protection of Personal Data, Berlin: Peter Lang.
4. European Court of Human Rights (ECHR), M.L. and W.W. v. Germany, Application No. 60798/10, 65599/10 https://hudoc.echr.coe.int/eng#{%22itemid%22:[%22002-12041%22]}
5. Kaya, M.B. (2021). İnternet qanunu. Ankara: Oniki Lehva Yayınları, 539 s.

6. Azərbaycan Respublikasının Konstitusiyası, 12.11.1995, https://e-qanun.az/framework/897
7. Kavici, S.P., Şirin, B. (2023). Süni intellekt kiber zorakılığı proqnozlaşdıra bilərmi?, Sakarya: MEYAD Akademi, s.1-21.
8. Brown, N. (2013). Online Freedom of Expression, Assembly, Association and The Media in Europe. Council of Europe Conference of Ministers on Freedom of Expression and Democracy in the Digital Age. Belgrad, pp.1-21. https://ssrn.com/abstract=2341656
9. Çatlı, M. (2018). Fərdi Tətbiq Sahəsində Məhdudiyyət və Təhlükəsizlik Tədbiri kimi Demokratik Cəmiyyət Sifarişinin Tələbləri. Konya: İctimai Elmlər İnstitutu, 176 s.
10. European Court of Human Rights (ECHR), Delfi AS V. Estonia, Application No. 64569/09 (16 June 2015). https://hudoc.echr.coe.int/eng#{%22itemid%22:[%22001-126635%22]}
11. European Court of Human Rights (ECHR), Case of Sanchez v. France, Application No. 45581/15 (15 May 2023). https://hudoc.echr.coe.int/fre#{%22tabview%22:[%22document%22],%22itemid%22:[%22001-211777%22]}
12. Point Dissenting Opinion of Judges Wojtyczek and Zünd, ECHR. https://www.echr.coe.int/documents/d/echr/Speech_20190125_Paulus_JY_ENG
13. Liability of online platforms' (European Parliamentary Research Service, 2021). https://www.europarl.europa.eu/RegData/etudes/STUD/2021/656318/EPRS_STU(2021)656318_EN.pdf

Göndərilib: 20.02.2024 Qəbul edilib: 01.04.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/241-245

**Nərmin Məhərrəmli**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
magistrant
maharramlinarmin17@gmail.com

# ELEMENTAR FUNKSİYALAR HAQQINDA

## Xülasə

Elementar funksiyalar hesablamanın öyrənilməsində yaranan ən əsas funksiyalardır. Bunlara elementar cəbrin tədqiqat obyekti olan çoxhədlilər daxildir. Daha ümumi olaraq bunlara bütün cəbr funksiyaları, eləcə də ən əsas transsendental funksiyalar daxildir: eksponensial funksiya, loqarifm, triqonometrik funksiyalar və hiperbolik funksiyalar. Bundan əlavə, əvvəlki funksiyaların dörd elementar toplama, çıxma, vurma və bölmə əməliyyatları və funksiya tərkibi vasitəsilə sonlu birləşmələri də elementar funksiyalardır. Elmdə gedən sürətli inteqrasiya prosesi bütün sahələri müəyyən bir platformada birləşdirməyə imkan verən bir müstəvi yaradıb. Elmi biliklərin sürətli şəkildə yığılması nəticəsində tədqiqatçılar üçün elmi əsərlərini yazmaq və təhlil etmək ciddi mənada problemə çevrilib.

Qeyd olunan boşluğu aradan qaldırmaq üçün daha çox sosial elmlərdə olan kumulyativ biliklərin, arqumentlərin yoxlanılması, həmçinin ədəbiyyat axtarışlarından tutmuş nəticəyə qədərki proses üçün 1833-cü ildən başlayaraq bu proqramlar yaradılmağa başlanıldı və bunun nəticəsində riyazi məsələnin həllində funksiyalarla işləmək daha səmərəlidir.

***Açar sözlər:*** *elementar funksiyalar, funksiyaların növləri, oxşarlıq, fərqlilik, funksiyaların xarakteristikası*

**Narmin Muharramli**
Azerbaijan State Pedagogical University
master student
maharramlinarmin17@gmail.com

# About elementary functions

## Abstract

Elementary functions are the most basic functions that arise in the study of calculus. These include polynomials, which are the object of study in elementary algebra. More generally, these include all algebraic functions, as well as the most basic transcendental functions: the exponential function, the logarithm, the trigonometric functions, and the hyperbolic functions. In addition, finite combinations of the preceding functions through the four elementary operations of addition, subtraction, multiplication, and division and composition of functions are also elementary functions. The rapid integration process in science has created a plane that allows to connect all fields on a certain platform. As a result of the rapid accumulation of scientific knowledge, it has become a serious problem for researchers to write and analyze their scientific works.

In order to overcome the mentioned gap, these programs were started to be created starting from 1833 for the verification of cumulative knowledge and arguments in social sciences, as well as for the process from literature searches to the result, and as a result, it is more efficient to work with functions in solving a mathematical problem.

***Keywords:*** *elementary functions, types of functions, similarity, difference, characteristics of functions*

## Giriş

**Məqalənin aktuallığı:** Məqalədə elementar funksiyalar, onların rolu və təsnifatı haqqında ümumi məlumat verilmişdir və onun əsas tətbiqləri, problemləri əks olunmuşdur. Elementar funksiyalar sinifi geniş olduğundan onların öyrədilməsi zamanı daha ümumi xarakteristikaları və fərqli cəhətləri təhlil edilir analoji olaraq öyrədilməsinə tövsiyyələr verilir.

Elementar funksiyalar – çoxhədlilər, rasional funksiyalar, üstlü funksiyalar, qüvvət funksiyaları, loqarifmik funksiyalar, triqonometrik funksiyalar, tərs triqonometrik funksiyalar, həmçinin adları çəkilən funksiyalar üzərində dörd hesab əməlini (toplama, çıxma, vurma, bölmə) və superpozisiyanı sonlu sayda tətbiq etməklə alınan funksiyalardır. Bir və ya bir neçə dəyişəndən asılı elementar funksiyalara baxılır. Elementar funksiyaların törəməsi də elementar funksiyalardır, elementar funksiyaların tərs funksiyası və ibtidai funksiyası elementar funksiyalar olmaya da bilər. Elementar funksiyalar sinfinə aid olmayan funksiyaları öyrənmək üçün onlar elementar funksiyalar vasitəsilə sonsuz sıralar, hasillər, inteqrallar, asimptotik yaxınlaşmalar və s. şəklində ifadə edilir (Məmmədov, Musayev, 2018).

Elementar funksiyalar riyaziyyatda ən sadə funksiyalara aiddir. Bunlara əsas funksiyalar deyilir və hər birinin öz spesifikliyi və qrafikası var. Ən ümumi elementar funksiyalardan bəziləri bunlardır:

Xətti funksiya (y = mx + b): Bu funksiyanın qrafiki düz x-dir. “M” sözü xəttin nə qədər perpendikulyar olduğunu, “b” isə xəttin x oxunu keçib-keçmədiyini müəyyən edir.

Çoxhədli funksiyalar (y = a_nx^n + a_{n-1}x^{n-1} + ... + a_1x + a_0): Bu funksiyalar, yəni kvadrat, kubik və s. Bəzən cümlə və ya cümlə şəklində ifadə edilir.

Mürəkkəb metodu funksiyaları (y = a^x): Bu funksiyalar müntəzəm eksponentlə ifadə olunan əsas "a" metod funksiyalarıdır. Məsələn, 2^x (iki yol x), 3^x (üç yol x) kimi funksiyalar bunun qarşısını alır (Liouville, 1833a).

Triqonometrik funksiyalara sinus (sin), kosinus (cos), tanqent (tan), kosekant (csc), sekant (san) və kotenqent (cot) kimi funksiyalar daxildir. Bu funksiyalar səliqəli üçölçülü formada istifadə olunur.

Eksponensial funksiyalar (y = e^x): Müqayisə zamanı "e" rəqəmi 2,71828 kimi qeyd olunur. "e"-dən cümlənin dərəcələrinə qədər olan yazılar da bu kateqoriyaya daxildir.

Loqarifmik funksiyalar (y = log_a(x)): "a" əsasdır və "x" dəyəri müəyyən edir. Əsas loqarifmik funksiyalar üçün "a" rəqəmi 10-dur ki, bu da əvvəlki misaldakı loqarifm funksiyasıdır.

Bu funksiyalar riyaziyyatda ən çox istifadə olunur və hər biri müxtəlif məsələlərə tətbiq edilir (Stewart, Redlin, Watson, 2015).

Verilmiş *x* və *y* dəyişən kəmiyyətləri bir-birindən asılı olaraq istənilən qiymətləri ala bilirsə, yəni birinin aldığı qiymətlər, o birinin bu və ya başqa qiymətləri alıb almamasından asılı deyilsə, onlara asılı olmayan və ya sərbət dəyişən kəmiyyətlər deyilir. Aydındır ki, belə dəyişən kəmiyyətləri ayrılıqda öyrənməyin heç bir mənası yoxdur. Buna görə də riyaziyyat elmində asılı olan dəyişən kəmiyyələr öyrənilir.

Tərif**.** Əgər hər hansı *f* qaydası və ya qanunu vasitəsilə *x* dəyişən kəmiyyətinin *X* dəyişmə oblastındakı hər bir qiymətinə *y* dəyişən kəmiyyətinin *Y* dəyişən oblastında olan müəyyən bir qiyməti uyğun olarsa, belə uyğunluğa funksiya deyilir.

Bu halda *x* dəyişəni arqument və ya sərbəst dəyişən, *y* dəyişəni funksiya və ya asılı dəyişən, *x* və *y* kəmiyyətlərinin arasındakı asılılıq funksional asılılıq adlanır. *X* çoxluğuna funksiyanın təyin oblastı, *Y* çoxluğuna isə funksiyanın qiymətlər oblastı deyilir (Larson, Edwards, 2017).

Əgər *x* dəyişəninin hər bir qiymətinə *y* dəyişəninin ancaq bir qiyməti uyğun olarsa, onda *y* funksiyası *x*-in birqiymətli funksiyası adlanır. Əgər *x* dəyişəninin heç olmasa bəzi qiymətlərinə *y* dəyişəninin bir neçə qiyməti uyğun olarsa, onda belə funksiyaya çoxqiymətli funksiya deyilir. *F* funksiyasının verilməsi, *x* arqumentinin hər bir qiymətinə görə funksiyasının uyğun qiymətinin necə tapılması deməkdir. Funksiyanın verilməsinin 3 əsas üsulu vardır: analitik, yəni düstur vasitəsilə, cədvəl və qrafik (Hudoyberganov, 2010).

ELMİ İŞ Beynəlxalq elmi jurnal. İmpakt Faktor: 2.717. 2024 / Cild: 18 Sayı: 4 / 241-245 ISSN: 2663-4619
SCIENTIFIC WORK International scientific journal. Impact Factor: 2.717. 2024 / Volume: 18 Issue: 4 / 241-245 e-ISSN: 2708-986X

Riyaziyyatda elementar funksiya sonlu sayda polinom, rasional, triqonometrik, hiperbolik və eksponensial funksiyaların, o cümlədən onların tərs funksiyalarının cəmlərini, hasillərini, köklərini və kompozisiyalarını qəbul etmək kimi müəyyən edilən tək dəyişənin funksiyasıdır (məsələn, arcsin, log və ya x1/n). Bütün elementar funksiyalar öz sahələrində davamlıdır.

Elementar funksiyalar Joseph Liouville tərəfindən 1833-cü ildən 1841-ci ilə qədər bir sıra sənədlərdə təqdim edilmişdir. Elementar funksiyaların cəbri müalicəsi 1930-cu illərdə Cozef Fels Ritt tərəfindən başlamışdır (Məmmədov, Musayev, 2017: 124-148).

Sabit funksiya riyaziyyatda sabit funksiya hər giriş dəyəri üçün çıxış dəyəri eyni olan funksiyadır. Məsələn, y(x) = 4 funksiyası sabit funksiyadır, çünki x giriş dəyərindən asılı olmayaraq y(x) dəyəri 4-ə bərabərdi.

Tərifdən birbaşa belə nəticə çıxır ki, elementar funksiyalar çoxluğu hesab əməliyyatları, kök çıxarma və kompozisiya altında bağlanır. Elementar funksiyalar diferensiasiya altında bağlanır. Onlar limitlər və sonsuz məbləğlər altında bağlanmırlar. Elementar funksiyanın və ya elementar formada olan funksiyanın riyazi tərifi diferensial cəbr kontekstində nəzərdən keçirilir. Diferensial cəbr əlavə törəmə əməliyyatı olan cəbrdir. Törəmə əməliyyatından istifadə etməklə yeni tənliklər yazıla və onların həlli cəbrin genişlənmələrində istifadə oluna bilər (Məmmədov, Musayev, 2017: 347-359).

Riyaziyyatda cəbr funksiyası reduksiya olunmayan çoxhədli tənliyin kökü kimi təyin oluna bilən funksiyadır. Cəbr funksiyaları çox vaxt məhdud sayda termindən istifadə edən cəbri ifadələrdir və yalnız toplama, çıxma, vurma, bölmə və kəsr gücünə yüksəltmə cəbri əməliyyatlarını əhatə edir. Belə funksiyalara nümunələr:

- $f(x) = 1/x$
- $f(x) = \sqrt{x}$
- $f(x) = \dfrac{\sqrt{1+x^3}}{x^{3/7} - \sqrt{7}x^{1/3}}$

Müəyyən mənada I(x) = x eynilik funksiyası ən elementar funksiyadır. Sabit funksiyaları da elementar hesab edə bilərik. Bunlar bəzi c ədədi üçün f(x) = c formasının funksiyalarıdır. Sabit funksiyalardan və eynilik funksiyasından çoxhədlilər qura bilərik (Liouville, 1833: 2).

Monomial $ax^n$ özü ilə n dəfə vurulan və sonra a sabitinə vurulan eynilik funksiyasıdır. Çoxhədlilər monohədlərin və sabit funksiyaların sonlu xətti birləşmələridir.

İki çoxhədlinin hasili yenə çoxhədlidir. Bununla belə, iki çoxhədlinin bölünməsinin bir olması lazım deyil. İki çoxhədlinin bölünməsi olan funksiyaya rasional funksiya deyilir. Başqa sözlə, rasional funksiya r(x) kimi yazıla bilən funksiyadır

$$r(x) = \frac{p(x)}{q(x)}$$

burada p(x) və q(x) çoxhədlidir.

Rasional funksiyalar cəbri funksiyaların alt çoxluğudur. Onlar ümumi olaraq aşağıdakı kimi xarakterizə olunur.

İki dəyişənli polinomları nəzərdən keçirin. Əgər p(x,y) belə çoxhədlidirsə, onda p(x,y) = 0-ı təmin edən nöqtələr çoxluğu müstəvidə əyri əmələ gətirir. Belə əyrilərə cəbri əyrilər deyilir. Məsələn, dairə belə bir əyridir. Cəbri tənliyin həllər toplusudur (Larson, Edwards, 2017).

$$x^2 + y^2 - 1 = 0$$

Başqa bir nümunə nöqtələri təmin edən əyridir

$$y^3 + y - x = 0$$

Ümumiyyətlə, cəbri əyrilər funksiyaların qrafikləri deyil. Birinci nümunə x və ya y-də funksiyanın qrafiki deyil. İkinci misal x funksiyasının qrafikidir. Üfüqi xətt testindən keçdiyi üçün o, həm də y funksiyasının qrafikidir. Bütün cəbri əyrilər funksiyaların qrafikləri olmasa da,

müəyyən şərtlərdə diqqətimizi bir nöqtə ətrafında əyrinin alt çoxluğuna məhdudlaşdıra biləcəyimizi söyləyən bir teorem (örtülü funksiya teoremi) mövcuddur (Liouville, 1833: 3).

Qrafiki bu şəkildə cəbri əyridən alına bilən istənilən funksiya cəbr funksiyası adlanır. Çoxhədlilər və rasional funksiyalar cəbri funksiyalardır. $f(x) = x^3 + x$ funksiyasının tərsi də cəbri funksiyadır. Kvadrat kök kimi köklər də cəbridir, çünki onlar müəyyən çoxhədlilərin tərsləridir. Nəhayət, hər hansı iki cəbri funksiyanın cəmi, fərqi, hasili, bölməsi və tərkibi də cəbridir. Daha ümumi şəkildə, elementar əməliyyatların sonlu birləşməsi və cəbri funksiyaların tərkibi də cəbr funksiyasıdır.

Transsendental funksiyalar- Əgər funksiya cəbri deyilsə, ona transsendental funksiya deyilir. Elementar hesab olunan bəzi belə funksiyalar var. Onlar həm təmiz, həm də tətbiqi riyaziyyatda hər yerdə mövcud olduqları üçün, həmçinin onları xüsusi edən bir çox arzuolunan və maraqlı xüsusiyyətlərə malik olduqları üçün daxil edilmişdir. Belə çıxır ki, həqiqətən yalnız iki elementar transsendental funksiya var və qalanları onlardan təşkil etmək olar (Anton, Bivens, Davis, 2012).

Eksponensial funksiya- Bütün transsendental funksiyaların ən mühümü aşağıdakı kimi təyin olunan eksponensial funksiyadır: $\exp(x) = e^x$. Burada e Eyler nömrəsidir. Məsələn, diferensial tənliyi ödəyir

$$\frac{df(x)}{dx} = f(x)$$

Loqarifm

Elementar hesab edilən ikinci transsendental eksponensial funksiyanın tərsi loqarifmdir. Loqarifm ln(x) ilə işarələnir. Bu tənliyi təmin edən unikal funksiyadır (Smith, Minton, 2015):

$$\exp(\ln(x)) = x$$

Triqonometrik funksiyalar- Triqonometrik funksiyalar həndəsə və tətbiqi riyaziyyat üçün əsas olduğundan, onlar da elementar hesab olunurlar. Ən əsas iki triqonometrik funksiya sin(x) və cos(x) kimi işarələnən sinus və kosinusdur. Digər triqonometrik funksiyalar sinus, kosinus və elementar əməliyyatlardan istifadə etməklə qurula bilər. Diqqətəlayiq haldır ki, sinus və kosinus funksiyaları kompleks ədədlər üzərində təyin edildikdə eksponensial funksiyadan müəyyən edilə bilər Swokowski, Cole, 2015).

$$\sin(x) = \frac{e^{ix} - e^{-ix}}{2i}$$

Və

$$\cos(x) = \frac{e^{ix} + e^{-ix}}{2}$$

burada i xəyali vahiddir.

Hiperbolik funksiyalar- Elementar funksiyalar qrupunu tamamlayan son funksiyalar toplusu hiperbolik funksiyalar toplusudur. Triqonometrik funksiyalar sinus və kosinusdan qurulduğu kimi, hiperbolik funksiyalar da hiperbolik sinus və hiperbolik kosinusdan (müvafiq olaraq sinh(x) və cosh(x)) qurulur. Bu iki funksiya eksponensial funksiyadan sinus və kosinusa bənzər şəkildə qurulur (Ritt, 1950).

$$\sinh(x) = \frac{e^{x} - e^{-x}}{2}$$

$$\cosh(x) = \frac{e^{x} + e^{-x}}{2}$$

Elementar olmayan funksiyalar- Elementar funksiyanın törəməsi də elementar funksiyadır. Bununla belə, elementar funksiyanın əks törəməsi mütləq elementar deyil.

Misal üçün,

$$\int e^{x^2}\, dx$$

elementar deyil.

Çox faydalı, lakin elementar olmayan bir çox funksiya var. Ümumiyyətlə, ad veriləcək qədər vacib olan istənilən funksiya xüsusi funksiya adlanır. Çox vaxt xüsusi funksiyalar diferensial tənliklərin və ya elementar funksiyaların inteqral tənliklərinin həlli olur. Xüsusi funksiyaların bəzi nümunələri xəta funksiyası, Riemann Zeta funksiyası, Bessel funksiyaları və Qamma funksiyasıdır (13; 14).

## Nəticə

1. Funksiyalar vasitəsi ilə məsələ həlli tələbələrin fəallığının, motivasiyasının və iştirakının artması ilə nəticələnə bilər.
2. Funksiyalar təlim məqsədlərinin möhkəmləndirilməsində və tələbələrin materialı başa düşməsində yüksək effektivlik göstərə bilər.
3. Müəllimlər bu funksiyalardan istifadənin zamana və resurslara qənaət baxımından çox faydalı olduğunu bildirirlər.
4. Bu funksiyalar vasitəsi ilə məsələlərin həll edilməsi yeni və innovativ tədris nəticələrini artıra bilər.

## Ədəbiyyat

1. Məmmədov, N.Y., Musayev, Ə.M. (2018). Ali riyaziyyat kursu (III hissə). Bakı: ADNSU.
2. Liouville, J. (1833a). "Premier mémoire sur la détermination des intégrales dont la valeur est algébrique". Journal de l'École Polytechnique. tome XIV, pp.124-148.
3. Stewart, J., Redlin, L., Watson, S. (2015). Precalculus: Mathematics for Calculus. Cengage Learning.
4. Larson, R., Edwards, B. (2017). Calculus. Cengage Learning.
5. Hudoyberganov, A.V. (2010). Elementar funktsiyalar, matematik analizdan maruzalar.
6. Məmmədov, N.Y., Musayev, Ə.M. (2017). Ali riyaziyyat kursu (I hissə). Bakı: ADNSU.
7. Məmmədov, N.Y., Musayev, Ə.M. (2017). Ali riyaziyyat kursu (II hissə). Bakı: ADNSU.
8. Liouville, J. (1833c). "Note sur la détermination des intégrales dont la valeur est algébrique". Journal für die reine und angewandte Mathematik. 10, pp.347-359.
9. Anton, H., Bivens, I., Davis, S. (2012). Calculus: Early Transcendentals. John Wiley & Sons.
10. Smith, K., Minton, R. (2015). Calculus: Early Transcendental Functions. McGraw-Hill Education.
11. Swokowski, E.W., Cole, J.A. (2015). Precalculus: Functions and Graphs. Cengage Learning.
12. Ritt, J. (1950). Differential Algebra
13. https://www.theochem.ru.nl/~pwormer/Knowino/knowino.org/wiki/Elementary_function.html
14. https://ximera.osu.edu/csccmathematics/precalculus1/precalculus1/continuity/elementaryFunctions

Göndərilib: 10.02.2024 Qəbul edilib: 03.04.2024

DOI: https://doi.org/10.36719/2663-4619/101/246-250

**Elvin Hüseynov**
Naxçıvan Dövlət Universiteti
magistrant
elvinhuseynov0@gmail.com

# İLKİN HƏRBİ QEYDİYYAT VƏ HƏRBİ XİDMƏT KEÇMƏKDƏN BOYUN QAÇIRMAYA GÖRƏ MƏSULİYYƏT

**Xülasə**

Azərbaycan Respublikası müstəqilliyini bərpa etdikdən sonra ölkənin ərazi bütövlüyünü və suverenliyini qorumalı olan Silahlı Qüvvələrimiz yaradılmışdır. Hər il yanvar-mart ayları ərzində həmin il 15 yaşı tamam olan Azərbaycan Respublikasının kişi cinsli vətəndaşları yaşayış və ya olduğu yer üzrə müvafiq icra hakimiyyəti orqanında (Azərbaycan Respublikası Səfərbərlik və Hərbi Xidmətə Çağırış üzrə Dövlət Xidmətinin yerli baş idarə, idarə, şöbə və bölmələri) ilkin hərbi qeydiyyata alınmalıdırlar. İlkin hərbi qeydiyyata alınmaqdan boyun qaçırmaya görə Azərbaycan Respublikası İnzibati Xətalar Məcəlləsində məsuliyyət nəzərdə tutulmuşdur. Azərbaycan Respublikası Cinayət Məcəlləsinin 321.1-ci maddəsinə əsasən qanuni əsas olmadan hərbi xidmətdən yayınmaq üçün növbəti hərbi çağırışdan və ya səfərbərlik üzrə çağırışdan boyun qaçırma – iki ilədək müddətə azadlıqdan məhrumetmə ilə cəzalandırılır.

***Açar sözlər:*** *hərbi xidmət, hərbi qeydiyyat, cinayət, inzibati, boyun qaçırma, məsuliyyət*

**Elvin Huseynov**
Nakhchivan State University
master student
elvinhuseynov0@gmail.com

## Primary military registration and responsibility for misconduct

**Abstract**

After the Republic of Azerbaijan regained its independence, our Armed Forces were created to protect the territorial integrity and sovereignty of the country. Male citizens of the Republic of Azerbaijan who turn 15 years of age every year during the months of January-March in the relevant executive authority (local headquarters, offices, departments, and divisions of the State Service for Mobilization and Conscription of the Republic of Azerbaijan) at the place of residence or place of residence they must be registered in the military. The Code of Administrative Offenses of the Republic of Azerbaijan stipulates responsibility for refusing to undergo initial military registration. According to Article 321.1 of the Criminal Code of the Republic of Azerbaijan, refusing the next military draft or calling for mobilization to avoid military service without a legal basis is punishable by imprisonment for up to two years.

***Keywords:*** *military service, military registration, criminal, administrative, desertion, liability.*

## Giriş

Azərbaycan Respublikası müstəqilliyini bərpa etdikdən sonra ölkənin ərazi bütövlüyünü və suverenliyini qorumalı olan Silahlı Qüvvələrimiz yaradılmışdır. Eyni zamanda Azərbaycan Respublikasının Konstitusiyasına uyğun olaraq qısa müddət ərzində müdafiə, hərbi quruculuq, Silahlı Qüvvələrin komplektləşdirilməsi məsələlərini nizama salan qanunlar qəbul olunmuş, hərbi xidmətin əsasları, gənclərin hərbi xidmətə hazırlığı, hərbi xidmətə çağırışın və qəbulun, hərbi vəzifəlilərin və çağırışçıların hərbi uçotu, hərbi xidmətin keçilməsi, Silahlı Qüvvələrin döyüş və səfərbərlik hazırlığının saxlanması qaydaları müəyyən olunmuşdur. Ulu Öndərimizin 1993-cü ildə siyasi hakimiyyətə xilaskar qayıdışından sonra müstəqil Azərbaycan Respublikasının ictimai

həyatının bütün sahələrində olduğu kimi, Milli Ordu quruculuğu sahəsində də böyük nailiyyətlər əldə olunmuşdur. Ulu Öndərimiz Heydər Əliyevin doğma Azərbaycanımızın çiçəklənməsi və inkişafı naminə həyata keçirdiyi uğurlu dövlətçilik siyasəti bu gün də ümummilli liderimizin layiqli davamçısı Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən böyük qətiyyətlə davam etdirilir (Azərbaycan Respublikasının Konstitusiyası, 2020).

Bu gün ictimai həyatın digər sahələrində olduğu kimi dövlət başçısının ordu quruculuğuna göstərdiyi gündəlik diqqət və qayğının nəticəsidir ki, Milli Ordumuzun döyüş qabiliyyəti və maddi-texniki bazası daha da möhkəmlənmişdir. Müstəqil dövlətimizin Milli Ordusunda xidmət etmək hər bir şəxsin müqəddəs borcudur. Azərbaycan Respublikasının Konstitusiyası Vətənin müdafiəsini onun hər bir vətəndaşının borcu, qanunla müəyyən edilmiş qaydada hərbi xidmət keçməyi vətəndaşların əsas vəzifələrindən biri kimi müəyyənləşdirmişdir. Belə ki, Azərbaycan Respublikası Konstitusiyasının 76-cı maddəsinin I hissəsinə uyğun olaraq Vətəni müdafiə hər bir vətəndaşın borcudur. Azərbaycan Respublikasının 18 yaşına çatmış və sağlamlıq vəziyyətinə görə hərbi xidmətə yararlı hər bir kişi cinsli vətəndaşı Azərbaycan Respublikasının Silahlı Qüvvələrində bu Qanunla müəyyən edilmiş qaydada müddətli həqiqi hərbi xidmət keçməlidir (Azərbaycan Respublikasının Cinayət Məcəlləsi, 2021: 329).

Hər il yanvar-mart ayları ərzində həmin il 15 yaşı tamam olan Azərbaycan Respublikasının kişi cinsli vətəndaşları yaşayış və ya olduğu yer üzrə müvafiq icra hakimiyyəti orqanında (Azərbaycan Respublikası və Naxçıvan Muxtar Respublikası Səfərbərlik və Hərbi Xidmətə Çağırış üzrə Dövlət Xidmətinin yerli idarə, şöbə və bölmələri) ilkin hərbi qeydiyyata alınmalıdırlar.

Vətəndaşlar müvafiq icra hakimiyyəti orqanında ilkin hərbi qeydiyyata alınarkən onların hərbi xidmətə yararlılığını müəyyən etmək məqsədi ilə müvafiq icra hakimiyyəti orqanı tərəfindən müəyyən edilmiş qaydada həkim mütəxəssislər tərəfindən hökmən tibbi müayinə, habelə hərbi xidmət müddətində onlardan daha məqsədəuyğun istifadə edilməsini müəyyənləşdirmək üçün psixoloji müayinə edilməli, müvəqqəti yararsız hesab edilən şəxslər isə Azərbaycan Respublikasının dövlət büdcəsi hesabına dövlət tibb müəssisələrində mütləq qaydada müalicəyə göndərilməlidirlər (3).

Müvafiq icra hakimiyyəti orqanında ilkin hərbi qeydiyyata alınmalı olan vətəndaşlar qeydiyyata alınmaq üçün müvafiq icra hakimiyyəti orqanının fərdi çağırış vərəqəsində göstərilmiş müddətdə müvafiq icra hakimiyyəti orqanına gəlməli və aşağıdakı sənədləri təqdim etməlidirlər:

1. doğum haqqında şəhadətnamənin surəti;
2. ailə tərkibi haqqında arayış;
3. təhsil haqqında sənəd (təhsil müəssisəsini bitirənlər üçün);
4. təhsil (təhsil müəssisəsini bitirməyənlər üçün) və ya iş yerindən arayış;
5. tərcümeyi-hal;

6 ədəd 3x4 sm. ölçüdə fotoşəkil.

Vətəndaşlar (Azərbaycan Respublikasının Dövlət Təhlükəsizliyi Xidməti və Azərbaycan Respublikasının Xarici Kəşfiyyat Xidmətinin ehtiyatına keçirilmiş hərbi vəzifəlilər istisna olmaqla) ehtiyata keçirildikdən sonra 7 gün müddətində yaşayış yeri üzrə hərbi qeydiyyata alınmaq üçün müvafiq icra hakimiyyəti orqanına gəlməlidirlər. Hərbi vəzifəlilər (Azərbaycan Respublikasının Dövlət Təhlükəsizliyi Xidməti və Azərbaycan Respublikasının Xarici Kəşfiyyat Xidmətinin ehtiyatına keçirilmiş hərbi vəzifəlilər istisna olmaqla) və çağırışçılar yaşayış yerini 3 aydan çox müddətə dəyişdirdikdə yaşayış yeri üzrə hərbi qeydiyyatdan çıxmalı və olduğu yer üzrə hərbi qeydiyyata durmalıdırlar. Hərbi vəzifəlilər və çağırışçılar yaşayış yerini dəyişərkən 10 gün müddətində hərbi qeydiyyatda olduqları müvafiq icra hakimiyyəti orqanına məlumat verməlidirlər (Azərbaycan Respublikasının İnzibati Xətalar Məcəlləsi, 2021: 331).

İlkin hərbi qeydiyyata alınmaqdan boyun qaçırmaya görə Azərbaycan Respublikası İnzibati Xətalar Məcəlləsində məsuliyyət nəzərdə tutulmuşdur. Belə ki, İnzibati Xətalar Məcəlləsinin 604-cü maddəsinə əsasən ilkin hərbi qeydiyyata alınmalı olan vətəndaşların qeydiyyata alınmaq üçün fərdi çağırış vərəqəsində göstərilmiş müddətdə üzrlü səbəblər olmadan müvafiq icra hakimiyəti orqanına

(Azərbaycan Respublikasının Səfərbərlik və Hərbi Xidmətə Çağırış üzrə Dövlət Xidmətinin yerli baş idarə, idarə, şöbə və bölmələri) gəlməməsinə görə ***otuz manat məbləğində cərimə*** edilirlər (5).

Azərbaycan Respublikası Silahlı Qüvvələrinin şəxsi heyətlə komplektləşdirilməsi üsullarına görə hərbi xidmət çağırış üzrə və könüllü xidmətlərə bölünür. Hərbi xidmətə çağırışın müəyyən edilmiş tələblərinə cavab verən Azərbaycan Respublikasının vətəndaşları aşağıdakı həqiqi hərbi xidmətlərə çağırılırlar:

1) müddətli həqiqi hərbi xidmətə - Azərbaycan Respublikasının 18 yaşına çatmış, sağlamlıq vəziyyətinə görə hərbi xidmətə yararlı olan, çağırışa möhlət hüququ olmayan və ya çağırışdan azad edilməmiş kişi cinsli vətəndaşları;

2) zabitlərin həqiqi hərbi xidmətinə – müddətli həqiqi hərbi xidmət keçməmiş, yaşı 35-dən çox olmayan, sağlamlıq vəziyyətinə görə hərbi xidmətə yararlı olan, çağırışa möhlət hüququ olmayan və ya çağırışdan azad edilməmiş ehtiyatda olan zabitlər.

Vətəndaşlar müddətli həqiqi hərbi xidmətə müvafiq icra hakimiyyəti orqanının aktı əsasında ildə dörd dəfə - yanvar, aprel, iyul və oktyabr aylarının 1-dən 30-dək çağırılırlar. Vətəndaşların müddətli həqiqi hərbi xidmətə çağırılması haqqında müvafiq icra hakimiyyəti orqanının aktı qüvvəyə mindikdən sonra müddətli həqiqi hərbi xidmət keçməmiş, müddətli həqiqi hərbi xidmətə çağırışa möhlət hüququ olmayan və ya müddətli həqiqi hərbi xidmətə çağırışdan azad edilməyən çağırışçılar yaşayış yeri və ya olduğu yer üzrə hərbi qeydiyyatda olduğu, hərbi qeydiyyatda olmayan çağırışçılar isə yaşayış yeri üzrə müvafiq icra hakimiyyəti orqanına gəlməlidirlər. Dövlət orqanları, yerli özünüidarə orqanları, təşkilatlar və vəzifəli şəxslər çağırışçıları ezamiyyətdən geri çağırmalı və müvafiq icra hakimiyyəti orqanına onların vaxtında gəlməsinə köməklik göstərməlidirlər (6).

Müddətli həqiqi hərbi xidmətə çağırışa möhlət rayon, şəhər, şəhərdə rayon çağırış komissiyasının qərarı ilə aşağıdakı əsaslara görə verilir:

1) ailə vəziyyətinə görə;

2) sağlamlıq vəziyyətinə görə;

3) təhsili davam etdirmək üçün;

4) Azərbaycan Respublikası Milli Məclisinin deputatı və bələdiyyələrə üzv seçilmək üçün namizədliyi qeydə alınmış şəxslərin seçki fəaliyyəti ilə əlaqədar (namizədliyi qeydə alındığı gündən seçkilərin nəticələrinin rəsmi dərc olunduğu günədək);

5) deputat, hakim, Azərbaycan Respublikasının İnsan hüquqları üzrə müvəkkil (ombudsman) fəaliyyəti ilə əlaqədar.

Hərbi xidmətdən yayınmaq üçün növbəti hərbi çağırışdan və ya səfərbərlik üzrə çağırışdan boyun qaçırma cinayətlərinin tərkibi o zaman yaranır ki, həmin cinayətlərin subyektləri əvvəlcədən hərbi komissarlıq tərəfindən yazılı surətdə xəbərdarlıq edilmələrinə baxmayaraq üzürlü səbəblər olmadan hərbi komissarlığın fərdi çağırış vərəqəsində göstərilmiş müddətdə və göstərilmiş məntəqəyə gəlməməklə çağırışdan boyun qaçırmış olurlar (7).

Çağırışçının hərbi xidmət keçməkdən boyun qaçırmaq məqsədilə fərdi çağırış vərəqəsinə imza etməkdən imtina etməsi və ya yayınması müvafiq sübutlarla təsdiq olunarsa, təkcə çağırış vərəqəsində imzanın olmaması onun cinayət məsuliyyətindən azad edilməsi üçün əsas götürülə bilməz.

Boyun qaçırma dedikdə, çağırışçının (həqiqi hərbi xidmətə çağırılanadək və ehtiyata keçiriləndək çağırışçıların hərbi uçotunda olan şəxslərin) çağırış vaxtı və yeri barədə xəbərdar edilməsinə baxmayaraq, üzrlü səbəblər olmadan qəsdən hərbi komissarın əmrində və ya fərdi çağırış vərəqəsində (bildirişdən) müəyyən olunmuş yerə, səfərbərlik əmrində isə göstərilən tarixdə müəyyən olunmuş çağırış və ya səfərbərlik məntəqəsinə (təlim-toplanış məntəqələrinə) gəlməməsi, yaxud aldatma yolu ilə çağırışdan boyun qaçırması başa düşülür (8).

"Hərbi vəzifə və hərbi xidmət haqqında" Azərbaycan Respublikası Qanununun 12.4-cü maddəsinin və Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 25-ci bəndinin mənasına görə, həqiqi hərbi xidmətə çağırışdan və səfərbərlik üzrə çağırışdan boyun qaçırmaya görə məsuliyyət, yalnız Azərbaycan Respublikası Prezidentinin həqiqi hərbi xidmətə çağırış, yaxud

